AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
MƏHƏMMƏD FÜZULİ ADINA ƏLYAZMALAR İNSTİTUTU

**MOLLA ZEYNALABDİN SAĞƏRİ QARABAĞİ**

# DİVAN

***(Həyatü məmat)***

"Şuşa" nəşriyyatı

Bakı – 2005

***Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 12 may 2004-cü il tarixli 4 №-li iclasının qərarı ilə nəşr olunur.***

Nəşrə hazırlayanı, ön sözün, şərhlərin müəllifi və lüğətin tərtibçisi: ***Gülər Əmirəhmədova***

Rə'yçi: ***Ömər Okumuş***, filologiya elmləri doktoru, professor

Redaktor: ***Azadə Musayeva***, filologiya elmləri doktoru, professor

Kompüter icraçıları: ***Nəzakət Kərimova,***
***Mətanət Muradova***
***Gülər Əmirəhmədova***

*Kitaba XIX əsrdə Azərbaycanın qədim Şuşa şəhərində yaşayıb-yaratmış, Məhəmməd Füzuli ədəbi məktəbinin iste'dadlı davamçılarından olan Molla Zeynalabdin Sağəri Qarabağinin (1791–1854) AMEA Əlyazmalar İnstitutunda saxlanılan türkcə divanının əldə olan yeganə əlyazmasındakı əsərləri daxildir. Burada şairin həyat və yaradıcılığı haqqında təzkirə və cünglərdə əksini tapmış mə'lumatlar ilk dəfə olaraq bir yerə toplanmış, bu mə'lumatlar əsasında onun şəxsiyyəti, taleyi, ailəsi ilə bağlı təsəvvür yaratmağa cəhd göstərilmişdir.*

# Ö N  S Ö Z

## Molla Zeynalabdin Sağəri Qarabağinin şəxsiyyəti, həyatı və yaradıcılığı; türkcə divanı, onun bə'zi imla xüsusiyyətləri və transfoneliterasiya problemləri

Azərbaycan xalqının talandıqca tükənməyən mə'nəvi sərvətlərinin maddi sübutlarından biri də AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda toplanmış 40000 nüsxədən çox əlyazma kitabıdır. Bu abidələrin yarandığı ərazinin xəritəsi olduqca böyükdür. Ərəb qrafikalı (əski) Azərbaycan əlifbasından transfoneliterasiya edilib nəşrə hazırlanan bu abidə – Molla Zeynalabdin Sağəri Qarabağinin türkcə divanı özünün ədəbi, fəlsəfi, paleoqrafik xüsusiyyətləri ilə yanaşı, həm də ona görə diqqətəlayiqdir ki, o, Azərbaycanın hazırda qarı düşmən caynağında əzab çəkən, məscidləri dağıdılan, sərvətləri talanan, heykəlləri güllələnən dilbər guşəsi Dağlıq Qarabağ bölgəsinin qəlbi Şuşa şəhərində yaranmışdır. Bu əsərin nəşri Azərbaycanın türk ölkəsi olduğunu danmaq, "Böyük Ermənistan" yaradıb onun tarixini yüzilliklərə, minilliklərə çevirmək istəyən nankor "qonaq"lara yeni bir zərbədir.

Bu "Divan"ın müəllifi Molla Zeynalabdin ibn Molla Sadıq Sağəri Qarabaği (1791–1854) XIX əsr Azərbaycan ədəbiyyatının iste'dadlı söz sənətkarlarından biri olmuşdur. Şuşa şəhərində dünyaya göz açmış, tə'lim-tərbiyə almış, yaşayıb-yaratmış Sağərinin həyatı, fəaliyyəti haqqında ilkin mə'lumatlar XIX əsrin ikinci yarısı, XX əsrin əvvəllərində Azərbaycanda yazıya alınmış təzkirələrdə verilmişdir. Bu baxımdan Mir Möhsün Nəvvab Ağamirzadə Qara-

bağinin (1833–1918) farsca yazdığı "Təzkireyi-Nəvvab" və Məhəmməd ağa Müctəhidzadənin (1867–1958) türkcə "Riyazül-aşiqin" təzkirələri ən gözəl qaynaqlardır [22, 74–76; 23, 104–111; 18, 43–50; 19, 46–51]. Bu iki təzkirədən isə Molla Zeynalabdin Qarabaği haqqında ən tutarlı, geniş bilgiləri "Təzkireyi-Nəvvab"da görmək olar. Nəvvabın Molla Zeynalabdin Qarabağinin müasiri olduğu nəzərə alınsa, şairin haqqında bu təzkirədə verilən mə’lumatların daha doğru və əsaslı olduğunu söyləmək olar.

Bunlardan başqa, doktor Cavad Hey’ət "Azərbaycan ədəbiyyatına bir baxış" adlı kitabında Sağəri Qarabağini XIX əsr Azərbaycan klassik şe’r cərəyanının nümayəndələri sırasında göstərmiş və onun haqqında qısaca mə’lumat vermişdir [11, 156–157].

Molla Zeynalabdin Qarabağinin əldə olan türkcə divanından, farsca divanından və haqqında bilgi verən təzkirələrdən də bilindiyi kimi, Sağəri onun təxəllüsüdür.

Nəvvab öz təzkirəsində Sağəri haqqında bunları yazır: "Molla Zeynalabdin ibn Molla Sadıq ibn Mirzə Məhəmməd Qarabaği Şuşada yaşayırdı. Uca boylu, xoş görkəmli, xoşsifət, göygöz bir şəxs idi. Sənəti mollalıq və rövzəxanlıq idi. Yaxşı səsi və avazı var idi. Musiqi elmində də məharəti və səriştəsi var idi. Eyş-işrət adamlarından idi" [23, 104].

Müctəhidzadənin də bildirdiyinə görə, mə’rifət sahibi olan şairin təxəllüsü Sağəridir. Şuşa şəhərində vəfat edən və təxəllüsündən vəfat tarixi anlaşılan şairin əsl adı Axund Molla Zeynalabdindir. O, erkən yaşlarından Qarabağın böyük alimlərindən və atası Axund Molla Sadıqdan dərs almış və h. 1230-cu ildən ömrü-

nün sonuna qədər müdərrislik etmişdir. Ayrıca, şe’r də yazmışdır. Farsca və türkcə iki divanı var [19, 46–51].

Göstərilən qaynaqların heç birində Sağərinin doğum tarixi verilməmişdir. Ancaq, ölüm tarixindən çıxış edərək, şairin doğum tarixini təxminən müəyyənləşdirmək mümkündür. Sağərinin vəfat tarixi haqqında isə Nəvvabın təzkirəsində aşağıdakı mə’lumat var: "Bu dünya ancaq hadisələr səhnəsi olduğundan h. 1271/m. 1854-cü ildə günün batmasına 3 saat qalmış güclü yağış yağmağa başladı. Mərhum öz qonaq və həmsöhbətləri üçün çay hazırlamaqla məşğul idi ki, birdən ildırımın odu o biçarəyə dəydi və o dərhal canını cahanı Yaradana tapşırdı" [23,104].

Sonra Nəvvab Sağərinin müasiri Xarrat Qulu Yusifinin şairin ölümü haqqında bu beytləri dediyini göstərir:

"Heyf olsun Axund Zeynalabdin rövzəxana,
Vücudunun ömür xirmənini ildırım yandırdı.

Bu dünyada çaya, qəndə, narınc-limona,
İstəkan-simavara, bir də şirin söhbətə vurğun idi.

Tarixini axtarırdım, qeybdən nida gəldi,
Bir hatif dedi ki, ey Yusifi, Sağəridən istə.

(1271/1854)" [23, 104].

Nəvvab həm də göstərir ki, o özü Sağərinin oğlundan onun atasının o hadisə zamanı 65 yaşı olduğunu eşitmişdir [23, 104].

Təzkirədə verilmiş bu mə’lumatları araşdıraraq Sağərinin h. 1206/m. 1791-ci ildə anadan olduğunu söyləmək olar.

Sağərinin vəfatı tarixinin təxəllüsündən anlaşıldığını Müctəhidzadə də göstərir. Əslində, hər iki təzkirəçinin bu haqda verdikləri mə’lumatları onun təxəllüsü ilə əlaqələndirmələri əsassızdır. Çünki şair öz ölüm tarixini öncədən bilib, özünə Sağəri təxəllüsünü götürə bilməzdi.

Yuxarıda adı göstərilən təzkirələrdə Sağərinin oğlu və nəvəsi haqqında da mə’lumatlar vardır. Oğlunun adı Mirzə Əli Aşiq olmuşdur. Onun da molla və müdərris olduğu, şe’r yazdığı bildirilir. Mirzə Əli Aşiqin oğlunun adı isə Mirzə Xosrov, təxəllüsü Şaiqidir. Mirzə Xosrov da babası və atası kimi müdərris olmuş, ara-sıra şe’r də yazmışdır [19, 238; 23, 513–516; 542].

Sağəri Qarabağinin biri farsca, biri türkcə olmaqla iki divanı var. Azərbaycan MEA Əlyazmalar İstitutunda şairin farsca divanının əlyazma nüsxəsi B–562 şifrəsi altında, türkcə divanının əldə olan yeganə əlyazma nüsxəsi isə B–1391 şifrəsi altında saxlanılır. Ancaq şairin təzkirələrdə və son dövrün bə’zi mənbələrində nəşr olunmuş yaradıcılıq nümunələri ilə həmin nümunələrin bu nüsxədəki əlyazmaları arasındakı bə’zi fərqlər həmin naşirlərin "Divan"ın başqa əlyazma nüsxələrindən istifadə etdiklərini deməyə əsas verir. Çünki bu fərqlərin bir çoxunu oxu fərqi kimi izah etmək mümkün deyil.

Nəvvab öz təzkirəsində Sağərinin əsərləri haqqında belə bir dəyərləndirmə vermişdir: "Şe’rlə iki cild kitab nəzmə çəkmişdir. İki divanı var, biri farsca, biri türkcə (azərbaycanca). Mükəmməl şe’r və qəzəlləri

var. O iki kitabda olan qəzəl, rübai, müxəmməs və s. sayı mindən çoxdur. Qəzəllərin əksəriyyəti 7 beytdir. Ləqəbi Sağəri olub" [23,104].

Maraqlıdır ki, sözügedən təzkirələrin heç birində Sağərinin türkcə və farsca divanlarından başqa, əsərləri olduğuna dair bilgilər yoxdur. Halbuki o özü türkcə divanının dibaçəsində türkcə və farsca divanlarından başqa, iki əsərinin də olduğunu bildirmişdir: "…və bu da vazeh olsun kim, on beş yaşından qırx yaşına yetişənə dəyin dörd cild kitab təsnif etdüm. Birisi "Əqaid" və o biri kitab "Musiqi" və bir cild "Divani-farisi" və bir cild kitab–"Divani-türki" [20,2[b]].

"Təzkireyi-Nəvvab"ın əski əlifba ilə 1913-cü il Bakı nəşrində Sağərinin farsca 1 qəzəli, 2 rübaisi, türkcə (Azərbaycan türkcəsində) isə 1 qəzəli verilmişdir [22, 75–76]. Nəvvabın göstərilən təzkirəsinin 1998-ci il Bakı nəşrində isə Sağərinin farsca divanından tərcümə olunmuş 6 qəzəli, 5 rübaisi, türkcə isə 9 qəzəli, 3 rübaisi verilmişdir [23,104–111].

Müctəhidzadənin təzkirəsinin h. 1327-ci il İstanbul nəşrində və 1995-ci il Bakı nəşrində Sağərinin türkcə divanından 13 qəzəli, farsca divanından isə 3 qəzəli verilmişdir [18, 43–50; 19, 46–51]. Bunlardan başqa, Axund Molla Hüseynəli oğlu Məşədi Molla Ağa Məhəmməd h. 1287/m. 1870-ci ildə müxtəlif şairlərin, yazıçıların əsərlərindən tərtib etdiyi 113 vərəqdən ibarət "Münşəat"ın 56[a]–80[b] vərəqlərində Sağəri Qarabağinin türkcə divanından seçdiyi 65 qəzəli "Qəzəliyyat" başlığı altında vermişdir [bax:14].

Sağəri Qarabağinin türkcə divanının nəşrə hazırlanan bu əlyazması haqqında ilkin mə'lumat Azərbaycan MEA Əlyazmalar İnstitutunun 1963-cü ildə çap olunmuş "Əlyazmalar kataloqu"nun I cildində veril-

mişdir. Orada "Divan"ın vərəqlərinin ölçüsünün 17x22 sm. olduğu göstərilir, divan katib nüsxəsi kimi dəyərləndirilir, katibinin Nəsrulla ibn Musa Rza Mərəndi, yazıldığı yerin Mərənd, xətt növünün tə'liq olduğu qeyd olunur [6,374]. Burada verilən katib və yazılma yeri haqqında mə'lumatlar əlyazmasında öz əksini tapmamışdır və kolofonun da katib kolofonu olduğunu deməyə əsas yoxdur. Görünür, kataloqun tərtibçiləri əlyazmanın səhifələri sırasında nömrələnməmiş son səhifəsində olan farsca mətnə əsaslanmışlar. Həmin mətn belədir: "Kərbəlayi Nəsrullah vələdi-Kərbəlayi Musa Rza Mərəndi dər nəzdi-həqir se qəbze tufəng nehade tufəngi-kutah ra bey' şərt nəmud. Hərgah be müddəti panəzdəh ruz nəyayəd tufəng mali-mənəst.

12 rəbiül-axir 1265/6" [14, sonuncu vərəq; 7, 145].

Tərcüməsi: "Kərbəlayi Musa Rza oğlu Kərbəlayi Nəsrullah Mərəndi [bu] fəqirin yanında 3 dənə tüfəng qoyub, qısa tüfəngi satmağı tapşırdı (hərfən: şərt qoydu). Əgər 15 gün müddətinə gəlməsə, tüfəng mənim (malım)dır."

Göründüyü kimi, bu qeyddə haqqında bəhs edilən şəxsin və tarixin əlyazmanın yazılması və köçürülməsi tarixi ilə heç bir əlaqəsi yoxdur. Ümumiyyətlə, bu qeydi kimin etdiyini də demək çətindir. Görünür, kataloqun tərtibçiləri əlyazma ilə ətraflı tanış olmadıqlarından bu qeydin tarixini köçürülmə tarixi olaraq göstərmişlər.

Sağəri Qarabağinin həyat və yaradıcılığının tədqiqi XX əsrin sonlarında da diqqətdən yayınmamış, bu mövzuda Cahangir Qəhrəmanov [13], Zəminə Hacıyeva [13], Paşa Kərimov [12, 13], Vasif Quliyev (bu müəllifin məqaləsinin nəşr olunduğu qəzeti əldə etmək

mümkün olmadı) kimi təcrübəli tədqiqatçılar müraciət etmişlər. Bu işdə başqalarının da xidmətləri olduğu istisna edilmir.

Əlyazmanın xətt növünə gəlincə, divanın yazıldığı xətt həm şikəstə, həm də tə'liq xətt növlərinin elementlərini özündə birləşdirir [3, 248; 4, 528]. Beləliklə, divanın şikəstə-tə'liq xətt növü ilə yazıldığı qeyd olunmalıdır.

Rusiya istehsalı olduğu müxtəlif vərəqlərindəki (məs., vər. 24, 60, 83) bir-birindən fərqli üç formada olan, içərisində, çox ehtimal ki, istehsal olunduğu fabrikin sahibkarının soy adını və nömrəsini göstərən rəqəm həkk olunmuş filiqranlardan bilinən təbii rəngli kağızda yazılmış divan qırmızı rəngli dəri ilə cildlənmişdir. Filiqranlar literli emblem şəklində olub, birinin yazılarını çətinliklə oxumaq mümkündür (vər. 83). Onda "Фабрики Кристархова" sözləri və "4" rəqəmi oxunur. Mətn qara mürəkkəblə iki sütun şəklində, bir çox hallarda isə qəzəllərin mətlə və möhür beytlərinin misraları bir sütunda – alt-altda yazılmışdır.

Əlyazma 113 vərəqdən (226 səhifə) ibarətdir, hər səhifədə 14 misra var. Sonradan bə'zi səhifələrin haşiyələrinə beytlər və qəzəllər əlavə edilmişdir. Buna görə də hər səhifədə iki, bə'zən üç qəzəl var. Divanda olan qəzəllər əsasən 7, bə'ziləri 5, 8, 9, 11, 13 beytdən ibarətdir. Hər səhifənin sonunda sol tərəfdən aşağı hissədə növbəti səhifədəki əsərin ilk sözü, yaxud ifadəsi yazılmışdır.

Divan "bəsmələ" ilə başlanır. Bu ifadənin altında "Divan"ın birinci misrası ərəbcə olan ilk qəzəli gəlir. Həmin misra belədir:

"Qəd təcəlla lil-eşqi lil-irfani ənvarül-hüda" [20,1]

[Artıq eşq üçün, irfan üçün hidayət (doğru yol) işıqları üzə çıxdı].

Bu misra qrammatik və üslubi cəhətdən mükəmməl deyildir. Çünki xəbər (təcəlla) mübtəda (ənvar) ilə cinsə görə uzlaşmır, "eşq" və "irfan" sözlərinin hər ikisinin "üçün" qoşması ilə işlənməsi də mə'na dolaşıqlığı yaradır. Beləliklə, misra Sağərinin ərəb dilini mükəmməl bildiyini deməyə əsas vermir.

Divan ədəbiyyatında belə giriş, demək olar ki, ən'ənəvidir. Məhəmməd Füzulinin, Ruhi Bağdadinin və Seyid Əzim Şirvaninin türkcə divanları da ilk misrası ərəbcə olan irfan məzmunlu belə qəzəllərlə başlanır [10, 35; 5, 33; 27, 37]. Ümumiyyətlə, bu fakt da divan müəllifinin Füzuli ədəbi məktəbinin davamçılarından olduğunu deməyə əsas verir.

Əksər divanlar kimi, bu divanın da dibaçəsi var. "Dibaçə" birinci qəzəldən sonra yazılıb ki, bu da Sağərinin divanını quruluşca Füzulinin və S.Ə.Şirvaninin divanlarından fərqləndirən cəhət kimi göstərilə bilər. Dibaçədən divanın adının "Həyatü məmat" ("Həyat və ölüm") olduğu aydınlaşır. Dibaçənin sonunda divanın yazılmağa başladığı tarix verilmişdir: "Bu kitabi-türki tarixi-123[0] və şə'ban ayının 15-i ibtida oldu və zilhiccənin 9-u".

Divanın $2^{a}$ vərəqində yuxarıdan dörd sətrin, $2^{b}$ vərəqində iki sətrin yazılarının təxminən yarısı həmin vərəqlərin bu hissələrinin cırılıb itmiş küncləri ilə birlikdə yox olmuş, vərəqlər sonradan bərpa olunsa da, mətnin həmin sahələrə düşən hissələri naqisdir. $5^{b}$, $6^{a}$ vərəqlərində qəzəlin 9-cu beytinin 1-ci misrasının üstündən xətt çəkilmiş, $104^{a}$ vərəqində isə müxəmməsin 1-ci bəndinin üç misrası və bə'zi sözləri silinərək haşiyədə bir qədər fərqli tərzdə yenidən yazılmışdır.

Qəzəllərin bə'zilərinə yeni beytlər artırılmışdır. Haşiyəyə əlavə edilmiş qəzəllərin müəllifə aid olduğunu bildirmək üçün həmin qəzəlin başında "Qəzəl min Sağəri" (Sağəridən qəzəl), "Və ləhü" (Yenə onun), "Və ləhü eyzən" (Yenə də onun) ifadələri yazılmışdır. Bə'zən qəzəllərdə hər hansı bir sözün başqa bir mə'nasını bildirmək və ya onu əvəz edə biləcək başqasını əlavə etmək üçün həmin sözün üzərində "٢" işarəsi (ərəbcə 2 rəqəmi) qoyularaq beytin qarşısında "٢ bədəl" (2, əvəzinə) ifadəsi ilə yanaşı, mətndəki sözün əvəzinə yazılmalı söz göstərilmişdir.

Divanda bə'zən beytlərin, misraların və sözlərin yerləri dəyişik düşmüşdür. Bu səhvlərin düzəldilməsində "mim" və "xa" hərflərindən istifadə edilmişdir. Bunlardan "mim" – müqəddəm (qabağa keçirilməli) sözünün ilk hərfi, "xa" – müəxxər (sonraya keçirilməli) sözünün əsas kök hərfidir [26,191].

Divana dibaçə, 347 qəzəl ("Dibaçə"dəki qəzəllə birlikdə), 1 müsəddəs, 1 saqinamə, 4 müxəmməs və 77 rübai daxildir. Bütünlükdə divan 2832 beytdən ibarətdir. Burada "müsəddəs" adı altında verilmiş əsər, əslində, müsəddəs (altılıq) deyil. Belə ki, müsəddəsin hər bəndində 6 misra olmaq şərtilə, birinci bəndin misraları, adətən, öz aralarında həmqafiyə, o biri bəndlərin misralarının isə dördü öz aralarında, son ikisi birinci bəndin bütün, yaxud son misraları ilə həmqafiyə olur. Bu şe'rin isə hər bəndində on iki misra olub, bunlardan 10-u öz aralarında həmqafiyədir, sonuncu beyt isə bütün bəndlərin sonunda təkrar olunur [20, 100[a]–101[b]]. Belə təkrar beytli əsərlərə, mə'lum olduğu kimi, tərcibənd deyilir. Hər misrada təkrarlanan beytdən başqa 10 misra olması isə bu əsəri "müəşşər" (onluq) növünə aid etməyə əsas verir. Bütün xüsusiyyətləri

nəzərə alınmaqla bu əsər müəşşər-tərcibənd adlandırıla bilər [15, 118, 172–173; 16, 130–131]. Əsərə "müsəddəs" adının verilməsini isə bu adı verən şəxsin klassik şe’r ən’ənələrində qəbul olunmuş qaydaları gözləmədiyi kimi başa düşmək olar. Görünür, bu zaman misraların yox, beytlərin sayı əsas götürülmüşdür. Bunun bir mexaniki xəta olduğu haqqında da mülahizə yürütmək mümkündür.

Divanın "Qəzəllər" bölümü şairin özünəməxsus "Sağəri" rədifli qəzəli ilə bitir. Qəzəllərin ardınca şairin "Divan"a daxil edilmiş başqa janrlardan olan əsərləri yazılmışdır.

Sağərinin bu divanında klassik divan ədəbiyyatının bütün ən’ənələrinə riayət olunmuş, qəzəllər və başqa janrlardan olan əsərlər misralarının son hərfi əsasında ərəb əlifbası sırası ilə düzülmüşdür.

Divanın sonundakı müəllifə aidliyi təxmin edilən farsca kolofondan abidənin tamamlanma tarixinin h. 1263/m. 1846-cı il olduğu müəyyənləşdirilir. Kolofondakı mə’lumat belədir: "Təmmət əl-kitab "Həyatü məmat" min kəlami-Sağəri dər ruzi 9 şəhri-zi-hiccətilhəramil-mütabiq səneyi-1263. İltimas əz mütaliekonəndegan anəst ki, hərgah səhvü xətayi rəfte başəd, be islahi-an kuşide befatihə ruhi-müsənnif ra şad fərmayənd və tələbi-amurziş konənd" [20, 113[a]].

Tərcüməsi: "Sağərinin kəlamından [olan] "Həyatü məmat" ("Həyat və ölüm") kitabı 1263-cü ilin müqəddəs zilhiccə ayının 9-da tamamlandı. Oxuculardan iltimas[ım] (xahişim) odur ki, əgər səhv və xəta getmiş olsa, onun islahına çalışaraq müəllifin ruhunu fatihə ilə (fatihə surəsi ilə) şad etsinlər və [ona] bağışlanma arzulasınlar".

Divanda düzəlişlər edilməsi və sonradan haşiyələrə yeni beytlərin və qəzəllərin artırılması və həm də bütün bunların divanın əsas hissəsinin yazıldığı eyni xətlə olması bunu deməyə əsas verir ki, həmin düzəlişləri yalnız müəllif özü edə bilərdi.

"Divan"ın əlyazmasının transfoneliterasiyası Azərbaycan əlyazmaşünaslıq elminin nəzəri qaynaqlarına əsaslanaraq, onun konkret klassik nəticələri nümunəsində həyata keçirilmişdir. Bundan başqa, AMEA Əlyazmalar İnstitutunun əlyazmaşünaslıq məsələlərinə dair konfranslarının materialları da bir çox tədqiqatçıların bilik və təcrübəsindən istifadə etməyə imkan yaradır. Nəzəri qaynaqlardan M.Sultanovun [24], K.Şəriflinin [26], A.Musayevanın [17], M.Adilovun [1] monoqrafiyaları, konkret nümunələrdən M.Füzulinin [10], S.Ə. Şirvaninin [27], R.Bağdadinin [5] əsərlərinin nəşrləri xüsusi qeyd olunmalıdır.

Göstərilən nəzəri qaynaqların tələbləri və konkret nümunələrin üstün cəhətləri tədqiqata nə qədər kömək olsa da, yeni əlyazma üzərində işləyərkən müəyyən özünəməxsus cəhətlər də qarşıya çıxır. Sağərinin "Divan"ı da belə özünəməxsusluqdan xali deyil. XIX əsrin ortalarında yazılmış bu abidənin başqa əlyazma abidələrindən fərqli bir çox imla və üslubi xüsusiyyətləri var ki, transfoneliterasiya zamanı onları əsasən saxlamağa cəhd göstərilmişsə də, bə’zi hallarda müasir oxucunun imkan və vərdişləri də nəzərə alınmışdır. Məsələn, "biçareəm", "azadeəm" kimi sözlərin onsuz da "biçarəyəm", "azadəyəm" kimi oxunacağına şübhə olmadığından onlar Sağərinin öz imlasında verilmiş, "virüb", "gidüb" kimi sözlərdə isə "i–ə" əvəzləməsi aparılıb, "ü"lər olduğu kimi saxlanılmışdır. Sözlərin başlanğıcındakı bütün "ğ" hərfləri "q" hərfi kimi tans-

literasiya edildiyi halda, sözlərin sonundakı [q] səsinin [ğ] səsinə keçməsi qanunu tətbiq edilməmiş, bununla da onun daha sonralar yarandığı haqda elmi mülahizənin doğruluğu əyani olaraq nəzərə çatdırılmışdır. Sözlərin birinci hərflərindəki [ğ–q] əvəzləməsi dolaşıqlığa səbəb olmasın deyə, sözlükdə "ğ" ilə başlanan variant da əvəzlənmiş variantla yanaşı verilir.

Bu əlyazmanın oxunmasında və transfoneliterasiya edilməsində iki orfoqrafik xüsusiyyət daha çox çətinlik yaradır. Birincisi odur ki, müəyyən tə’sirlik hal şəkilçisini bildirib, [i] kimi oxunan "y" hərfi bə’zən heç yazılmır, bə’zən də hərəkə (kəsrə) şəklində yazılır. İkinci variantın (kəsrə yazılışının) "Divan"da bir neçə yerdə olduğu əsas götürülərək bu naqislik bacardıqca bərpa edilmişdir. İkinci məsələ "və" ("ü", "vü") bağlayıcısının bə’zən yersiz yazılması, bə’zən isə tələb olunduğu halda yazılmamasıdır. Belə hallarda mə’nanın dolğunluğu əsas götürülmüş, lazım gəldikdə həmin element çıxarılmış, yaxud vergüllə əvəz olunmuş, lazım gəldikdə artırılmışdır. Bu məsələdə tam dəqiqliyə nail olmaq üçün əsərlərin bəhrləri üzrə iş aparmaq lazımdır. Nəşr məsələsi aktuallaşdığından bu uzunmüddətli iş sonraya saxlanmalı oldu. "Divan"ın ədəbi-bədii xüsusiyyətləri və Sağərinin fəlsəfi dünyagörüşü üzrə nəzərdə tutulan tədqiqat işlərini aparmaq mümkün olsa, yəqin ki, belə natamamlıqlar da aradan qaldırılacaq.

Bütün göstərilən xüsusiyyətlərlə yanaşı, transfoneliterasiyanı istənilən oxucunun asanlıqla qavraması, müasir tələffüz qaydalarına uyğun oxuya bilməsi üçün şərait yaratmağa cəhd göstərilmişdir.

Kitabın sonunda Sağərinin "Divan"ında işlənmiş ərəb və fars sözlərinin statistik sözlüyü verilir. Bu

sözlərin mütləq əksəriyyətinin "Ərəb və fars sözləri lüğəti"ndə [8. Tərtib edilmiş sözlükdə eyni sözlərin müxtəlif variantlarına istinadlar da bu mənbə əsasında verilir.], M.Füzulinin, S.Ə. Şirvaninin və b. orta əsr müəlliflərinin artıq nəşr olunmuş əsərlərinin daxil olduğu kitabların sözlüklərində olduğu nəzərə alınaraq, burada tərcümə və izahları verilmir. Həmin lüğətdə olmayan az sayda ərəb-fars sözlərinin aydınlaşdırılması üçün ərəbcə-rusca lüğətdən [2], "Kamus-i türki"dən [25], "Osmanlıca-Türkçe ansiklopedik lügat"dan [9] istifadə olunmuşdur. Sağərinin "Divan"ında işlənmiş çox sayda ərəb-fars sözlərinin göstərilən lüğətdə olmaması əsasən ondan irəli gəlir ki, həmin lüğətin tərtibçiləri Azərbaycan dilində vətəndaşlıq hüququ qazanmış sözləri ora daxil etməmişlər. Ancaq tərtibçilər öz prinsiplərini ardıcıl gözləmədiklərindən dilimizdəki bə’zi sözlərin mənsubiyyəti məsələsində dolaşıqlıq yarana bilər, odur ki, həmin sözləri də daxil etməklə tərtib olunmuş statistik sözlük Sağəri irsinin gələcək tədqiqatları üçün daha faydalı ola bilər. Bu sözlükdə "azərbaycanlaşmış" və yalnız Sağərinin "Divan"ında rast gəlinən sözlər ulduz işarəsi ilə seçilib ayrılır. Sonuncular Azərbaycan türk dilinin lüğət tərkibinin alınma sözlər və söz yaradıcılığı vasitəsilə zənginləşməsində Sağərinin xidmətindən söz açmağa imkan verir.

Sonda təcrübəsiz bir əməkdaşına belə geniş tədqiqat işi aparmaq imkanı vermiş AMEA Əlyazmalar İnstitutunun rəhbərliyinə, işin aparılmasına birbaşa rəhbərlik etmiş professor Ömər Okumuşa və professor Azadə Musayevaya, əlyazmanın bir neçə kalliqrafik dolaşıqlığının, bə’zi oxunmayan sözlərinin açılıb bərpa edilməsində kömək etmiş AMEA ƏYİ böyük elmi

işçisi A.Ramazanova, "Divan"ın nəşri məsələsini gündəmə gətirmiş AMEA ƏYİ şö'bə müdiri A.Xəlilova, nəşri öz üzərinə götürmüş "Şuşa" nəşriyyatına təşəkkürümü bildirirəm. Ərəb-fars söz və ifadələrinin, dini anlayışların, Qur'an ifadə və ayələrinin mə'nalarının dəqiqləşdirilməsində isə, öz şərqşünas atama müraciət etməli olmuşam ki, bunun üçün də Allaha şükür edirəm.

Görülmüş işi təqdirəlayiq sayacaq oxuculardan xahiş edirəm ki, Aşıq Abbas Tufarqanlının bir ustadnaməsində şe'rləşmiş bu hikmətli ata sözümüzü xatırlasınlar:

El bir olsa, dağ oynadar yerindən,
Söz bir olsa, zərbi kərən sındırar.

Elə doğma diyarımız Qarabağın Ana Yurdumuz Azərbaycana, qarabağlı soydaşlarımızın öz doğma el-obalarına qaytarılması da söz birliyi ilə, güc birliyi ilə mümkündür.

Molla Zeynalabdin Sağəri Qarabaği qəzəllərinin Şuşada Azərbaycan muğamları üstündə oxunacağı ümidilə:

**Gülər Əmirəhmədova**

## ƏDƏBİYYAT

**1.** Adilov M. Türk mətninin transfoneliterasiya problemləri, Bakı, Nurlan, 2003; **2.** Арабско-Русский словарь, составил проф. Х.К.Баранов, Москва, 1970; **3.** ASE, c. IX, Bakı, 1986; **4.** ASE, c. X, Bakı, 1987; **5.** Bağdadi R. Divan, nəşrə hazırlayan: A.Musayeva,

Bakı, 2001, c.I; **6.** Əlyazmaları kataloqu, Bakı, 1963, c.I; **7.** Əmirəhmədova G. Molla Zeynalabdin Sağəri Qarabaği. Filologiya məsələləri, Bakı, 2003, I; **8.** Ərəb və fars sözləri lüğəti, Bakı, Yazıçı, 1985; **9.** Ferit Devellioğlu. Osmanlıca–Türkçe Ansiklopedik Lugat, Ankara, 2000; **10.** Füzuli M. Əsərləri (6 cilddə), Bakı, 1996, c.1; **11.** Hey'ət C. Azərbaycan ədəbiyyatına bir baxış, Bakı, 1993; **12.** Kərimov P. Molla Zeynalabdin Sağəri, "Elm" qəzeti, 1 noyabr, 1985; **13.** Keçmişimizdən gələn səslər, V buraxılış, Bakı, Elm, 1987. Tərtib edənlər: C.Qəhrəmanov, Z.Hacıyeva, P.Kərimov, s. 90–113; **14.** Məşhədi Molla Ağa Məhəmməd. Məcmuə (Sağəri "Qəzəliyyat"), AMEA ƏYİ, s. 850: 303309 VI; **15.** Mirəhmədov Ə. Ədəbiyyatşünaslıq terminləri lüğəti, Bakı, 1978; **16.** M.Cəlal, Xəlilov P. Ədəbiyyatşünaslığın əsasları, Bakı, 1972; **17.** Musayeva A. Əlyazma kitabı və XV–XVI əsrlər Azərbaycan ədəbiyyatı: problemlər, araşdırmalar (tekstoloji, filoloji tədqiqat), Bakı, 2002; **18.** Müctəhidzadə M. Riyazül-aşiqin, İstanbul, h. 1327; **19.** Müctəhidzadə M. Riyazül-aşiqin, Bakı, 1995; **20.** Sağəri Qarabaği. M.Z. Divan, AMEA ƏYİ, B–1391; **21.** Sağəri Qarabaği. M.Z. Divan, AMEA ƏYİ, B–562; **22.** Nəvvab M.M. Təzkireyi-Nəvvab (fars dilində çap), Bakı, 1913; **23.** Nəvvab M.M. Təzkireyi-Nəvvab (Azərbaycan dilinə tərcümə), Bakı, 1998; **24.** Sultanov M. Azərbaycan əlyazmaşünaslığı məsələləri, Bakı, Elm, 2000; **25.** Şemseddin Sami. Kamus-i Türki, İstanbul, 1998; **26.** Şərifli K. Mətnşünaslıq (VII–XIX əsr yazılı abidələri əsasında), Bakı, 2001; **27.** Şirvani S.Ə. Əsərləri (3 cilddə), Bakı, 1967, c.I.

## [DİBAÇƏ]

Bismillahir-rəhmanir-rəhim

Qəd təcəlla lil-eşqi lil-irfani ənvarül-hüda,
Eşq əhlinə səzadır eşqə etmək iqtida.[1]

Eşqdir bais vücudi-Əhmədi-muxtarə kim,
Olmasaydı eşq, olmazdı vücudi-masiva.

Aşiqə mə'şuqdür, mə'şuqə aşiqdir əzəl,
Xeyli üşşaqi Xuda etməz vüsalindən cüda.

Zərreyi-mövcudi Həqq istərdi mövcud eyləsün,
Eşq ilə icad qıldı, qıldı eşqə aşina.

Eşqi-Həqq bir nurdur, dutmuş cəhanı sərbəsər,
Leyli zülmət eyləyib, qıldı nəharı pürziya.

Əhli-eşqi mən' edənlər eşqdən vaqif degil,
Eşq bir zənciri-səngindür, düşən olmaz rəha.

Atəşi-duzəxdən eymən dür məqamı həşrdə
Eşqi-Həqqlə olubdur hər kişi kim aşina.

Hübbdür bais ona hər zərrə kim aləmdə var,
Eşqdən mövcud olubdur yox ikən ərzü səma.

Sağəri, meyxaneyi-vəhdətdə dutdun çün məqam,
Kəsrəti-dünyadən əl çək, yoxdu onda bir səfa.

---

[1] Beytin mə'nası: Artıq eşq üçün, irfan üçün hidayət (doğru yol) işıqları üzə çıxdı. Eşq əhlinə eşqə üz tutmaq layiqdir.

…olur və bu yəqindür ki, hicrani-mə’şuq aşiqə məmatdan … dərdi-sahib şüurə dari-babi-sürurə bədihü aşikardır ki, ta aşiq … həqiqə seyr etməsə, aləmi-həqiqə yetməz və bu fəqiri-kəsrətü təqsir Zeynalabdin ibn Sadiq əyyami-şəbabında eşqi-məcazidə seyr edərkən bir cəvan növrəsidə bir məhbubi-gül’üzarəvü mə’şuqi-xoşrəftarə təəşşüq yetürmişdi. Vəsldə məsrur ikən fələki-qəddarü sitəmkarü bədmədar o biçarəni beyti-hicranda atəşi-fəraqə qəmgin etmişdi. Sirri-zəmirin bana aşikar edüb, xidmətimdə sadiq və ixlasımda müvafiq idi. Hüsni-xidmət dersəm sədaqətü izhari-məhəbbət ilə inani-ixtiyarımı əlimdən alub həmişə təriqi-vəfadə sabitqədəm və səbili-dəyanətdə möhkəm idi. Ləvazimi-xidmətgüzari və şiveyi-rəftari əmələ gətürüb bir hərəkəti-napəsəndidə etmədi ki, baisi-azarü nifrəti-ruh olsun. Rəftarilə məni özünə müti’ edüb, öylə ki, o dərdməndi-şuridə bu məqamı işbat etdi. Həzar iqtirahü iltimas edüb ki, bir divani-türki tərqim qıl ki, müştəmili-vüsalü hicran olsun. O cəvanın iltiması bəhri-təb’imi cuşə gətürüb, o aşiqi-binəvadən ötrü bu divani-cədidi təhrir etdüm və vüsalü hicran sənasilə bu divanın adını "Həyatü məmat" müsəmma qıldum. Hərçənd həvassi-zahirü batini gərdişi-fələki-qəddardən pərişanü məaşü güzəran bu natəvanə müşkil idi. Əgərçi bir tərəfdən atəşi-faqə, bir canibdən kəsrəti-şe’ri məni pərişan etmişdi və o cəvani-natəvanmənd… bana həm tə’sir edüb öz pərişanlığımdan qət’i-nəzər qılub mültəmisi-… yazdum. İltimas mütaliə edənlərdən oldur hərgah bir fərdü ya bir qəzəli-səbuhtəb [mürəttəb] [buldu]qda mənim haqqımda Həqqdən tələbi-məğfirət edələr ki, bəlkə, əhədiyyəti-Cəllə Cəlalüh və Ə’zəmə Şanüh ki Ərhəmür-Rahimindür, məni eşqi-məcazidə seyr edən günahdən əfv qılar və əhli-məhəbbət bu

kitabı mütaliə edəndə müəllifi bir sureyi-Fatihə ilə yad qılub disünnər:

Rübai

Ey Xuda, ey Qəfurü Zülcəlal!
Vey Şəhənşahi-Qadirü Mütəal!
Sağərini qəriqi-rəhmət qıl,
Əfv qıl hər günahını filhal.

Və hər kim ki fövqdə tərqim olan vəsiyyətimə əməl edə, ümidim Həqqdən oldur ki, o kimsənin etdigi günahın əfv edə. Və bu da vazeh olsun kim, on beş yaşından qırx yaşına yetişənə deyin dörd cild kitab təsnif etdüm. Birisi "Əqaid" və o biri kitab "Musiqi" və bir cild "Divani-farisi" və bir cild kitabi-"Divani-türki".

Bu dari-faninin olmaz bəqası,
Nəzər qılsan buna, yoxdur vəfası;
Qərəz, bir nəqşdir, aləmdə qalsın,
Budur kim Sağərinin müddəası.

Bu kitabi-türki tarixi-123[0] və şə'ban ayının 15-də ibtida oldu və zilhiccənin 9-da.

## [QƏZƏLLƏR]

Ey Xudayi-Əhədü Fərdü Qədimü Yekta![2]
Vəsfinə tutiyi-nitqim necə olsun guya?

Səni dərk eyləmədi mümkün ara bir mümkün,
Acizü mat olubdur füzəlavü hükəma.

Hər məkanda bu məkansızdı, məkanı yoxdur,
Yoxdu bir şey, Xuda olmasın andan peyda.

Bəs ki, zahirdi: xəfi oldu bu mümkündən Həqq,
Vacibin zatına yox mümkün ara hiç bəda.

Ənbiyavü rüsulü xürdü kibarü mümkün,
Hiç kəs anlamayub zatını Həqqin əsla.

Fəhüvəl-əvvəlü vəl-axirü həqqa-həqqa,
Və hüvəz-zahirü vəl-batinü ma kanə yura.[3]

Əql heyran olub, Sağəri, bu mərhələdə,
Aciz oldı füzəla, mat qalubdur ürəfa.

---

[2] Ey bir, tək, əzəli, tayı olmayan, Allah!

[3] O, doğrudan da, əvvəldir (başlanğıcdır), [doğrudan da] axırdır (sondur); O, zahirdir, batindir, [heç vaxt gözlə] görünməmişdir.

Pəsəndideyi-Həqqdür Mürtəza,
Gəlübdür o şəh şə'ninə "Həl əta…[4]
Odur şafii-xəlq ruzi-cəza,
Odur alimi-zümreyi-ənbiya.
Əminü vəkili-Xudadır Əli
Vəsiyyi-peyəmbər, imamül-hüda.
Onun nuri xəlq olmasaydı əgər,
Nə adəm olurdu, nə ərzü səma.
Əlidür qılan xəlqi irşadi-Həqq,
Odur əşrəfü sərvəri-övliya.
Onun damənindən dutan qurtarur,
Yapuş damənindən, özin et rəha.
Zəminü səmadan gəlür bu nida:
Hüvəl-alimül-hakimü kibriya.[5]
Xudavəndi-aləm qılub vəsfini,
Belə şahə səd mərhəba, mərhəba!
Bu bəşər iltifatı əgər olmasa,
Məni əfv qılmaz, yəqindir, Xuda.
Dəxiləm sana, qıl mədəd, ya Əli,
Günahkardır Sağəriyi-binəva.

---

[4] Qur`anın 76-cı ("İnsan") surəsinin başlanğıc ifadəsidir. Burada surənin Mürtəza təxəllüsü ilə tanınan Həzrəti-Əlinin şə'ninə gəldiyi bildirilir.

[5] Misranın mə'nası: O, alimdir, hakimdir, böyük şəxsiyyətdir.

Zəhi Fərdü Qədimü Zülcəlalü Əhədü Yekta,
Əli tək nuri-paki eyləyübdür aləmə Mövla.

Bu nuri-Həqqdir zahir, olub aləmlərə bahir,
Hüvəl-əvvəl hüvəl-axir hüvəz-zahir hüvəl-ə’la.

…[Münir] bər ali-nəsəbi-qalib Əli ibni-Əbi Talib,
Sana hər kim ola rağib, edər cənnət ara mə’va.

Əli xəlq olmasaydı, olmazdı zərreyi-mövcud,
Bu nurin pərtövündəndir zəminü asiman peyda.

Əgər xəlq olmasaydı, ruzi-əvvəl nuri-rəxşanı,
Ədəmdən kövnə gəlmək mümkün olmazdı, ola aşina.

Bana təb’i-rəvan eylə əta, ey Qadirü Sübhan,
Zəbanü nitqimi bu şahi-din vəsfində qıl guya.

Sana hər kim ki şəkk eylər, həqqində nik-bəd söylər,
Cəhanda xar olur, billah, olur üqba ara rüsva.

Sənin lütfün əgər olsa bana, ey şahi-din Heydər,
Bu təb’i-şe’rlə sallam cəhanə şurişü qovğa.

Adımı qoymuşam mən Sağəri, ta saqiyi-cənnət
Bana bir cam versün həşrdə, qılsun məni ehya.

Ya zal-ləzi zəhərət liəşyai külliha,
Nə əvvəlin olı mütəsəvvir, nə intiha.[6]

Hər kim ki aşiq oldı sana, tərki-can qılar,
Neylər bu dari-möhnət ara behcətü bəha?

Düşdüm bəlayi-qeydi-cəhani-fənayə mən,
Bari-Xuda, bu qeyddən et sən bəni rəha.

Rüxsarın üzrə əqrəbi-zülfün dutub məqam,
Guya ki, gənci-hüsndə yatmış bir əjdəha.

Ceyş-ceyş dutubdu Xütən mülküni vətən,
Yetdi xəzan, bu gülşənə, gör, qalmadı səfa.

Bu bütlərün vəfasına lə'nət, vəfası yox,
Mə'şuqi-Həqqə aşiq olanlar görər vəfa.

Ya Rəbb, rəqibi dərdə giriftar qılgilən,
Mə'şuqdən ayırdı məni, eylədi cüda.

Meyxaneyi-ibadətə maildi Sağəri,
Saqi, şərabi-nabilə qıl dərdinə dəva.

---

[6] Ey şeylərin hamısı üçün (hamısında) zahir olan [Allah],
Sənin nə əvvəlin, nə də axırın təsəvvür olunar.

Zəhərən-nurü min əflaki-sürurü bəha,
İlaül-ərz minən-nuri sürurü ziya.[7]

Nuri-pakin səbəb oldı bu cəhan xəlqinə,
Oldı mövcud ədəm dairəsindən əşya.

Səni əsbabi-şəfaət yaradub İzədi-pak,
Qılasan məğfirəti-tayifeyi-əhli-xəta.

Mən necə vəsf qılum, yoxdu zəban təqriri,
Onın övsafına zərrati-cəhandur guya.

Hərcü mərc olmuşdu məzhəbi-millət türra,
Çəkdi zəhmət neçə il, məzhəbi qıldı ehya.

Niyə lal olmadılar firqeyi-küffari-şəqi,
Sana məcnun dedilər, ey şəhi-dövrani-bəqa?

Sağəri sidqlə çün dutdu o şahin ətəgin,
Zülməti dəf' olub, qəlbi tapub nurü səfa.

---

[7] Şadlıq və parıltı fələklərindən (göylərindən) nur (işıq) üzə çıxdı; nurdan (işığın içindən) Yerin ucalması (görünməsi, yaranması) şadlıq və ziyadır.

Ey olubdur zati-pakin məzhəri imkan sana!
Mö’cizi-üzma budur – Həqqdən gəlüb Qur’an sana.

Sən nə bəhri-cudsən, ey məzhəri-nuri-əzəl,
Həqq özi qıldı xitab "şafii-üsyan" sana.

Şafii-yövmi-qiyamət eyləyübdür Həqq səni,
Bu sözün təsdiqinə Həqqdən yetüb fərman sana.

Sureyi-"Ya-sin"ü "Ta-ha" şanına nazil olub,
Hörmətindən ötri Cibrili edüb dərban sana.

Az qalubdur paymal olsun şəriət, qıl mədəd,
Az qalubdur qalib olsun sairi-ədyan sana.

Bir şəriət kim, anın yoxdur nəziri dəhr ara,
Lütf edüb verdi Xudayi-Qadirü Sübhan sana.

Ya rəsulallah, səndən qeyri yoxdur bir ümid,
Sağəri sidqlə dildən gətürüb iman sana.

Zəhi Xaliq ki, xəlq etmiş ədəmdən eyləyib peyda,
Qılubdur aləmi zahir, Özi xəfavü napeyda.

Miyani-küfrdə bir nuri-pak[8] eylədi məb’us
"Tüzillü mən yəşa"[9] ilə "tüizzü mən təşa"[10] peyda.

Gəhi eylər gədanı şəh, gəhi şahi gəda eylər,
Gəhi zülmət olur aləm, gəhi nuri-səfa peyda.

Onı dərk eyləməz imkan, qalubdur acizü heyran,
Edübdür zatını pünhan əzəldən, masiva peyda.

Təfəkkür eyləyən arif Xuda sün’ündə dərk eylər
Ki, olmaz bisəbəb yoxdan belə ərzü səma peyda.

Zəhi Sane’, Onun sün’ündə əqlü vəhm heyrandır,
Bu xaki-tirədən qılmış neçə min məhliqa peyda.

Sana, ey Sağəri, Tarı verüb ləfzi-dürərbari,
Bu təb’i tirədən cari qılub gör kim, Xuda peyda.

---

[8] Haşiyədə: "Tabnak etdi"

[9] Əslində, belə olmalıdır: "Yüzillü mən yəşa" (Qur’an, "Rə’d" surəsi, 27-ci ayə). Bu ifadənin mə’nası budur: "O (Allah) istədiyi kimsəni [düzgün yoldan] sapdırar".

[10] Qur’an "Ali-İmran" surəsi, 26-cı ayə. Mə’nası: İstədiyin kimsəyə qüdrət (güc) verərsən.

Ey çərx, bəsdi, qılma bu qədər cəfa bana,
Görmə, fələk, bu qədər cəfanı rəva bana.

Dəryayi-eşqə qərq olub cismi-natəvan,
Sındı ümid kəştisi, yox naxuda bana.

Çeşmin məriz oldı, könül zarü xəstədir,
Bir dərdə düşmüşəm ki, tapulmaz dəva bana.

Əl çək, əlac yoxdu mənim dərdimə, təbib,
Bir dərdə uğruyub bədənim, yox şəfa bana.

Şe’rimdə mey görüb, məni təkfir etməyün,
Meydən məhəbbəti-Həqq olub müddəa bana.

Eyşü sürurə yoxdu könül rəğbəti, nedim,
Əvvəldən oldı möhnətü qəm aşina bana.

Bəhri-günahə qərq olub Sağəri belə,
Yoxdu ümid, əfv qılunsun əta bana.

Hərçənd zatını Həqq edübdür nihan bana,
Hər zərrədə verübdi özüni nişan bana.

Təqdirə yox təğyirü təbdil xəlqdən,
Qismət olundı naləvü ah-fəğan bana.

Yetdüm vüsali-yarə, təməttö' götürmədüm,
Əzbəs rəqib vermədi bir dəm aman bana.

Gülzari-eşq içində dolandım əgərçi çox,
Rəhm etmədi o gülşən ara bağban bana.

Əyyami-növbahar gəlüb-getdi bilmədüm,
Əzbəs ki, təlx keçdi bu dövri-zəman bana.

Mən talib oldum ol xəm əbruyü qəmzənə,
Qəmzə oxı alub ələ qaşı kəman bana.

Sal bir nəzər bu çöhreyi-məhvəşlərə ki, Həqq
Qılmış Özini bu ayinədə həqq əyan bana.

Oldum cəhan içində bu həsrət ilə, olmadı,
Ey Sağəri, ki, yarım ola mehriban bana.

Qılma əfşan zülfüni ol çöhreyi-gülnarına,
Gün yüzin dutma, cəhanı zülmət etmə yarına.

Urma şanə, qıl həzər, qılma pərişan zülfüni,
Bağlanıbdır min könül ol türreyi-tərrarına.

Dövləti-eşqində, dilbər, istirahət görmədüm,
Könlümi verdüm o gün ki, qəmzeyi-xunxarına.

Vəsl ümidilə keçirdüm ömrümi, oldı tamam,
Canımı verdüm yolunda, yetmədüm didarına.

Xəlq heyran, sərv lərzan, qumrilər guya olub,
Afərin, səd afərin bu cilveyi-rəftarına!

Neçə ildür naləvü fəryad edərsən, səbr qıl,
Ey könül, fəryad qılma kim, yetərsən yarına.

Şanə dəgdi zülfünə, ya ahi-dil əfşan edüb?
Ya dəgüb badi-səba ol zülfi-ənbərbarına?

Ahi-sərdi-aşiqan pəjmürdə qılmışdır səni,
Ya əsüb badi-xəzan bu gülşəni-rüxsarına?
…......................................................[11]
Əql olub heyran sənin bu ləhçeyi-göftarına.

Az qalubdur kim xəzan olsun cəmalın gülşəni,
Mərhəmət qıl, dilbərim, bir busə yari-qarına.

Çeşmeyi-abi-həyata Sağəri qılmaz nəzər
Hər kişi kim talib olsa lə'li-şəkkərbarına.

---

[11] Əlyazmasında bu misra qaralanmışdır, oxumaq mümkün deyil.

Gəl gör, ey zalim, nə etdi atəşi-hicran bana,
Sinəmə dağlar çəküb hicran, içürdi qan bana.

Sənsiz, ey kafər, gözüm mərdümi əşk alanı
Xəl'ətim gülgun edübdür dideyi-giryan bana.

Gəlsə başım üstünə ol mahtəl'ət dilbərim,
Can cananə fəda qılmaq olur asan bana.

Şərbəti-lə'li bana vermiş həyati-cavidan,
Sud qılmaz zülmət içrə çeşmeyi-heyvan bana.

Eşqin, ey həmdəm, məni döndərdi nalə, səngdil,
Görcək el cismi-zəifim oldular heyran bana.

Çöhreyi-zərdim görüb, yarı məlamət etməyün,
Zülm əğyar eyləyübdür, etməyüb canan bana.

Sağəri qılmış səfər üqba tərəf, ey bixəbər,
Sənsiz, ey canan, gərəkməz ruhü cismü can bana.

Ol çöhrə ki, yar salubdur niqab ona,
Həsrət çəkər həmişə məhü afitab ona.

Qan eyləməkdə var yədi-beyzası lə'linin,
Könlüm quşi bu fikrdə oldı kəbab ona.

Xətti-şəkəriydi səfheyi-ruyində səf çəküb,
Ya kim, səpübdür zinət içün mişki-nab ona?

Biçarə dil fəraq oduna yandı, neyləyüm,
Şəhdi-ləbin yetürmədi bir cür'ə ab ona.

İncitmə aşiqin, həzər et, ruzi-həşrdə
Gər dutsa damənin, nə verürsən cavab ona?

Bidar gözlərimi görüb məst sanmayın,
Hicran gecəsi olmadı bir ləhzə xab ona.

Bir bari-qəm cəhanda çəküb Sağəri – giran,
Zərrati-kainat gətürməzdi tab ona.

Ey kəmanəbru, bu nə zülfi-pərişandır sana,
Hər telində min könül pabəstə qurbandır sana.

Əql məhv oldı cəmalın pərtövündən, ey gözəl,
Bu nə surətdir, nə heybətdir, bu nə candır sana?

Lütf edüb ver zindəganlıq şəhdi-lə’lindən bana,
Aşiqin bir tiğlə öldürmək asandır sana?

Yoxdu hüsni Yusifin, xəlq içrə ancaq adı var,
Hüsndə olmaz bərabər Yusifi-Kən’an sana.

Vəh nə surətdir ki, nəqqaşi-əzəl nəqş eyləmiş?
Afərin, ta xilqətin qıldı olub heyran sana.

Günbəgün eşqim odı artub ziyad olmaqdadır
Xəlqi-aləm gər desə hər gündə min böhtan sana.

Atəşi-hicranə yandırma ki, tabım qalmadı,
Sağəriyə zülmdür, ey dilrüba, üsyan sana.

Etmədi tə’sir ahü naləvü əfğan ona,
İmdi bildüm xoş gəlübdür naleyi-hicran ona.

Kimə dərdimi deyüm, ixbar edüm, yox çarəsi,
Olmadı, hərgiz, olam mən bir gecə mehman ona.

Görməmiş ruyin bəsi müşküldi can vermək bana,
Gəlsə canan, səhldir qurban edəm mən can ona.

Mətləbi-dil oldı hasil, ruhü cismü canımı
Saxladum ol qədr kim, ta eylədim qurban ona.

Qüdrətin ayineyi-vəchində Həqq zahir qılub,
Hüsni-surətdə yetişməz huriyü qılman ona.

Atəşi-hicranə yandı cismü canım, ey fələk!
Eşq odunda yanmağa cismim gəlür asan ona.

Mən’ edərlər Sağərini eşqdən, qafildilər,
Yoxdu bu şəhr içrə bir kəs – olmasın heyran ona.

Ayineyi-hüsndür məzhəri-sün'i-Xuda,
Qıldı təcəlli əzəl, ayinə tapdı səfa.

Qət'i-nəzər qılmazam arizi-gülnardən,
Çöhreyi-cananədir didəyə nuri-cəlal.

Qət'i-ümid olmuşam ol dili-divanədən,
Türreyi-şəbrənglə oldı könül aşina.

Hali-dilimdən xəbər oldı nigarım məgər,
Xəncəri-peykanlə dərdimə qıldı dəva?

Zar könül sinədən oldu fərari bu gün,
Şükr Xudavəndimə, hacətim oldı rəva.

Çıxdı vətəndən könül, yadıma düşmür vətən,
Künci-qəfəsdən məni eyləmə əsla rəha.

Bəhri-xəyalatda qərq olub Sağəri,
Əfv elə, ya Rəbb, məni, olsa sözümdə xəta.

Ruhimin tutisi ol şəkkəri-göftarə fəda!
Aləmin şahidi bu ləfzi-dürərbarə fəda!

Nə qədr ömrimi qılub sərf rəhi-eşqində,
Aqibət eylədüm ol dilbəri-xunxarə fəda.

Qəfəsi-təndə könül mürğini həbs etmişdim,
Eylədüm aqibət ol zülfi-siyəhkarə fəda.

Canımı saxladum ol qədr bəladən təndə,
Eylədüm şövqlə bir yari-vəfadarə fəda.

Kaş min canım olaydı bu bədən mülkində,
Hər birin min gəz edəydüm belə dildarə fəda.

Zarü bimar olan könlümə tapdum çarə,
Eylədüm mürği-dilim dideyi-bimarə fəda.

Sağəri canını vəqf etdi vəfadarlərə,
Çəkdi zəhmət nə qədər – ol güli-rüxsarə fəda!

Bilmərəm kim, nə deyübdi genə əğyar sana?
Qeyri-vəz’ ilə olub şiveyi-rəftar sana?

Zülfi-zəncirinə çəkdün dili-divanəmizi,
Neyləmişdi, de görüm, bu dili-qəmxar sana?

Dolanur dövri-rüxün zülfi-siyəh hər saət,
Mən kimi zülfün olub aşiqi-didar sana.

Mən qəmi-eşqinə düşdüm, bilmərəm eşq nədir,
Olmasın mən kimi bir kimsə giriftar sana!

Dərdimi badi-səbayə dedüm izhar etsün,
De görüm, badi-səba eylədi izhar sana?

Qıl təkəllüm mənlən, ey büti-ziba, hər dəm,
Verdi Həqq çünki belə lə’li-şəkərbar sana.

Sağəri, qılma şikayət, dəxi qəmxarım yox,
Tirü peykanı olub sinədə qəmxar sana.

Çöhrəsi cananımın bir mahi-ənvərdir bana,
Qaməti-mövzunilə sərvi-sənubərdir bana.

Tiği-qəhrin gər ura başıma eyni-lütfdür,
Fəxr qıllam tiğinə bir tacü əfsərdir bana.

Gər görəm yarı rəqiblən olubdur həmnişin,
Od dutar canım, o gün bir türfə məhşərdir bana.

Gər desəm, kafər məqamı cənnətü firdövsidir,
Anlamazlar mətləbim, derlər ki, kafərdir bana.

Sal nəzər, gör cənnət içrə kafəri kim, seyr edər,
Ruyi-cənnət kafəri zülfi-müənbərdir bana.

Səlsəbilü kövsəri neylüm, əlim yetməz ona,
Şərbəti-lə'lü ləb manəndi-kövsərdir bana.

Sağəri, cəhd eyləmə vəslinə, tapmazsan onı,
Hicr odunda yanmaq Həqqdən müqərrərdir bana.

Ey məlahət bağının xəzan güli, ey dilrüba,
Bu qədər zülm-cəfanı sən bana görmə rəva.

Can verüb min şövqlə, vəslinə vasil olmuşam,
Rəhm qıl, ey çərxi-dun, hicranə qılma mübtəla.

Zülfdür dövri-rüxündə dövr edər dövri-qəmər,
Yoxsa gənci-hüsn üstündə yatubdur əjdəha?

Yarını gördi, özini bilmədi kim, varü yox,
Lal olubdur aşiqin, ondan dəxi çıxmaz səda.

Gülüstan oldı xəzan, səhni-çəmən viran olub,
Səhni-gülzari-çəməndə qalmadı hərgiz səfa.

Canımı, nəzr eylədüm, cananıma qurban edüm,
Gör nə bədbəxt olmuşam kim, hacətim olmaz rəva.

Uyma, ey dil, bu cəhanın şahidi-zibasına,
Bivəfadır, Sağəri, hiç kimsəyə qalmub vəfa.

Düşübdür başıma zülfi-siyahından əcəb sevda,
Olub divaneyi-zənciri-zülfün aşiqi-rüsva.

Könüllər izdihamı, şanə zəcri vermədi təmkin,
Səri-zülfündə bir dəm könlümə gün, ey büti-ziba.

Bu surətdə, bu qamətdə, bu hüsnü xülqdə hərgiz,
Nə dünyadə, nə üqbadə sana bir kimsə yox həmta.

Nə yalquz ixtiyarım aldı əldən çeşmi-cadusi,
Bu çeşmi-fitneyi-məstin salubdur aləmə qovğa.

İnani-ixtiyarım aldı əldən çeşmi-məxmurin,
Cəmalın gülşəni qılmış könül mürğin əcəb şeyda.

Deyərdim dərdimi cananıma qaçan edüm izhar?
Səni gördüm, özimi görmədüm mən, ey mələksima.

Bana olmaz bərabər, Sağəri, Məcnuni-Leyladən
Yetişməz eşqimə, hərgiz, yəqin qıl, Vamiqi-Əzra.

Ey könül, gəl rəhm qıl bu nazpərvər canına,
Əhli-aləm cəm' olur nəzzareyi-əfğanına.

Zülməti-zülfündə könlüm mürği gəzdi telbətel,
Yetmədi hərçənd güzəri çeşmeyi-heyvanına.

Aşiyanı könlümün ol türreyi-tərrarədir,
Bülbüli-dil oldı mail qönçeyi-xəndanına.

Türreyi-tərrar içində qoyma tənha, səngdil,
Könlümi tapşurgilən ol navəkü peykanına.

Ağla, ey göz, vəslə yetcək qıl şikayət hicrdən,
Bəlkə rəhm etsün nigarın dideyi-giryanına.

Sinədə min göz açaydı kaş peykanın bana,
Hər biriylə mən baxaydum çöhreyi-rəxşanına.

Atəşi-hicran mənim yandırdı canım, Sağəri,
Qalmadı cismimdə taqət cifeyi-hicranına.

Şanə qıldı könlümi zülfi-pərişandan cüda,
Gör necə bədbəxtdir, ruhi qılub candan cüda.

Bağbani-bimürüvvət sındurub balü pərim,
Səngi-zülmilə urub qıldı gülüstandan cüda.

Ruh cismimdən cüda olsun, xilas etsün məni,
Olmasın, ya Rəbb, könül mülki o peykandan cüda!

Dolanur dövri-rüxündə könlümün pərvanəsi,
Necə kim pərvanə olmaz şəm'i-suzandan cüda.

İnfikak etməz məni səndən, məgər mövtü əcəl?
Zərrə müşküldür ola ol mehri-rəxşandan cüda.

Qanə dönmiş, parələnmiş dil bana oldı rəqib,
Olmasın, ya Rəbb, könül fəryadü əfğandan cüda.

Can cüda olsun tənimdən, olmasın, ya Rəbb, ola
Cismi-rəncurim mənim ol tiri-müjgandan cüda.

Bəndi-bəndimdən əgər qət' etsələr, mümkün degil
Kim, olam ol sərvqəddi-mahtabandan cüda.

Sağəri, ahü fəğanından cəhan qan ağladı,
Bais oldur kim, olubdur vəsli-canandan cüda.

Mərdümi-çeşmim, görün kim, eyləyüb ehsan bana,
Hər zəman isar edər yüz min dürri-qəltan bana.

Ağzı fikrində vücudimi ədəm qıldı fələk,
Olmadı kim, faş ola bu nükteyi-pünhan bana.

Nəş'eyi-zövqü məhəbbət cövhəri-zatimdədir,
Ol səbəbdən xoş gəlür bu navəki-peykan bana.

Öldürür gəh qəmzəsi, gəh işveyi-canan bəni,
Kaş edəydi dilbərim bir dəf'ə qəsdi-can bana.

Vəsldə hicran olur, hicrandadır ümmidi-vəsl,
Vəsldən könlüm çıxubdur, xoş gəlür hicran bana.

Deməsünlər qanlu yaşım cismimi gülgun edüb,
Xəl'əti-gülgundur, ən'am edüb canan bana.

Bu nə rüxsari-məlahətdir, nə nazü işvədir?
Sağəri heyran sana kim, xəlq olub heyran bana.

Atəşi-hicran ara yanmağı əğyarım görüb
Ağladı əhvalıma, çün çeşmi-xunbarım görüb.

Ağla, ey göz, nalə qıl, ey dil, bahar əyyamıdur,
Var ümidim rəhmə gəlsin naleyi-zarım görüb.

Gün dutuldı, çöhrəsindən getdi nuri, qalmadı,
Bu cəhəttəndir: bu gün Gün çöhreyi-yarım görüb.

Şanə dəgdi zülfə, ya badi-səba, yoxsa mənim
Ahi-sərdimlə pərişandur şəbi-tarım görüb?

Gördüm əğyarı bu gün – bəhri-məhəbbət cuş edüb,
Anladum kim, çöhreyi-yarımı əğyarım görüb.

Yox dilim dərdi-dilim cananə izhar eyləyüm,
Rədd qılsın qövlimi hər kimsə göftarım görüb.

Girmədi meyxaneyi-piri-muğanə Sağəri,
Ol zəman ki, nərgisi-şəhlayi-xəmmarım görüb.

Şəm'i-rüxsarına könlüm quşi pərvanə olub,
Hiç pərva eyləməz yanmaqa pərvanə olub.

Könlümi mən' edərlər: – Niyə məcnun oldun? –
Baxdı zənciri-səri-zülfünə, divanə olub.gül

Getmə firdövsi-üzarına, könül, danə içün,
Adəmin xiffətinə bais bir danə olub.

Gözi cəllad olub canımı istər, nə əcəb.
Bu könül mürğinə cəllad bu gün şanə olub?

Kimə dərdimi deyüm, dil bana rəhm eyləməyüb,
Zülfünə üns dutub dil, bana biganə olub.

Keçdi gülzari-vüsalında olan nalələrim,
İmdi mənzil bana bir guşeyi-viranə olub.

Bu gün, ey eşq, gəlüb cuşə məni məcnun qıl,
Deməsünlər bana kim, Sağəri fərzanə olub.

Bu naməni bir aşiqi-biçarə yazub,[12]
Bir kafəri-xunxari-sitəmkarə yazub.

Ey qasidi-fərxəndə, apar kağızımı,
Ver yarə, de kim, bir cigəri yarə yazub.

Öldürdü məni bu dərdi-münşiyi-qəza,
Gülçöhrə nigarımı neçün xarə yazub?

Münşiyi-qəzavü qədər əvvəl gündən
Bəxtimi mənim o zülf tək qarə yazub.

Sınsun əli münşiyi-qəzavü qədərin,
Dildari-vəfadarımı əğyarə yazub!

Təhrir qılub qanlu gözüm yaşilə,
Min əczlə bir yari-dilazarə yazub.

Yetcək sana kağızım dəxi etmə dirəng,
Vəslini təbib dərdimə çarə yazub.

Can verdi fəraq odunda min həsrətilən,
Bu şe’ri-cədidi Sağəri tazə yazub.

---

[12] Bu qəzəlin ilk beş beyti $10^{a}$ vərəqinin haşiyəsində, son üç beyti $10^{b}$ vərəqinin haşiyəsində yazılmışdır.

Vüsalinə yetişdim bir də hicran olmasın, ya Rəbb!
Pərişan zülf tək könlüm pərişan olmasın, ya Rəbb!

Olub amadə qətlimçün, mübarək əzmdir, ey dil,
Bu əzmindən, Xudavənda, peşiman olmasın, ya Rəbb!

Açubdur sinəmə min göz xədəngi-tirü peykanı,
Məhəbbət zövqünün sirri numayan olmasın, ya Rəbb!

Ləbin fikrü xəyalilə könül bir ləxtə qan oldı,
Rəqibin könli könlüm tək belə qan olmasın, ya Rəbb!

Vüsalə yetmək olmaz, hicr qədrin bil, xoş aləmdir,
Vüsalın anma çoq, hicranə payan olmasın, ya Rəbb!

Gəlüb cərrahlər təndən çıxarsın qanlu peykanın,
Çıxan cismimdən olsun can, peykan olmasın, yaRəbb!

Cəhan cümlə xərab olsa, yeməz qəm Sağəri, billah,
Xocəstə mülkdür meyxanə, viran olmasın, ya Rəbb!

Çöhreyi-gülgunə, səndən gər ala yarım niqab,
Xiclətindən çərxə çıxmaz həşr olunca afitab.

Çöhreyi-cananımın xurşidə yoxdur nisbəti,
Ay cəmalından alur peyvəstə nurin afitab.

Ləbləri lə'li-Bədəxşan tək qararmış, bilmərəm:
Xuni-aşiqdir edüb rəngin, ya rəngi-şərab?

Sordum ağzı sirrini hər nüktədandan, bilmədi,
Eylədüm təhqiq özündən, vermədi əsla cəvab.

Hansı dərdimə əlac etsün müaliclər bənim?
Bir degil dərdim ki, hərgiz yox ona həddü hesab.

Vəsl mə'mur eyləməz əsla bu viran könlümi,
Firqətində xaneyi-aşiq belə olmuş xərab.

Gər vücudini ədəm qılsan, yetərsən yarına,
Sağəri, bil kim, vüsalına vücudindir hicab.

Mürği-dil pərvaz edüb zülfi-pərişanın görüb,
Düşməsünmi damə zülfi-ənbərəfşanın görüb?

Necə lağər olmasın cismi-zəifim qüssədən? –
Neçə illərdir çəkübdür daği-hicranın görüb.

Gördü hər kəs kim, mənim əhvalıma qan ağladı
Sinəm üzrə hər kişi kim zəxmi-peykanın görüb.

Bağban qət’ etdi sərvin riştəsin gülzardan,
Ol zəman kim, yarımın sərvi-xuramanın görüb.

Qönçələrdən təng olub, hərgiz açılmaz qüssədən,
Bu yəqindir kim bana, lə’li-dürəfşanın görüb.

Gər sirişkim bəhri-zəxxar oldı, qərq oldum ona,
Səndən ayru cismi-zarım Nuh tufanın görüb.

Sağəri düşdi ayağına badə tək qan-yaş tökər,
Gülşən içrə nazilə hər ləhzə cövlanın görüb.

Sənsiz, ey dilbər, gözüm bəhri əcəb tufan edüb!
Qərq edübdür cismimi, gəl gör necə tüğyan edüb!

Ləşkəri-hicran hücum etdi bu gün can mülkünə, –
Könlümi tiği-qəzəblə ləxtə-ləxtə qan edüb.

Gərdişi-dövri-fələkdən razıyam, yox bir sözim,
Hər nə etmişdir, edübdür – atəşi-hicran edüb.

Lüftə bax mə'şuqdən ehsan edübdür aşiqə! –
Tiği-əbrusinə, tiri-qəmzəyə mehman edüb!

Mən xəyali-vəslilə könlümi şad etdüm bu gün,
Vaqif oldı hicr odı, qəsdi-dili-suzan edüb.

Sən görən aşiq degil, gəl gör necə surətdədir? –
Xəlqi-aləm cəm' olub, cümlə bana heyran olub.

Sağəri tənha degil qurban bu gülrüx dilbərə,
Şiveyi-rəftarü göftarına min qurban olub.

Gər ala məh çöhrəsindən lütf edüb yarım niqab,
Həşr olunca xiclətindən çərxə çıxmaz afitab.

Neyləmişdüm mən sana, ey padişahi-mülki-hüsn,
Atəşi-hicrana cismi-zarımı qıldun kəbab?

Və'də verdün gəlmədün, bais nə oldı, bilmərəm,
Düşdi könlüm mülkinə gəl gör nə növ'i-iztirab.

Ləşkəri-şövqin alub dil mülkini, viran edüb,
Vəslilə abad qıl, qoyma bu mülki sən xərab.

Çeşmeyi-abi-həyatından məni sirab qıl,
Yanmaqa eşq atəşində qalmadı cismimdə tab.

Ağzını sordum nigarımdan bəni agah qıl,
Qəhr edüb etdi[13] ki, sorma ağzımı, yoxdur cavab.

Dilbərim, axır nəfəsdir gəl görüm məh təl'ətin,
Can çıxar təndən gedər, kafər, şitab eylə, şitab!

Badə tək düşdüm ayağə, dut əlimdən rəhm qıl,
Sağəri üftadədir, dövri-fələkdənqıl səvab.

[13] Burada: "dedi". Ola bilsin, "ayıtdı" sözünü belə yazmışdır.

Məhtəl'ətim nolub ki, gözümdən nihan olub?
Yoxsa rəqib məhvəşimə pasiban olub?

Bülbül nə növ' gülşən ara nalə etməsin,
Çün xari-bədmədar gülə bağban olub?

Ey şanə, dəgmə könlümə zülfündə, qıl həzər,
Könlüm quşuna türrəsi dari-aman olub.

Bir dərdə düşmüşəm ki, onun yoxdu çarəsi, –
Bəndən nigar qəhr qılub, bədgüman olub.

Lə'lin xəyalı bağrımı qan etdi hicrdə,
Qanlu yaşımla pirəhənim ərğəvan olub.

Xoş gülşəndi gülşəni-rüxsarı yarımın,
Səd heyf, gülüstan cəmalı xəzan olub.

Ta eylədüm həvəs ləbi-lə'linə məhvəşün,
Biçarə dil bu fikrdə bir ləxtə qan olub.

Eyn bəhari-hüsndə qədrimi bilmədi,
İmdi xəzan dəmində bana mehriban olub.

Meyxanə məhəbbəti-mə'şuqə, Sağəri,
İrşad qılmaqa bana piri-muğan olub.

Dideyi-əhli-nəzər bir belə surət görməyüb,
Baməlahət, sərvqamət, mahtəl'ət görməyüb.

Atəşi-hicran məni yandırdı – yansun mən kimi,
Nalədən qeyri cəhanda hiç ləzzət görməyüb!

Vəslə yetsəm, qıl nəvaziş aşiqi-divanəni, –
Atəşi-hicran ara cismim fərağət görməyüb.

Bağban, azad qıl könlüm quşını həbsdən,
Şanə zəcrindən könül zülfündə rahət görməyüb.

Qaməti sərvi əlamətdür qiyamətdən bana,
Deməsünlər kim bana, hərgiz, qiyamət görməyüb.

Dami-zülfündən xilas etmə, dəxiləm mən sana,
Könlümün mürği cəhanda hiç zillət görməyüb.

Bülhəvəsdən bədgüman olmuş bu mə'şuqəm mənim,
Sağəridən məhvəşim, hərgiz, xəyanət görməyüb.

Dideyi-giryanımı ol dəm ki, cananım görüb,
Ağladı əhvalıma, çaki-giribanım görüb.

Bax, rəqibi-rusiyahə, qıldı istehza bana,
Atəşi-hicran ara çün çeşmi-giryanım görüb.

Cəm’ olub nəzzarəmə xəlqi-cəhan, ey dilrüba,
Yandılar bir-bir bana hali-pərişanım görüb.

Xəlqi-aləm bildi səyyad eyləmiş seydi-könül,
Zəxmi-sinəmdən könüldə qanlu peykanım görüb.

Pərtövi-xurşid ayağına düşər, bir vəchi var:
Mən kimi aşiq olubdur, mahtabanım görüb.

Qümrilər meyl eyləməz sərvə, nə rəğbət, bağban
Ol səbəbdəndir, bu gün sərvi-xuramanım görüb.

Vəslinə meyl eyləməzlər, Sağəri, cananımın, –
Dəgdi aləm bir-birinə daği-hicranım görüb.

Məh təl'ətin şüai məni heyrətə salub,
Məxmur gözlərin bədənim afətə salub.

Düşdi kəməndi-zülfünə könlüm quşi o gün,
Könlüm quşini xali-siyəh qeyrətə salub.

Zövqi-vüsalü fikri-şəbi-tari-firqətin
Biçarə aşiqi necə gör zəhmətə salub!

Hər dəm ki gördi zülfi-pərişan mürği-dil,
Çəkdi məni o zülmət ara, möhnətə salub.

Xali-siyahi-kafərü zülfi nigarımın
Hicran evində aşiqini üzlətə salub.

Saldı kəməndi-zülfünə səyyad könlümi,
Dari-nəşat içində əcəb izzətə salub!

Fəryad, Sağəri, nuri-rüxi-alə! Dilbərim
Qoymaz baxam yüzünə, məni həsrətə salub!

Ənbəri-zülfinə verüb piçü tab,
Saldı genə xatirimə iztirab.

Mehr nigarımın olub aşiqi,
Payinə sürtər yüzini afitab.

Xəlqi-cəhan mən kimi heyran olı,
Görsə yüzin dilbərimin biniqab.

Var cəhan içrə bəsi bədnəzər,
Çıxmagilən mehr kimi bihicab.

Fikri-vüsalında şəbi-hicr ara
Gəlmədi bu didəmə bir ləhzə xab.

Bağladı meyxanəni piri-muğan,
Məst gözündən olub aləm xərab.

Navəki-müjgandı, ya nizədür,
Ya fələki-hüsndə tiri-şəhab?

Atəşi-hicranə yanub Sağəri,
Həşr güni Həqq bana verməz əzab.

Şəhi-eşqin olubdur canə qalib,
Nə yalquz canə, həm imanə qalib.

Vüsalından ümidim qət' qıldum,
Onunçun olmuşam hicranə qalib.

Nigarım şərbəti-lə'lü ləbilə
Olubdur çeşmeyi-heyvanə qalib.

Qəddi Tuba, ləbi Kövsər, rüxi gül,
Cəmalın pərtövi qılmanə qalib.

Mənim dərdimdə acizdir müalic,
Olubdur dərdimiz dərmanə qalib.

Fəraqın zülməti təqrirə gəlməz,
Vüsalın pərtövi imkanə qalib.

Fəğanü göz yaşimlə olmuşam mən
Özim Nuha, gözim tufanə qalib.

Rəqibi-səgsifətdən bak qılman,
Necə rubəh ola aslanə qalib?

Bu eşqi-pakini kim, aləm içrə
Olubdur, Sağəri, İranə qalib.

Göz yaşımdan damənim gəl gör necə gülgun olub,
Həsrəti-lə'linlə könlüm ləxtə-ləxtə xun olub.

Könlümi zənciri-zülfündən xilas etmən, aman,
Bağlanubdur türreyi-Leylayə dil, Məcnun olub.

Xəlqdən qaçdum ki, sirri-eşqi pünhan eyləyüm,
Dövləti-eşqindən, ey məh, mənzilim hamun olub.

Can xilas etmək bəladən səxt müşküldür bana,
Bu cəhətdən düşməni-canım bu çərxi-dun olub.

Qüssədən bir dəm açılmaz qanə dönmüş bu könül,
Qalmadı aləmdə bir qəm, sinəmiz məşhun olub.

İstər idim tərk edəm eşqini məqdur olmadı,
Günbəgün, saatbəsaət şövqimiz əfzun olub.

Səndə, ey gülrüx, dəxi mən mehribanlıq görmədüm,
Yarımın gör, Sağəri, əhvalı digərgun olub.

Əbri-zülfündən onun çöhrəsinə sayə düşüb,
Əqrəbi-zülfdi, ya sünbüli-tər ayə düşüb?

Daneyi-xali-siyəhdir rüxün üzrə, yoxsa
Nöqteyi-küfr gəlübdür – necə tərsayə düşüb?

Muri-xəttdir ki dutub çöhreyi-alın, yoxsa
Mişki-tatar gəlübdür rüxi-zibayə düşüb?

Şanəvü bad bana qıldı sitəm zülf içrə,
Şanəni gördi könül, gör necə pərvayə düşüb!

Özümi dərk eləmək qalmadı hərgiz məndə,
Ta gözim mərdüməgi ol dürri-yektayə düşüb.

Həbəş əhlidi Xütən mülki ara düşdi qərib,
Yoxsa kim xali-siyəhdir, rüxi-həmrayə düşüb?

Rüxi-həmradəərəqdir düzülüb hər tərəfə,
Yoxsa şəbnəmdi, həvadən güli-rə'nayə düşüb?

İçməmiş badeyi-saf ləbi-cananından,
Sağəri meykədeyi-eşqdə qövğayə düşüb.

Dideyi-məsti bana bir vəz'lə vermiş firib,
Cismü canımda bənim nə səbr qalmış, nə şəkib.

Gülüstan oldı xəzan, imdi xərif əyyamıdur,
Sud qılmaz dadü fəryadın dəxi, ey əndəlib.

Mən ona talib, o da rağib bana, ey dustlər,
Dilbərim sahibvəfadır, neyləyüm, qoymaz rəqib.

Bilmədi bimari-eşqi-çöhreyi-məhtəl'ətəm,
Nüsxə yazmış çareyi-dərdimə kor, əhməq təbib.

Nöqtədir, ya zəngi bəççə biədəblik eyləyüb? –
Cür'ətə bax, çeşmeyi-heyvana olmuş qərib!

Mən' qılma ahü əfğandan məni, ey səngdil,
Dərd çox, həmdərd yox, ah etməsin miskin qərib?

Sağəri, şükr eylə hicran atəşində yanmaqa,
Şərbəti-vəsli dili-bimarıma olmaz nəsib.

Nərgisi-şəhla gözi cismimi bimar eyləyüb,
Ruzgarım zülfi-şəbrəng şəbi-tar eyləyüb.

Hansı dərdimə qılum çarə, fələk etmiş bana? –
Bir degil, min dərdi-ənduhə giriftar eyləyüb.

Bağban, təklif qılma gülüstanə sən bəni,
Sinəmi peykanü tiri gör nə gülzar eyləyüb!

Yoxdu bir yarü mədədkarım, bana qəmxar ola,
Künci-qəmdə çərxi-gərdun, gör, bəni xar eyləyüb.

Yarımı əğyar gör kim necə sirab eylədi,
Ol səbəbdəndir mənim qətlimdə israr eyləyüb.

Eyləmişdüm atəşi-eşqini pünhan sinədə,
Göz olub bais bana, əşklə izhar eyləyüb.

Sağərini məst sanmın kim, edər şürb müdam –
Badeyi-lə'li məni məxmuri-xəmmar eyləyüb.

Qəlbimin mülkünə ta eşqin şəhi ləşkər çəküb,
Tiği-əbrusi olub yağı bana, xəncər çəküb.

Sinəmin dağın görüb həml etməyin od yandurub,
Sinəmə bu dağları bir belə məhpeykər çəküb.

Dilbərim basdı qədəm xaki-gülüstanə, o dəm
Xakdən mövcud olub sərvi-sənubər, sər çəküb.

Daneyi-xalına meyl etdi könül mürği, o dəm
Tiri-müjganı nigarın qətlimə səflər çəküb.

Bidilü biçareəm, düşmən olubdur dil bana,
Zülfi-tarilə könül mürğini bu kafər çəküb.

Ruzi-əvvəldəndi bu surət, nigarım, yoxsa kim,
Arizi-gülgununa məşşatələr zivər çəküb?

Məst olub, hərgiz, özini bilmədi kim, varü yox,
Sağəri meyxaneyi-eşqində ta sağər çəküb.

Ruzi-əvvəldən Xuda cananə gül peykər verüb,
Çeşmi-məstü nöqteyi-xalı ona zivər verüb.

Hikməti-Həqqi nə bilsün xəlqi-aciz kim, nədir?
Dustin üryan qılubdur, kafərə əfsər verüb.

Qabiliyyətdir təqaza eyləyən nikü bədi,
Ol səbəbdəndir bana zəhr, özgəyə şəkkər verüb.

Aşiqə qıldı əta hicran odunda yanmaqı,
Ruzi-əvvəl çün məhəbbətdən ona sağər verüb.

Qalmışam heyran, nə hikmətdir bu, aşiq sinfinə
Sirri-eşqi verməyüblər, cismü canü sər verüb?

Göz yaşım dutdu cəhanı firqətində, ey gözəl,
Qeyrə gün verdi, bana çərxi-fələk əxtər verüb.

Yazdılar Məcnunə Leylanı əzəl katibləri,
Sağəri həqq aşiqdür xəlqinə [rəhbər] verüb.

Sün'ilə Həqq özini xəlqə nihan eyləməyüb,
Zatını zərreyi-imkanə əyan eyləməyüb.

Aşiqi-saliki-arif bu cəhan mərdüminə,
Sirri-eşqi-əzəli hiç bəyan eyləməyüb.

Tiği-xunrizlə səd çak qılub aşiqini,
Belə sərməst olub, canə aman eyləməyüb.

Aşiq ol Həqqə, cəhan əhlinə uyma, ey dil,
Talibi-Həqq bu dəhr içrə ziyan eyləməyüb.

Şəbi-hicrandə görüb, naləmi mən' eyləməyün,
Kimdi bu dari-fəna içrə fəğan eyləməyüb?

Məni öldürdi bu həsrət, kimə dərdimi deyüm? –
Sinəmi tiri-itabına nişan eyləməyüb!

Yüz qoyub zövqlə payinə, fəda etmək içün
Can verüb Sağəri cananə ki, qan eyləməyüb.

Bu nə qəddir, nə qiyamət, bu nə hüsnü hərəkat? –
Əqlimi məhv qılub, etdi məni hüsnünə mat!

Abidü zahid əgər görsə cəmalın, bişəkk,
Mustafa ruhuna hər ləhzə verür yüz salavat.

Halımı bilmədün, ey kafəri-birəhm gözəl,
Şəbi-hicranda sənsiz necə keçdi ovqat?

Məni qorxutma qiyamətlə sən, ey zahidi-şəhr,
Şəbi-hicranı olubdur bana yövmi-ərəsat.

Mürdə tək düşmüş idüm atəşi-hicran içrə,
Şərbəti-lə’li-ləbin verdi bana tazə həyat.

Bu necə cismü bədəndir, bu necə qönçə dəhən?
Görməyüb dideyi-aşiq belə pakizə sifat.

Kəştiyi-şövqümi girdabə salub mövci-həvəs,
Eşq bəhrində bana olmadı ümmidi-nəcat.

Badə tək saldın ayağa bu gədayi-dərini,
Lütf edüb dut əlimi, ey şəhi-alidərəcat!

Kimə dərdimi deyüm, arizi-gəndümgundan
Rəhm edüb Sağəriyə vermədi bir danə zəkat.

Bu nə sərvdir, nə qamət ki, edər əyan qiyamət?
Bu nə çöhrədir, nə təl'ət, bu nə hüsndür, nə məlahət?

Dutub əldə tiğü xəncər, qılub aləmi müsəxxər,
Məni öldürür bu kafər, budu əhli-eşqə hörmət?

Bu nə qənddir, nə şəkkər, bu nə çeşmədir, nə kövsər,
Budu lə'li-safü dilbər, verir ruh [zülfə] ləzzət.

Bu nə çeşmdür, nə cadu, bu nə fitnədir, nə ahu,
Bu nə türrədir, nə giysu, sana Həqq edüb kəramət?

Bu nə cism, ruh, candur, bu nə afəti-zamandur,
Bu cəvan əcəb cəvandur ki, gəlür xocəstəsurət?

Al üzündən o niqabı, qıl rövşən afitabı,
Gətü sal o rəxtxabı, dəxi durma, oldı xəlvət.

Məni, Sağəri, zəmanə necə gör yetürdi canə,
Gedər olsam hər məkanə, bana yoxdu bir fərağət.

Cəhanda görmədüm mən istirahət,
Biğeyr əz möhnətü dərdü küdurət.

Ləb kövsər, rüx firdövsi-cənnət,
Əlamətdür qiyamətdən bu qamət.

Vüsalına nigarın yetmədüm mən,
Şəbi-hicranıma yoxdur nəhayət.

Məni azad qıl künci-qəfəsdən,
Bəhar əyyamıdur, ey bimürüvvət!

Kişinün hüsnü xülqi xəlq içində
Dəyanətdir, dəyanətü istiqamət.

Dilim lal olsun, ey dilbər, əgər mən
Edəm qeybətdə səndən bir şikayət!

Könül mürğin sana tapşurdum, ey gül,
Sana bəndən əmanətdir, əmanət.

Götürməz damənindən Sağəri əl,
Gər eylərsə məni aləm məlamət.

Gəl, ey dil, nalə qıl, hicranda dildarı xəbərdar et,
Şəbi-hicran ara mən çəkdügim dərdimi izhar et.

Könül eylər təmənna gülüstan seyrin, gül, ey didə,
Töküb qanlu yaşın, damanımı sən rəşki-gülzar et.

Fəraqında yanub canım, vüsalın oldı dərmanım,
Təkəllüm qıl bənimlə, sakit olma, yar, göftar et.

Olub biganə dil məndən, qılubdur zülf ara məskən,
Onı sən, şanə, qoyma zülf ara, hər ləhzə azar et.

Bana mümkün degil yetmək nigarın kuyinə, barı
Qəmim təqrir qıl, badi-səba, cananə israr et.

Məni qıldı cüda səndən rəqibi-kafərü bidin,
Xudavənda, rəqibi mən çəkən dərdə giriftar et!

Deyün dərdimi cananə, doyubdur Sağəri canə,
Gəlüb bu beyti-hicranə bana bir ərzi-didar et.

Şərbəti-lə’lin bana, ey dilrüba, verdi həyat,
Zahir oldı cismimə lə’li-ləbindən mö’cüzat.

Rahi-eşqindən mühal olmuş ayağ çəkmək bana,
Eşq məhbusuna olmaz eşqdən olsun nəcat.

Aşiqindən hiç mə’şuqə təğafül eyləməz,
İşvəvü nazlə hər dəm göstərür min iltifat.

Aşiqi mə’şuqdən qılmaq cüda mümkün degil,
Xəlq içün bu əmr müşküldür, edə illa məmat.

Gör nə bədbəxtəm rəhi-eşqində, ey dilbər, sənin,
Atəşi-hicranını vəsl bana qılmış bərat.

Meyl qılma dari-dünyayə, könül, məkkarədir,
Bu bəla darında hər kəs əglənüb, qıldı vəfat.

Ey qəni, fəqr əhlinə hüsnün zəkatın gör rəva,
Sağəri füqəradandır, qıl ona rəddi-zəkat.

Çünki getdün nəzərimdən bana yüz verdi məmat,
Bədəni-mürdəyə verdi qədəmin tazə həyat.

Qalmadı hiç məmalik – onı seyr eyləmədüm,
Görmədüm məhvəş içində belə pakizə sifat.

Paybənd oldı könül zülfi-müsəlsəldə, dəxi
Yox ümidim ki, ola zülf əsirinə nəcat.

Fil bülənd eylədi hicran ələmi, türfə budur,
Rüxi-şəh eyləməsünmi məni bu ərsədə mat?

Eşq odı düşdi mənim canıma, əsla sönməz,
Cismimə bağlana gər bir neçə gün rudi-Fərat.

Ver zəkat rəxtini bu aşiqi-miskinə ki, Həqq
Füqəra əhlinə vacib eləyüb rəddi-zəkat.

Razıyam, Sağəri, hər nə bana Həqq qıldı əta,
Kafəri qıldı qəni, fəqr bana verdi bərat.

Kim demiş, məşşatə, tari-zülfi-yarə şanə dut?
Hər telində zəcrlə yüz min dili-divanə dut?

Ey könül, hər surəti-xub görüb meyl eyləmə,
Bülhəvəslikdən götür əl, daməni-cananə dut.

Çünki əsbabi-şəfaət eyləyüb Həqq Heydəri,
Daməni-ali-Əlini, ey könül, mərdanə dut.

Bülbüli-bağı-məhəbbətsən, könül, fəryad qıl,
Sakit olma bir zəman, yüz bu güli-xəndanə dut.

Bülhəvəs gər lafi-eşq ursa, ona dutma qulağ,
Aşiqi-sadiq mənəm, mən qılduqum əfğanə dut.

Rəşkim artar, zülfüni görcək cəmalın seyr edər,
Qoyma düşsin çöhrənə ol türrəni, biganə dut.

Dövri-şəm'i-arizdə tovf qılsa Sağəri,
Mən' qılma, qoy dolansın könlümi, pərvanə dut.

Nəsimi-sübh, qəribəm, bana sən imdad et!
Şikənci-zülfi-siyəhdən bəni sən azad et!

Günimi qıldı siyəh şanə tari-zülfündə,
Xilas eyləgilən, ey əcəl, məni şad et!

Xərabə qıldı fələk canımı fəraqında,
Xərabə canımı vəslinlə, yar, abad et!

Təriqi-eşqi-məcazidə, ey Xuda, qoyma,
Fəriqi-eşqi-Həqqə, lütf eylə, irşad et!

Səba, əgər güzərün düşsə kuyi-cananə,
Yetən zəmanda nigarıma sən bəni yad et.

Yetəndə vəsli-həbibə, könül, fəğan eylə
Ki, bəlkə rəhmə gələ dust, dadü fəryad et!

Vüsalə yetmədi əl, Sağəri, nə çarə qılum? –
Fəğanü nalə ilən hicr evini bərbad et!

Ey könül, qəsdi-kuyi-canan et!
Ol səri-kudə ah-əfğan et!

Kəsmişəm mən təmə’ vüsalindən,
Cismimi hicr odunda büryan et!

Vermişəm zülfünə könül mürğin,
Xah giryan, xah xəndan et.

Ey könül, vəsl olmadı məqdur,
Adəti-suzi-nari-hicran et!

Qoyma görsün yüzini mehrü qəmər,
Zülfüni çöhrənə pərişan et!

Çöhreyi-ali-dilsitanə, Xuda,
Günbəgün eşqimi firavan et!

Sağəri, yoxdu çarə əğyarə,
Payi-dildarə can qurban et!

Ey könül,  uyma o zülfi-siyəhə, dilbəri dut,
Daneyi-arizi-gülgun, ləbi-əhməri dut.

Təşnədir şərbəti-tiğinə bu aşiq xeyli,
Rəhm qıl halına üftadələrin, xəncəri dut.

Gülə aludə olub bülbüli-biçarə əbəs,
Ey səba, bülbülə de: gəl belə gülpeykəri dut.

Çeşmi-məxmuri könül qönçəsini qan etmiş,
Bu qəmin dəf'inə, saqi, əlinə sağəri dut.

Uyma məhrulərə, ey dil, həzər et, etmə günah,
Tövbə qıl, sidqlə damanı-şəhi-Heydəri dut.

Hərzə-hərzə dolanub hər tərəfə getmə, könül,
Bülhəvəs olma, vətən sən özünə bir dəri dut.

Sağəri, atəşi-duzəx sana tə'sir etməz,
Cəhd elə həşr güni daməni-peyğəmbəri dut.

Öldürür, billəm, məni bu suzi-hicran aqibət,
Qərq edər cismimi bəhrə çeşmi-giryan aqibət.

Bir tərəfdən şanə zəcri, bir tərəf fəryadü ah,
Dağıdub cəm'iyyətim zülfi-pərişan aqibət.

Səngdil kafərdi dildarım, bana rəhm etməyüb,
Eylədi kaşanəmi zülmlə viran aqibət.

Çeşmi-məstin bir müərbid fitnədir, xab eyləməz
Ta cəhanda etməyə nahəqq yüz qan aqibət.

Ol ki, mən' eylərdi eşqindən bəni, gördi səni,
Mən kimi aludə oldı, oldı heyran aqibət.

Sinəmin zəxminə mərhəm qoymadı ol səngdil,
Zəxminin çakinə urdı tirü peykan aqibət.

Saxladum eşqini pünhan sinədə mən, Sağəri,
Faş olundı xəlqə, neylüm, sirri-pünhan aqibət.

Görmədi eşqində bir dəm cismi-suzan aqibət,
Verməyüb aşiqlərə bu beyti-hicran aqibət.

Çeşmeyi-heyvanə lə'lin şərbətindəndir həyat,
Bu qələtdir: xəlqə verməz abi-heyvan aqibət.

Çareyi-dərdim müalic bilmədi etsin əlac,
Cismimin zəxminə verdi zəxmi-peykan aqibət.

Tiri-qəmzəndən məni məhrum qılma, ey gözəl,
Aşiqi-dilxunədir ol tiri-müjgan aqibət.

Çareyi-dərdim vüsali-yardır hicran ara,
Sud qılmaz, bəhrə verməz cismə dərman aqibət.

Naleyi-zarımı gördi eşq odunda yanduqum,
Qəhr edüb aldı əlimdən türfə daman aqibət.

Sağəri çün çeşmi-bimarına meyl etdi, könül,
Görmədi, hərgiz, cəhanda cismlə can, aqibət.

Məhəbbət atəşini günbəgün könlümdə əfzun et,
Könül dürcini, ya Rəbb, eşqi-cananilə məşhun et!

Tənəffür qılma, ey dil, zəcri-peykan nigarımdan,
Könül, bas bağrına peykanını, peykanı məmnun et.

Cigər bir ləxtə qan oldı rəqibin qövlü zəcrindən,
Mənim könlüm kimi, ya Rəbb, rəqibin könlüni xun et!

Ziyad eylə könüldə günbəgün eşqi-rüxün, ya Rəbb,
Bu Leylatəl'ətin şövqini artur, türfə Məcnun et!

Alubdur dəstinə xəncər məni qətl edə bu kafər,
Mübarək əzmdir, ya Rəbb, nigar əzmini meymun et!

Gülüstani-vüsalından məni məhrum edüb düşmən,
Gözüm, qan ağla, hicranda rüxi-zərdimi gülgun et.

Cəfavü cövri çoqdur, Sağəri, bir rəhm yox onda,
Xudavənda, bu kafər halını döndər, digərgun et!

Girüb bağə, nigarım, bülbülə sən arizi-rüxsar et,
Gül bülbül gözinə, gülrüxüm, xar ilə bizar et!

Bana bir ləhzə fürsət vermədi vəslində cananun,
Rəqibi bəstəri-möhnət içində zarü bimar et!

Gedübdür xabi-nazə dilbərim, ey dil, fəğan eylə!
Məni mə'yus qılma, nalə ilə yarı bidar et!

Məhi qıl münfəil, mehri xəcil, çərxi hirasan qıl,
Məhü xurşidi-əflakə, nigarım, ərzi-didar et!

Məni qəm ləşkəri aldı, əcəb dərdü qəmə saldı,
Könül, sakit oturma künci-qəmdə, naləvü zar et!

Günim bir vəz'ilə keçdi ümmidi-vəslilə, ey dil,
Şəbi-zülmati-hicranda, könül, fikri-şəbi-tar et!

Zəmirin sirrini vermə rəqibə, Sağəri, hərgiz,
Qəmi-pünhanını fürsət tapanda yarə izhar et.

Ahi-sərdimdən, ey fələk, həzər et!
Tərk qıl cövri, lütflə nəzər et!

İstəsən duzəxi nədir biləsən,
Beyti-hicranə bir gecə güzər et.

Hali-zarımı, ey səba, gördün,
Necə gördün – nigarıma xəbər et.

Əl götürmə nigar eşqindən,
Sinəni tiri-eşqinə sipər et.

Mərdümi-danə, eşqdə sabit
Olgilən, ta rəqibi dərbədər et.

Gühəri-eşqə olgilən talib,
Eşq iksirdir, özüni zər et.

Qüssədən çün açılmadı könlün,
Sağəri, bu xərabədən səfər et.

Bəhar əyyamı gəldi, ey könül, seyri-gülüstan et,
Nə qədər fürsət etsən, gülşən içrə dadü əfğan et.

Yüzündən al niqabın, afitabın çöhrəsin dutma,
Cəmalın pərtövündən xeyli-üşşaqi hirasan et.

Qəmi-eşqin bir oddur, saxlamaq mümkün degil dildə,
Bana birəhm canan hökm edər: bu sirri nihan et!

Məni divanə qılma, çöhrəni göstərmə əğyarə,
Yüzin mehrinə bu zülfi-pərişanın pərişan et!

Cəhənnəm atəşindən atəşi-hicran əs'əbdür,
Rəqibi-kafəri məhbusi-beyti-suzi-hicran et!

O dami-zülfdən istər könül mürğin xilas etsün,
Bu əzmü cürmdən, ya Rəbb, nigarimi peşiman et!

Bu dari-küfrdə könlüm açılmaz möhnətü qəmdən,
Bu mülki-Şişəni, ya Rəbb, bəla səngilə viran et!

Cəhanı basdı zülmət, Sağəri, zülfi-siyahindən
Nigarım, qoyma zülmətdə məni, çaki-giriban et.

Bülhəvəs olma, könül, dur bir rüxi-zibanı dut,
Qeys tək Məcnun olub, sən damәni-Leylanı dut.

Məst qıl cananımı, hüsnü məlahət artusun,
Saqi, al dəstinə cami-badeyi-səhbanı dut.

Ey əsəs, dutma nigarım damənindən, qıl həzər,
Dutmalu olsan əgər yarım, məni-rüsvanı dut.

Qaməti sərvi-sənubər, çöhrəsi gül – əhli-dil,
Bağban, meyl etmə sərvə, bu güli-rə’nanı dut.

Ey könül, aludə olma şahidi-dünyayə sən,
Cəhd qıl dünyadə eşqi-Həqqi-bihəmtanı dut.

Ömrini sərf eyləmə bir divlə, ömr – əziz,
Sərf qıl, aləmdə barı bir mələksimanı dut.

Təngə gəldün, Sağəri, bu künci-qəmdə bir zəman,
Əzmi-gülzar ilə bir dəm sən rəhi-səhranı dut.

Könül təndən çıxub, oldum fərağət,
Xilas oldum əlindən, Həqqə minnət!

Xəyali-vəsldən, hicran qəmindən,
Qılub fariğ məni ol bimürüvvət.

Bu Leylatəl'ətin eşqində gör kim,
Məni Məcnun edər axır məhəbbət.

Xəzan oldı gülüstanım pozuldı,
Gedüb əyyami-işrət, gəldi möhnət.

Xilas oldum məlamətdən cəhanda,
Qəza verdi bana bir künci-üzlət.

Bu bədbəxt fəqirə olmadı hiç
Nə hicrandə, nə vəslində ləzzət.

Düşübdür Sağəri rənci-xümarə,
O gündən kim, ləbindən içdi şərbət.

Əqlimi-başdan alub vermədi canan fürsət,
Dili-bimarimə ol zülfi-pərişan fürsət.

Yandurub cismimi xakistər edüb nari-fəraq,
Nə deyüm, vermədi bir atəşi-hicran fürsət.

Xirə qıldı gözümi pərtövi-rəxşani-rüxün,
Baxmaqa vermədi ol mehri-dirəxşan fürsət.

Yetişüb mətləbimə kamım alurdum, bişəkk,
Neyləyüm, vermədi bir an nigəhban fürsət.

Nəcəfi məskən edərdüm özümə ta dəmi-mövt,
Versəydi bana gər Xaliqi-Sübhan fürsət.

Gedərəm həsrətlə dari-fənadən əliboş,
Bu cəhan içrə bana vermədi şeytan fürsət.

Görmədi çöhrəsini Sağəri cananəsinin,
Vermədi vəsldə bu dideyi-giryan fürsət.

Cəhanda olmadum candan fərağət,
Bu cismi-zarü nalandan fərağət.

Nə vəslilə könül şad oldı bir dəm,
Nə canım tapdı hicrandan fərağət.

Qaragünlü könül mürğinə olmaz
Şəbi-zülfi-pərişandan fərağət.

Bana dil vermədi təmkin, hərgiz,
Şəbi-hicranda əfğandan fərağət.

Gecə-gündüz tökər əşkin dəmadəm,
Bana yox çeşmi-giryandan fərağət.

Bu sinəmdən saqalmaz hiç yarə,
Tapub sinə o peykandan fərağət.

Nigarım mehribandur, Sağəri, leyk,
Bana yoxdur nigəhbandan fərağət.

Salmışam atəşi-eşqi dili-suzanə əbəs,
Bilmədüm qədrimi mən, qəsd elədüm canə əbəs.

Bilməmiş eşq nədir, suzi-məhəbbət nə imiş,
Qılmışam mən özümi eşqdə divanə əbəs.

Atəşi-eşqdə yanmaqda əgər ləzzət yox,
Yandururmı özüni şəm'də pərvanə əbəs?

Şanəvü bad bana vermədi təmkin bir dəm,
Mürği-dil bağladum ol zülfi-pərişanə əbəs.

Könlümün qönçəsi qan oldı ləbin fikrində,
Çün həvəs eylədüm ol qönçeyi-xəndanə əbəs.

Gəl bu sərvqəddə tovf eylə dolan, ey qumri,
Eyləmə meyl dəxi sərvi-xüramanə əbəs.

Həqqdən döndərüb üz, eyləmədüm bir taət,
Getmişəm bir neçə gün mən rəhi-şeytanə əbəs.

Vəslinə yetmədüm ol mahvəşin, Sağəri, mən,
Ömrümi sərf elədüm mən şəbi-hicranə əbəs.

Qətlimə oldı səbəb bir büti-kafər bais,
Yüzi gül, çeşmi-siyəh, ləbləri şəkkər bais.

Məni öldürdi onun məst gözi, təlx sözi,
Deməsünlər kim, olub qətlimə xəncər bais.

Günimin qarəliqi zülfi-siyahındandır,
Kim dedi: oldı buna çərxi-sitəmgər bais?

Ay alur nurini xurşid rüxündən necə kim,
Gözümün nurınadır bu məhi-ənvər bais.

Rəngi-rüxsari-nigarın Həqq edübdür həmra,
Demə kim, olmuş ona badeyi-əhmər bais.

Xəlq edüb nikü bədi Xaliqi-bimisli-əzəl,
Demə kim, nikə Xuda, ziştədi əxtər bais.

Xəlq olunmazdı bu mövcud vücudi, hərgiz,
Xilqəti-aləm içün oldı peyğəmbər bais.

Badeyi-hübbi-Əlidür bana mətlub, nə ğeyr,
Sağəri, şöhrətinə oldı bu sağər bais.

Mişki-tər gərçi qılur zülfi-pərişanilə bəhs,
Nə səzadır şəb edür şami-qəribanilə bəhs?

Çubi-tər sərvi-sənubər baxub öz qamətinə,
Belə sərgəşdə qılur sərvi-xüramanilə bəhs.

Mehr bir başı kəsik bəndeyi-dərgahındur,
Nə rəvadur edəsən kəlleyi-bicanilə bəhs.

Gül də bu fikrə düşüb, arizinə bəhs etsün,
Çox xətadır, edə bir cism belə canilə bəhs.

Qönçə də bəhs edər qönçeyi-xəndanınla,
Gör, bu bişərm dutar nükteyi-pünhanilə bəhs.

Çeşmeyi-abi-həyatə bu ləbindəndi həyat,
Gör nə heyvandı, edər lə'li-Bədəxşanilə bəhs.

Bahisə bəsdi bu söz, fikrü təəqqül qılsa,
Kim, edər hüsndə kor Yusifi-Kən'anilə bəhs!

Neylüm mən, kimə dərdimi deyüm duzəxdə?
Kim edər suzdə bu atəşi-hicranilə bəhs?

Bana da bəhs edərlər bu məasirlərdən,
Nə rəvadır qılasan, Sağəri, nadanilə bəhs?

Qoydı hükkami-qəza aşiqinin başına tac,
Hökmi-həqqi yetürüb xəlqə, verüb dinə rəvac.

Məğfirət xəl'ətini zinət edübdür ona Həqq,
Mə'siyət zülmətinə olsa olı andan əlac.

Ənbiyavü rüsulü mö'min, kafər türra
Həşrü nəşr içrə olur cümlə bu nurə möhtac.

Qılmadı hiç şikayət Həqqə kafərlərdən,
Hanı məxluq içində belə pakizə məzac?

Ənbiya içrə Məhəmməd hamudan əşrəfdir,
Bəhr idi elmdə, sair ümənalər əmvac.

Əşrəfi-xəlq qılub Xaliqi-Xəllaq səni,
Pəstərin mərtəbədir sən ümmi şahə əmvac.

Mərəzi-mə'siyəti-Sağəri etmiş şiddət,
Dutmuşam damənini sidqlə, sən eylə əlac!

Dərdim elə dərddir, olmaz müalicdən əlac,
Dərd dərdi-eşqdir, yoxdur təbibə ehtiyac.

Badə ilə məst qıl, saqi, bəni ta bilməyim,
Saqiya, dövri-fələkdən inhiraf olmuş məzac.

Almaqa canımı ol şuxim, yəqin, gəlməkdədir,
Üstüxani-cismü canımda tapuldı ixtilac.

Şəm'i-ruyi olmasa, cümlə cəhan zülmat olur,
Yandura əhli-cəhan gər hər tərəf yüz min sirac.

Qətlimə fərman verüb mə'yus qıldı vəsldən,
Çün rəqibi mən səri-kuyində qıldum imtizac.

Sərbüləndi-aləm oldum xəlq içində mən o gün,
Eşq sultanı çü qoydu başıma bir türfə tac.

Vəsldə kasadə düşdi cinsi-ahü naləmiz,
Hicr evində, Sağəri, ahü fəğan oldı rəvac.

Aləmi zülmət dutar zülfin pərişan eyləgəc,
Rəf' olur zülmət rüxi-mehrini rəxşan eyləgəc.

Bağlama cənnət qapusin ruyimə, ey dilrüba,
Açılur könlüm mənim çaki-giriban eyləgəc.

Aşiqi-bülbülsifətlər cəm' olur ətrafına
Qönçeyi-lə'lü ləbini yar xəndan eyləgəc.

Ahü əfğanım çıxar çərxə, dutar mehrü məhi,
Əqrəbi-zülf rüxi-alını pünhan eyləgəc.

Bu yəqindir kim, fələk mehrü məhin pünhan edər
Hər zəman mehri-rüxin yarım dirəxşan eyləgəc.

Bağban sərvü gülə meyl eyləməz, yüz döndərür,
Gülrüxüm, sərvqəddim, əzmi-gülüstan eyləgəc.

Sağəri qılmaz tamaşa çöhreyi-məhvəşlərə,
Can edər təslim yarə, rüx nümayan eyləgəc.

Dil nalə edər şami-qəribanını görgəc,
Divanə olur türreyi-əfşanını görgəc.

Mə'lum olur gənci-rüxün xəlqi-cəhanə
Mari-siyəhü həlqeyi-su'banını görgəc.

Qönçə rüxünün qanı qaçub dutdı yərəqan
Bağ içrə sənin qönçeyi-xəndanını görgəc.

Qumri çəkər əl sərvi-siyəhdən, dəxi getməz
Bu şivə ilə sərvi-xüramanını görgəc.

Əzbəs ki, olub navəki-müjganına fanus,
Dil meyl edər ləşkəri-müjganını görgəc.

Qılmaz məhü mehrini əyan çərx yüzündə
Bipərdə nigarım rüxi-rəxşanını görgəc.

Ölmüşdi könül, Sağəri, hicran ələmindən,
Dil canə gəlüb çeşmeyi-heyvanını görgəc.

Olı divanə könül zülfi-pərişan görgəc,
Cigərim qanə dönər qönçeyi-xəndan görgəc.

Neçə min dil cəm' olub zülfünə fəryad eylər,
Çıqrışur quş, cəm' olur marlə su'ban görgəc.

Çöhrəni görsə gözəllər, dağılur həsrətdən,
Neçə xəffaş qaçar mehri-dirəxşan görgəc.

Məni heyran elədün hüsnünə bu işvə ilə,
Oldı heyran bana aləm məni heyran görgəc.

Eşqini saxlamaqum sinədə müşküldi bana,
Cəm' olur başıma el naleyi-əfğan görgəc.

Göz yaşım xəlq görüb nifrət edüb, yanə qaçub,
Dağılub xəlq qaçar seyli-firavan görgəc.

Badeyi-təlx nədir kim, ona aludə olam,
Sağəri məst olur lə'li-dürəfşan görgəc.

Qılmadı rəhm bana yar fəğanım görgəc,
Rəhm edüb xəlq bana dad-əmanım görgəc.

Qəmzəsi tir dutub, qaşı kəman çəkdi bana,
Bana rəhm eyləməyüb qəddi-kəmanım görgəc.

Çak-çak eyləmə, zalım, həzər et bir Həqqdən,
Yandurarlar səni həşrün güni canım görgəc.

Nə deyüb dilbərə əğyari-cəfakar genə,
Döndərüb yüz məni ol sərvi-rəvanım görgəc?

Seyd tək urma cərahət bana, öldür, zalım,
Ki, taparlar məni hər qanda ki qanım görgəc.

Qəddimi qıldı kəman atəşi-hicran belə,
Yandı əhvalıma kim qaşı kəmanım görgəc.

Çəkdi zənciri-məhəbbət bəni bir aləmə kim,
Sağəri oldı xəcil ruhi-rəvanım görgəc.

Ey könül, cəhd qıl cəhandan keç!
Cahü iclalü xanimandan keç!

Əmn mülki degil bu dari-fəna,
Bu xərabə olan məkandan keç!

Ya bu fani cəhanə uymagilən,
Ya o dünyayi-cavidandan keç!

Laməkan mülkini salub yadə
Cidd ilə bu xakdandan keç!

Olma aludə dari-dünyayə,
Belə məkkarə mehribandan keç!

Aşiq ol Həqqə, türfə aləmdir,
Malü övladü cismü candan keç!

Sağəri qərqi-bəhri-üsyandır,
Ey Xuda, sən bu natəvandan keç!

Şami-zülfündə könül mürğünə yox asar sübh,
Olmadı bu zülmət içrə hiç dili-bidar sübh.

Türreyi-şəbrəngə düşdi çün dili-divanəmiz,
Bilmədüm mən şami-zülf içrə cəhanda var sübh.

Gəh saralur, gəh aqarur, gəh qılur həmra yüzin,
Aşiqi-sadiqdi, mən tək tapdı bir dildar sübh.

Saxladum mən dildə eşqin sirrini, kim bilmədi:
Çak qıldı sinəsin eşqin qılub izhar sübh?

Görməyübdür sinənin səhnini sübhün didəsi,
Səcdə eylər sinənə, gər görsə, yüz min bar sübh.

Sübh kazibdir, mənəm sadiq təriqi-eşqdə,
Gər urub lafi-məhəbbət yaxasın yırtar sübh.

Sağəri, oldı bərabər sübhü şamın eşqdə,
Çöhrəsin göstərmədi, hərgiz, bana kim yar sübh.

Saqiya, al dəstinə bu bəzm ara gülgun qədəh,
Qəmlü könlümdə nəşatı eyləsün əfzun qədəh.

Badəvü meyxanə, saqi, cümlə dərdamiz olub,
Həsrəti-lə’li-nigahdən olubdur xun qədəh.

Aqil ol, ey dil, meyi-vəhdət təcərrö’ qıl müdam
Kim, qılur axır cəhanda mey səni məcnun, qədəh.

Öylə sərməst et məni kim, bilməyüm aləm nədir,
Saldı bir od canıma, saqi, bu atəşgun qədəh.

Ruhü əqlim məhv olub getdi başımdan, qalmadı,
Urdı cismim mülkünə, gör kim, necə şəbxun qədəh.

Çün təbiət müxtəlifdir, meyi-sirab təlxdür,
Arifi xoşhal edüb, cahilləri məhzun qədəh.

Həşrdə bidar olursan xabi-qəflətdən, könül,
Çünki verdi Sağəri dəstinə çərxi-dun qədəh.

Çün olur tiri-qəmindən dilü canım məcruh,
Bu nə hikmətdi, tapar cismim ara qüvvət ruh?

Gözümün yaşı olub bəhr, qılub tufanı
Ki, bu dəryadə olub qərq neçə kəştiyi-Nuh.

Yandurub cismimi hicran odı xakistər edüb,
Neylüm, olmadı cananımıza hiç vüzuh.

Qoymadı göz yaşı rüxsarını dərk edə gözüm,
Çün niqabın götürüb qıldı cəmalın məftuh.

Verdi hicran odı bir tövbə bana vəslindən,
Qılmadı kim bu cəhan içrə belə tövbə-nəsuh?

Ağzının var-yoqın dərk eləmək müşküldür,
Nüktədanlardan onı etmədi bir kəs məşruh.

Sağəri, nəş’eyi-lə’lin nigarın bilə gər,
Künci-meyxanədə almaz ələ bir kimsə səbuh.

Gördilər ruzi-əzəldən çeşmi-giryanım səlah,
Yanmaqa eşq atəşinə cismi-üryanım səlah.

Fəxrdən eyyuqə yetdi fərqimiz, bildüm bu gün,
Lə'li-meygunin görübdür tökməgə qanım səlah.

Çərx qılub fəryadü əfğan, ruhumuz bizar olub,
Çıxmaqa könlüm quşın təndən görüb canım səlah.

Hər cəfavü cövr gəlsə yardan, xoşdur bana,
Hər nə kim görsə rəva canıma cananım – səlah.

Bağladub zənciri-zülfə könlümün divanəsin,
Qeydi-məcnun görüb zülfi-pərişanım səlah.

Vəsldən nomid edüb, saldı nəzərdən aşiqi,
Atəşi-hicranda gördi cismi-suzanım səlah.

Sağəri bir bəndeyi-azadi-mülki-eşqdir,
Qılmaqa azad gördi şahü xaqanım səlah.

Arizi-cananıma candan olub heyran qədəh,
Bais oldur, dolanur məclisdə sərgərdan qədəh.

Şərh qıl bu sirri, ey miri-büsati-rindü şeyda,
Nə səbəbdəndir olur məxmurlər giryan, qədəh?

Xali olmaz dəsti-saqidən neçün bu cami-mey? –
Əhd qılmışdur nigarimlə, yəqin, peyman qədəh.

Zahidi rüsva qılur bu zəhri-marü təlxvəş,
Şərab əhlinə verür hər dəf'ədə min can qədəh.

Qıl həzər, zahid, kənar ol badəvü əqdahdən,
Bu cəhan içrə edüb çox evləri viran qədəh.

Mən nə növ' qılmayum tə'rif cami-badəni?
Gör ki, yarın çöhrəsin qılmış necə əlvan qədəh!

Sağərini mən' edəllər: mədh qılma sağəri,
Mən' edəllər, neyləyüm, hər dəm içər pünhan qədəh.

Qafil oturma, aç gözüni novbaharə bax,
Səhni-çəməndə qüdrəti-Pərvərdgarə bax!

Can verdi, sirr vermədi aşiq rəqibinə,
Sən eşqə bax, məhəbbətə bax, e'tibarə bax!

Allanma  bülhəvəs sözinə, aşiqin tanı,
Baxma gəzaf lafına sən, karü barə bax.

Zülfün kəməndi seyd qılub könlümün quşın,
Saldun çü qeydə, lütf elə, bir dəm şikarə bax.

Öldürmə sən məni, həzər et, ah-nalədən!
Kafər degilsən, ey büt, əgər, kirdgarə bax!

Öz hüsnünə baxub məni divanə eyləmə,
Bu sinəmin içində dili-dağdarə bax!

Yarim yüzünə ənbəri-zülfin niqab edüb,
Ey didə, həsrətlə bu leylü nəharə bax!

Bir vəqt olmadı, deyə dərdi-dilin sana,
Od tutdu yandı Sağəri, bu ruzgarə bax!

Didələrimdən tökülən qanə bax!
Mövc uran lücceyi-ümmanə bax!

Mən kimi Nuh olmadı tufanə qərq,
Baxma o tufanə, bu tufanə bax!

Zahidi-pəjmürdə nə bilsün nədür
Atəşi-eşqi ki, düşüb canə, bax!

Gərçi tökər didələrim əşkü tər,
Sinədə sən atəşi-suzanə bax!

Şanə üzüb zülf telin bilmədi,
Saldı özün şanə əcəb qanə, bax!

Huriyü qılman sözüni söyləmə,
Mülki-məlahətdə bu sultanə bax!

Kəs nəzərün sərvdən, ey bağban,
Aç gözüni sərvi-xüramanə bax!

Sinədə peykanını saxlar könül,
Qanım içən sinədə mehmanə bax!

Məzhəri-Həqq ayineyi-ruyidür,
Ayinədə qüdrəti-Yezdanə bax!

Xali olub sağəri-mey, Sağəri,
Məhv olub, surəti-bicanə bax!

Aç göz, ey arif, nəzər qıl, Xaliqi-Yektayə bax,
Bisütun qılmış müəlləq, günbədi-xəzrayə bax!

Nəqdi-canım sərf edüb, eşqin ticarət qılmışam,
Taciri-eşqim əcəb gül sevdi, kor sevdayə bax!

Gülrüxüm, gəl qılma qəflət aşiqi-nalanidən,
Can verür eşqində, dön bir bülbüli-şeydayə bax.

Bir nəzər sal beyti-hicranıma, dilbər, lütf qıl,
Göz yaşımdan mövc urub tufan edən dəryayə bax.

Kim deyübdür cənnət içrə kafərə yoxdur məqam?
Kafəri-zülfi gəzər ruyində, bir mə'vayə bax!

Sal nəzərdən, bağban, sərvin ki yoxdur işvəsi,
İşvə istərsən əgər, bu qaməti-balayə bax.

Vəslə talib olmadım, hicranə rağib olmuşam,
Aşiqi-sadiq mənəm mə'şuqə, istiğnayə bax!

Ey şəbi-zülmati-hicranıma istehza edən,
Sayə salmış Ayə, bir ol zülfi-ənbərsayə bax!

Taqi-əbrusində səbt etmiş Əzəl ehkamlər,
Eu münəccim, bəxtimə baxmaq tərkin et, ol ayə bax.

Bağban, baxma gülə bağ içrə, qılma iltifat,
Sal nəzər, ey bağban, bir bu güli-rə'nayə bax!

Baxma zahid qövlünə, tərk etmə şürbi-badəni,
Sağəri, çək başına, cami-meyi-səhbayə bax.

Çöhreyi-gülguninə qüdrəti-nəzzarə yox,
Eşq məni öldüdi, dərdimə bir çarə yox.

Oldı könül ləxtə qan, sinədə eylər fəğan,
Kafərə rəhm eylədi, rəhm məni-zarə – yox.

Mən necə cür'ət edüm yarə deyüm dərdimi?
Saldı nəzərdən məni, lütf bu qəmxarə yox!

Saldı ayağdan məni tiği-məhəbbət bu gün,
Lal olubdur dilim, taqəti-göftarə yox.

Dərdi-dilimi kimə söyləyüm, izhar edim?
Tiri-qəmindən sənin bir cigəri yarə yox.

Aldı gözin canımı, tökdi mənim qanımı,
Çeşmi-xümarın kimi fitneyi-xunxarə yox.

Çoxdı qara günnilər dəhr ara, yox dimən,
Mən kimi, ey Sağəri, bircə güni qarə yox.

Gözlərin tək məst, qəmzən kimi bir xunxar yox,
Arizin tək gül, ləbin tək lə'l derlər var – yox!

Ayü Gün oldı üzarın pərtövündən şərsar,
Ayü Gündə nur vardur, bir belə rüxsar yox.

Arizi-məh qaməti sərvi-sənubərdir bana,
Bağban sərvində hərgiz bir belə rəftar yox.

Cinsi-eşqinə xəridar olmuşam ruzi-əzəl,
Yox mənim tək müştəri, eşqinə bir tüccar yox.

Atəşi-eşqi mənim bağrımı büryan eylədi,
Yanmaqum təqrirə gəlməz, qüdrəti-izhar yox.

Qalmışam bu beyti-hicran içrə sərgərdan, nedim?
Bikəsəm, bimunisəm, neylim ki, bir qəmxar yox?

Öylə məst etmiş meyi-lə'li-ləbi-əhmər məni,
Sağəri, hərgiz, dilimdə taqəti-göftar yox.

Olub ay çöhrəsinə zülfi-pərişan küstax,
Kafərə bax kim, alub dəstinə Qur'an küstax.

Bir könül kim, ona nəqş olmuşdı surəti-yar,
Onı səd çak edüb navəki-peykan küstax.

Daneyi-xalına könlüm quşı aludə olub,
Dolanur danə içün mürği-gülüstan küstax.

Vəslə yetsəm, məni qəhr eyləyübən öldürmə,
Gər tökər qanlu yaşın dideyi-giryan küstax.

Gər öpəm xaki-dərin, dutma bana bəhs, rəqib,
Verdi cür'ət bana, qıldı bəni canan küstax.

Məst sallan, nəzər et kuyinə, bax hər tərəfə,
Dolanur, tövf edər gör neçə qurban küstax.

Sağəri ahü fəğanı fələkə etdi üruc
Kim, edübdür məni bu atəşi-hicran küstax.

Çeşmeyi-heyvanın ətrafında urmuş Həqq səvad,
Bəhri-eşqim qıldı tüğyan günbəgün, oldı ziyad.

Ey könül, kam al bu gülzari-cəmalından bu gün,
Qorxuram olsun xəzan, bu hüsnə yoxdur e’timad.

Kami-dil gər olmadı hasil bana, yarım, bu gün,
Tiri-nazü qəmzə ilə eylədi könlümi şad.

Qılma xali könlümi, ya Rəbb, bu suzi-eşqdən,
Günbəgün, saətbəsaət qıl könüldə izdiyad!

Türreyi-şəbrəng içində olmadı təmkin bana –
Bir tərəfdən şanə zəcri, bir tərəfdən əsdi bad.

Şükrlillah arizin dövründə mə’yus olmadı
Könlümün pərvanəsi, yandı oda – tapdı murad.

Tiri-peykanın görüb, şad oldı könlüm, Sağəri,
Munisin bir kəs görəndə xəlq ara olmazmı şad?

Cismim istər, ey gözəl, bu çeşmi-fəttandan mədəd,
Könlüm istər, dilbərim, bu lə'li-xəndandan mədəd.

Natəvanəm, bikəsəm, bimunisəm – qəmxar yox,
Cismi-zarım daim istər suzi-hicrandan mədəd.

Könlüm oldı parə-parə gərdişi-əflakdən,
Rəhm elə, ey gül bana, ver xari-müjgandan mədəd!

Sinəmin zəxmin saqaltmazdı, yəqin, mərhəm bənim,
Olmasaydı gər bana ol tiri-peykandan mədəd!

Çeşmi-səyyadın edərdi seyd könlüm mürğini,
Olmasaydı könlümə zülfi-pərişandan mədəd.

Xəlq ara nəzzarə etmək çöhrənə mümkün degil,
Can verirdüm, qılmasaydı sirri-pünhandan mədəd.

Sağəri bimari-hüsnidir – zəif, natəvan,
Var ümidim kim, qıla dərdimə dərmandan mədəd.

Eşq bir oddur könüldə, şö'lədir – aləmdə fərd,
Həşr olunca eşq odı olmaz könüldə bərdü sərd.

Aşiqin sirri-dilin eylər cəhan əhlinə faş
Əşki-alü ahi-sərdü cismi-lağər, ruyi-zərd.

Səndən ötri dövr edər şamü səhər mehrü qəmər,
Qıl nəzər: nahəqq degil çərxi-fələk, bihudə gərd.

Dərdimi hər kəs bilüb, nifrət edüb qaçdı bana,
Görmədim xəlqin içində kim, ola bir əhli-dərd.

Nazəninim mehriban oldı bana bir vəqtə kim,
Novcəvanlıq atəşini birlik[14] qılmışdı bərd.

Xətt degil dövri-rüxündə, mişkü ənbərdir bana,
Arizi-gülgunə dönmüş zülfi-mişkindən bu gərd.

Həsrətim qaldı könüldə, namurad oldum bu gün,
Sağəri, çün vermədi kamım bu çərxi-lacivərd.

---

[14] Burada "birrlik", yə'ni "mö'minlik" variantı da uyğun gəlir.

Oldı könlüm quşı, gör, guşeyi-hicranə ümid,
Dəliyə bax ki, dutub atəşi-suzanə ümid.

Əsəri-sübh bana yoxdu bu hicran içrə,
Bağladum mən bu gecə çaki-giribanə ümid.

Daneyi-xalına bax, kəs nəzərün zülfindən,
Ki, məbada, olasan zülfi-pərişanə ümid!

Od düşüb canına canım kimi yandı bu gecə,
Şö'leyi-şəm'lə olub gör necə pərvanə ümid!

Daməni-vəsl rəha eylədüm, əldən getdi,
Zülmətü-hicrdə, gör kim, gəlür əfğanə ümid.

Görmədüm çöhrəsini dilbərimin bipərdə,
Oldı mə'yus könül, bağladı dərbanə ümid.

Sağəri eşqdə can verdi yetüb cananə,
Eşqə hər kimsə düşüb, bağlamasın canə ümid.

Çərxi-dun eyləyüb bana bidad,
Qoymadı könlümi ola bir şad.

Vəsldən eylədi məni nomid,
Qıldı hicranə canımı mö’tad.

Məni-nadanə pərvəriş verdi
Mürşidi-eşq, eylədi ustad.

Mən’ qıldı məcazi-eşqindən,
Eşqi-Həqqə qılub məni irşad.

Eşqini qoydı cismü canımda
Çün vücudumi Həqq edüb icad.

Badəvü sadədən həzər eylə,
Yoxdu dəhr içrə belə ümmi-fəsad.

Tələbi-məğfirət bana etsin,
Oxusa şe’rimi bir əhli-savad.

Bu cəhan kimsəyə vəfa qılmaz,
Hanı Şirini-Xosrovü Fərhad?

Məğfirət qıl bəni, Xudavənda,
Bi-Mühəmməd və alih əl-əmcad.[15]

Sağəri eşqi-Heydərə mail
Oldı, səd şükr, tapdı yaxşı murad.

---

[15] Misranın mə’nası: Məhəmmədin və onun şanlı ailə üzvlərinin xatirinə.

Nəhy edərlər eşqdən bu zahidani-xudpəsənd,
Eşqdən əl çəkmərəm, girməz qulağıma bu pənd.

Olmasın kafər mənim tək atəşi-hicran ara,
Sinə dağlu, qanlu, yaşlu, cism  zarü müstəmənd.

Tərki-eşq etmək bana mümkün degil, zatımda var,
Filməsəl, gər tiğilə cismim kəsilsə bənd-bənd.

Hicr odunda yandı canım, iltifat etməz bana,
Ahi-atəşbarım oldı çərxi-gərdunə bülənd.

İxtiyarım qalmadı dəstimdə kim, ta getməyüm,
Boynuma salmış çəkər zülfi-siyahı bir kəmənd.

Zənglərdir xallər bu çöhreyi-gülnardə,
Ya ki dəf'i-çeşm içün bu atəşə səpdün sipənd.

Eşqi-Heydərdir bana mətlub, yoxdur bir qərəz.
Özgə eşqi qılmadum dünyadə mən hərgiz pəsənd.

Dərdi yoxlar anlamazlar, dərdimi, ey Sağəri,
Necə bilsün dərdimi bidərdlər, mən – dərdmənd?

Genə bu fitnə gözin saldı cəhan içrə fəsad,
Mərdümün qanını içməkdə olubdur mö'tad.

Məni ayırdı fələk zülmlə səndən neçə gün,
Sitəmü cövr edüb hiyləni qıldı bünyad.

O qara zülfün içində günimi qarə edüb,
Qanə dönmüş bu könül olmadı bir ləhzə şad.

Həqq özi qıldı əta ruzi əzəldən bana eşq,
Olmadı eşq təriqində bana bir ustad.

Günüm ol zülfi-qara içrə olub qarə mənim,
Şanə bu canə sitəm qıldıvü cövr eylədi bad.

Səndən ayru bu gecə yatmadı göz sübhə kimi,
Çıxdı doqquz fələkə ahü fəğanü fəryad.

Mən demişdüm ki, edəm eşqi-nigarın tərkin,
Günbəgün eşqi-rüxün dildə ziyad oldı, ziyad.

Sağəri yandı fəraq atəşinə şamü səhər,
Neyləyüm, dust bu atəşdə məni qılmadı yad.

Könlümün mürğünədir zülfi-pərişanın məlaz,
Cismi-zarıma olubdur suzi-hicranın məlaz.

Tiri-qəmzən könlümə adət verüb qan olmaqa,
Ruzi-əvvəldən olubdur tiri-müjganın məlaz.

Təşnədir şəhdi-zülali-lə'linə hər qanda var,
Aşiqi-ləbtəşnəyə çahi-zənəxdanın məlaz.

Yox qərarı könlümün oldı fərari xəlqdən,
Könlümə oldı əzəldən tiri-peykanın məlaz.

Kuyi-dil meydani-eşq içrə qalub heyranü mat,
Ol səbəbdəndir, olubdur zülf çovganın məlaz.

Qalmadı meyxanədə bir rind, əhl cəm' olub
Dutdular cümlə sənin bu çeşmi-fəttanın məlaz.

Sağəri məst oldı eşqin badəsindən bu səbəb,
Çün olub aləmlərə ol lə'li-xəndanın məlaz.

Ey bana şəhdi-ləbin qəndi-mükərrərdən ləziz!
Qətreyi-abi-vüsalın hövzi-kövsərdən ləziz.

Bəs ki adət eylədüm hicran odunda yanmaqa,
Atəşi-hicran olubdur qəndü şəkkərdən ləziz.

Kəc nigahın aşiqə, guya ki, bir zəqqumdur,
Lütflən bir xəndəniz hər meyvəvü bərdən ləziz.

Mümkün içrə seyr qıldum, görmədüm ləzzətlü zad,
Tapmadum əsla cəhanda eşqi-Heydərdən ləziz.

Gərçi çox ləzzətlü şeylər görmüşəm aləmdə bən,
Bu cəhanda görmədüm mən qətli-kafərdən ləziz.

Cövrü zülmün zilləti bir ne'məti-əzim bana,
Vəsli-lütfün ləzzətidir şürbi-sağərdən ləziz.

Sağəri, dünyadə çox şey əklü şürbin eylədüm,
Görmədüm əsla birisin lə'li-dilbərdən ləziz.

Əqlimi başdan alan çöhreyi-rüxsarəsidir,
Məni bu dərdə salan qəmzeyi-xunxarəsidir.

Mərəzi-eşqdi dərdim, ona yoxdur dərman,
Qönçeyi-lə'li-ləb dərdi-dilim çarəsidir.

Əşki-alimə baxub məst dimə kim, qandır,
Didələrdən tökülən qanlu cigər parəsidir.

Həbəş əhlidi, düşüb mülki-Xütən içrə qərib,
Danədir mürği-dilə, ya gözümin qarəsidir?

Mehrü məh çərxdə heyran dolanur hər tərəfə,
Mən kimi hər ikisi bir gözəl avarəsidir.

Taqi-mehrabdı peyvəstə qaşın, yoxsa kəman?
Əbri-zülf içrə çıxarmış başın ay parəsidir.

Öldürüb aşiqi mə'şuqə günah etdi, nə qəm,
Ləblərin qoysa onun ağzına, kəffarəsidir.

Sağəri, navəki-eşqi cigərim qan etdi,
Yaxşı olmaz bu cərahət ki, cigər yarəsidir.

Könül, uyma bu dünyayə ki, dünya dari-möhnətdir,
Nəşati-eyşinə baxma, o da axır küdurətdir.

Bu dünya mö'minə zindan olub, kafərlərə cənnət,
Buna aludə olma kim, şəriətdə məzəmmətdir.

Əcəl dövri-sərində dövr edər kim canını alsun,
Bu nə malü cəlalü cah, əmrü hökm, şövkətdir?

Mətai-cinsi-dünyanın xəridün eyləmə, hərgiz,
Ki, sudı yox belə cinsin, əgər olsa, xəsarətdir.

Bu Zali-dəşti-dünyanın ərusini nikah etmə,
Təlaqın vergilən, qurtar özüni, çox məşəqqətdir.

Həya qıl, ey fələk, öz gərdişindən bir utan, bəsdir,
Zəlil etdün məni aləmdə, bilməm nə ədavətdir?

Məni mey tək ayağa saldun, ey çərxi-cəfapişə,
Əlin dut Sağərinin, qoyma xar olsun ki, minnətdir.

Bülbül olana guşeyi-gülzar gərəkdir,
Aşiq olana çöhreyi-rüxsar gərəkdir.

Mə'şuqdə bəsdir ki ola hüsnü məlahət,
Bir azdanışan, qəmzəsi xunxar gərəkdir.

Allanma onun arizi gülgununa, hərgiz,
Mə'şuqdə bir ləhceyi-göftar gərəkdir.

Ey eşq odı, peykanın əritmə, həzər eylə! –
Hicran gecəsində bana qəmxar gərəkdir.

Hicran gecəsi qəflətlən yatma, həzər qıl! –
Vəsl aşiqinin didəsi bidar gərəkdir.

Allanma onun sərv qəddü mah rüxinə! –
Məhbubdə bir şiveyi-rəftar gərəkdir.

Qan ağla, gözüm, eylə mənim camənmi rəngin! –
Aşiq olanun caməsi gülnar gərəkdir.

Çəkmə əlini, Sağəri, mə'şuqdən əsla,
Dünyadəvü üqbadə sana yar gərəkdir.

Müshəfü Kə'bə gül cəmalındur,
Şəhdü şəkkər sənin məqalındur.

Çəhi-zəmzəmdi çeşmeyi-dəhənin,
Həcər ol çöhrə üzrə xalındur.

Sureyi-leyldür qara zülfün,
Ayineyi-şəms çöhri-alındur.

Qabi-qövseyn qaşların taqı,
Məhü mahi-fələk hilalındur.

Dari-dünyadə yoxdı mənzurim,
Fikrü zikrim sənin vüsalındur.

Sübhə tək yatmaram fəraqında,
Məni bidar edən xəyalındur.

Dinü imanımı edən qarət
Nöqteyi-küfr zülfü xalındur.

Sağərini qəfəsdən etmə cüda,
Rəhm qıl kim, şəkərü balındur.

Ta atəşi-eşqin bu dili canə düşübdür,
Bu sirri-xəfi aləmi-imkanə düşübdür.

Zənciri-səri-zülfi-pərişanə nəzər qıl,
Hər bir telinə yüz dili-divanə düşübdür.

Bərbad edüb bad səri-zülfüni, ya ah,
Bu silsiləyə ya güzəri-şanə düşübdür?

Bu danədü, ya xali-siyəhdür rüxin üzrə,
Ya nöqtədü bu səfheyi-Qur'anə düşübdür?

Zəngi bəçədir gülşəni-ruyində dərər gül,
Ya əhli-həbəş çeşmeyi-heyvanə düşübdür?

Könlüm quşı uçdı qəfəsindən, dəxi gəlməz,
Yoxsa ki, gedüb zülfi-pərişanə düşübdür?

Ol qədr gözim ağladı hicran ələmindən,
Biçarə tənim, Sağəri, ümmanə düşübdür.

Bu şe’rü qəzəl bəhanədəndir,
Eşq atəşinə nişanədəndir.

Ahim yeli qıldı zülfə tə’sir,
Nə badi-səba, nə şanədəndir.

Könlüm quşi ahü zar eylər,
Aram ona abü danədəndir.

Şərh etməgə eşqi yox zəbanım,
Məqdur degil, zəbanədəndir.

Eşq etdi məni zəifü xəstə,
Mən kimə deyüm, zəmanədəndir.

Bilsən qəmi-eşqimi deyərsən
Məcnun qəminə: fəsanədəndir.

Ey Sağəri, faş qılma dağın,
Bu dağ ki bir yeganədəndir.

Çöhrən üzrə bana xəm zülfi-pərişan görünür,
Sanasan, küncdə yatmış, bana su'ban görünür.

Vəchi-məhvəşləri Həqq eylədi məzhər özünə,
Baxsa hər kəs o yüzə, Həqq nümayan görünür.

Rəxti-gülgundı əgnində nigarın, bilməm,
Salub od canıma bir atəşi-suzan görünür?

Mən demişdüm ki, çəkən dərdimi hicranda deyüm,
Görmədüm mən özümi qanda ki canan görünür.

Yandurur eşq odı hər aşiqi, xakistər edər,
Gərçi yanmaq o oda aşiqə asan görünür.

Əqrəbi-zülf dutub çöhreyi-mehrü qəməri,
Kim görüb əbrdə bir mahi-dirəxşan görünür?

Nitq olmaz danışam, Sağəri, könlüm titrər,
Hər zəman kim gözümə ol məhi-Kən'an görünür.

Bad əsdimi zülfə, yoxsa pərişani-şanədir?
Ya ahi-dil dəyüb ona, şanə bəhanədir?

Nə zülf alubdu könlümi əldən, nə çöhrəsi,
Könlüm quşunı damə salan bircə danədir.

Məcruh sinə, qanlu kəfən – ruzi-həşrdə
Eşq atəşinə yanmaqa bunlar nişanədir.

Hatəm kimi bu mərdümi-didə səpər sirişk,
Heyrətdə qalmışam, nə tükənməz xəzanədir!

Hicranı səhl sanma ki, asan keçər bana,
Od dutdı, yandı cismlə canım, zəbanədir.

Qıldı rəqib təng bana zindəganlıqı,
Yoxdu nəziri yarımızun, bir yeganədir.

Təhsili-eşq eylə, könül, türfə elmdir,
Elmi-üsulü hikmətü məntiq fəsanədir.

Əhli-vəfa bu dari-fəna içrə görmədüm, –
Xəlqi-cəhanə Sağəridən bircə namədir.

Səd heyf, bilmədüm ki, cəhanda vəfa nədir,
Zülmati-hicr ara, nə bilim mən, səfa nədir?

Zulfü rüxün xəyali məni heyrətə salub,
Bilməm bu dəhr içində: sefid-qara nədir?

Mö'tad olubdu cismi-zəifim cəfasına,
Aludə olmuşam ona, bilməm cəfa nədir?

Eşqin məni salubdu əcəb dərdə, ey gözəl,
Eşqin mərizinə de, təbibim, dəva nədir?

Bülbül əgər degil gülə aşiq, nə nalədir?
Gər onda eşq yoxdu, bu şurü nəva nədir?

Yoxsa salub niqabını yüzdən nigarımız?
Heyrətdə qalmışam ki, bu nur, ziya nədir?

Kəştim qəriqi-bəhri-məhəbbət olub belə,
Bu bəhr içində Sağəriyə naxuda nədir?

Ənbəri-zülfün kimi yoxdur cəhanda mişki-tər,
Qılma əfşan çöhrənə, sən bəd nəzərdən qıl həzər.

Çıxma bipərdə dərü bamə, nigarım, gün kimi,
Eyləmə ruyin əyan xəlqə ki, çoqdur bədnəzər.

Gər ayağına düşüb öpsəm, əlin mən’ eyləmə,
Çöhreyi-zərdilə xurşid hər səhər payin öpər.

Hicr odunda yanmaqa cismdə taqət qalmadı,
Hali-zarımdan, səba, cananıma get ver xəbər.

Nəzr qıldum canımı canana qurban eyləyüm,
Beyti-hicranıma bir gün lütflən qılsa güzər.

Bir zəman fikrü xəyalindən təğafül etməzəm,
Sən neçün oldun mənim hali-dilimdən bixəbər?

Gəl görüm gül çöhrəni, axır nəfəsdir, rəhm qıl,
Sağəri dari-bəqayə, dilbərim, qılmış səfər.

Hər zəman şanə kim ol zülfi-pərişanə dəgər,
Şanənin hər dişi o türrədə min canə dəgər.

Kim dedi zülfə qarabəxt, o xoşbəxtə baxun,
Hər zəman gərdiş edüb, arizi-cananə dəgər.

Kafəri gör ki, necə tapdı hidayət rahin,
Dolanur, tövf qılur, çöhreyi-imanə dəgər.

Abi-heyvan bana bir zəhri-həlahil olmuş,
Ağzının şərbəti min çeşmeyi-heyvanə dəgər.

Lə'lü yaqut nədir lə'linlə bəhs etsün?
Pərtövi-lə'lü ləbin lə'li-Bədəxşanə dəgər.

Ver könül piri-muğan eşqinə, xoş aləmdir,
O qapu itlərinin hər biri xaqanə dəgər.

Qumriya, kəs nəzərün sərvdən, etmə gu-gu,
Yar sərvqəddi bin sərvi-xüramanə dəgər.

Gün demün arizi-cananə, Günə nisbəti yox,
Zərrəcə arizi min mehri-dirəxşanə dəgər.

Piçü tab eylədi tən atəşi-ruyin görcək,
Necə kim şö'leyi-şəm'ə pəri-pərvanə dəgər.

Sağəri məst düşüb eşq meyindən, saqi,
Necə pərvanə pəri atəşi-suzanə dəgər.

Könlüm quşi ki rişteyi-zülfin məkan dutar,
Divanədir, ilan yuvasın aşiyan dutar.

Qanını tökmə tiği-məhəbbətlə aşiqin,
Qanlunı qanda qan tökə, axır ki, qan dutar.

Könlüm quşın nə növ' xilas eyləyüm, deyün,
Müjganı ox çəkər yüzə, qaşı kəman dutar.

Göz yaşı, sinə çakı, qılur xəlqə eşqi faş,
Hərçənd eşq sirrini aşiq nihan dutar.

Qılmış nigarımı Həqq özi sərbüləndi-xəlq,
Hər kimsəni ki Həqq duta, cümlə cəhan dutar.

Seyd oldı dami-eşqü məhəbbətdə könlümüz,
Müjganı ox alub ələ, qaşı kəman dutar.

Əl çəkmə, Sağəri, meyi-safi-ləzizdən,
Yanmaz o əl – həmişə meyi-ərğəvan dutar.

Çöhreyi-gülgunə dutmış zülfü giysulərmidir?
Ya ki mülki-Çin ara sərgəştə hindulərmidir?

Məstdir, məxmur, ya xunxar, ya mərdümpərəst?
Çahi-Babil içrə girmiş sehrü cadulərmidir?

Nəstərəndir, yasəmən, ya laleyi-bağı-behişt?
Mehü mahi-çərxdir, bilməm bu, ya rulərmidir?

Taqdır peyvəstə, ya qövsi-qüzeh, ya mahi-növ?
Qibləvü mehrabdır, ya tiği-əbrulərmidir?

Qönçeyi-lə'linə şəbnəmdir düşüb, ey dilrüba,
Ya ədəm dürci ara şəhvari-lö'lölərmidir?

Nöqteyi-mövhumdur, ya nəqşi-zaid, ya ədəm,
"Ləntərani"dən urar dəm dəmbədəm bulərmidir?

Tari-zülfündə könüllər məskən etmiş, yoxsa kim,
Həbsə düşmüş bir neçə Məcnuni-bədxulərmidir?

Fitnəcu fəttan tirəndazlərdür, ey gözüm,
Ya kəməndi-zülfə pabəst olmuş ahulərmidir?

Badeyi-gülguni-vəhdətdir məni məst eyləmiş.
Sağəri məxmurü məsti-lə'li-məhrulərmidir?

Bilməzəm, aşiqlərə eşq içrə bu qovğa nədir,
Xeyli-üşşaqə cənabından bu istiğna nədir.

Qanlu yaşım səfheyi-rüxsarimi gülgun edüb,
Bəhri-xunə düşmüşəm, bilməm genə, həmra nədir.

Küfri-zülfin səfheyi-imanə salma, qıl həzər,
Kafərə firdövs içində mənzilü mə'va nədir?

Nəş'eyi-lə'lin görənlər meyl qılmaz badəyə,
Zümreyi-üşşaq içində badəvü səhba nədir?

Nuri-rüxsarı dutubdur aləmi, rövşən qılub,
Bu əcəbdir, nur içrə, bilməzəm, beyza nədir.

Mülki-vəhdətdə fəna qıldum vücudim öylə kim,
Özümi dərk etməgə yox qüdrəti-ima nədir?!

Mən nəhəngi-bəhri-eşqəm düşmüşəm girdab ara,
Qalmışam heyran özimə, bilmərəm dərya nədir.

Olmuşam rüsvayi-aləm bən təriqi-eşqdə,
Leyk bən fəhm etməzəm rüsvalıqım, rüsva nədir.

Sağəri aludeyi-şürbi-müdami-eşqdir,
Fərq qılmaz hiç ki, dünyavü mafiha nədir.

Eşq atəşinə yanmaqa pərvanə gərəkdür,
Aşiq olana eşqdə pərva nə gərəkdür?

Biqeyd gərək aşiqi-sadiq bu cəhanda,
Üşşaq olan kimsənə mərdanə gərəkdür.

Könlüm quşuna zülfi-siyahında vətən ver, –
Bağlanmaqa zəncirə bu divanə gərəkdür.

Sən zahidi-xüşkə dəxi uyma, həzər eylə,
Həqq aşiqinə guşeyi-meyxanə gərəkdür.

Can verme, könül, hər yetənə, bülhəvəs olma,
Canını fəda qılmaqa cananə gərəkdür.

Peykanını incitmə, könül, sinədə saxla,
Hörmət eyləmək zeyf ilə mehmanə gərəkdür.

Ey, Sağəri, uyma dəxi zahidlərə, hərgiz,
Abidlərə məscid, bana qəmxanə gərəkdür.

Ey könül, uyma bu dünyayə ki, möhnətxanədir,
Hər kişi kim uysa dünyayə, yəqin, divanədir.

Bir könül kim mehnəti-eşqlə mə'mur olmaya,
Padşahsız mülkdür, viranədir, viranədir.

Aşiqi-vəhdət təmənna eyləməzlər kəsrəti,
Bu cəhan Həqq aşiqinə bil ki, zindanxanədir.

Nəş'eyi-eşqi nə bilsin cahilü divanələr?
Yandıran eşq atəşinə balü pər pərvanədir.

Rindlər baxsun külahimə, nə zahidlər mənim,
Əksəri-əlfazımız zahirdə çün rindanədir.

Tiri-qəmzəndən həzər qılmaz könül, pərvası yox,
Gör təriqi-eşqdə könlim necə mərdanədir!

Xəlqə eylərlər ibadət, Həqqdən qafildilər,
Mən necə qail olum zahidlərə: fərzanədir?

Sağəri vəhdət meyindən məstdir, mə'zur dut,
Küfrimə hökm eyləmə, zahid, demə məstanədir.

Urma, məşşatə, şəbi-zənciri-zülfə şanələr,
Dağılur hər bir telindən min tərəf divanələr.

Eşq sultanı cəhanda xanə tə'mir etməyüb,
Dağıdub bəlkə cəhan içrə bəsi kaşanələr.

Eşq sirrin bilmədi arif, qıla izhar onı,
Gərçi çox yerdə yazılmış bir parə əfsanələr.

Bilmədi dünyadə eşqin sirrini bir xürdəbin,
Var ümidim kim, bu sirri o cəhanda qanələr.

Yar kuyindən bəni mən' etmə, ey hacib, usan,
Cəm' olur, şəm'in ziyainə gəlür pərvanələr.

Faş qılma sirri-eşqi sinədə, pünhan elə,
Sirr vermüb, baş verüb eşq içrə çox mərdanələr.

Sağəri hicrin odına yandı, vəslə yetmədi,
Eşq odına mən kimi, ya Rəbb, onlar yanələr!

Genə Tur üzrə bu gün nuri-təcəlla görünür,
Məhv olub Həzrəti-Musa yədi-beyza görünür.
Bixudəm, badeyi-vəhdətlə belə sərməstəm,
Qətreyi-badeyi-vəhdət bana dərya görünür.
Həqq bana zahir olur ayineyi-ruyində,
O zəman kim, gözümə çöhreyi-ziba görünür.
Yoxdu mə'şuq cəhan içrə Xudadan qeyri,
Vamiqin didəsinə Həqq özi Əzra görünür.
Gör ki Məcnunı, düşüb bərrü biyabanə gəzər,
Surəti-Leylidə Həqqdür, ona Leyla görünür.
Həqq gözilə Həqqə baxsan, Həqq özi zahirdir,
Cümlə mümkündə sana Xaliqi-Yekta görünür.
İqdi-şəbnəmdi düşüb qönçeyi-sirab üzrə,
Bu ədəm dürci ara lö'löi-lala görünür.
Sərv toprağa düşüb səcdə edər qamətinə,
O zəman kim gözünə qaməti-bala görünür.
Əqrəbi-zülf edər tovf qəmər dövründə,
Kafərə cənnət içində bana mə'va görünür.
Kövkəbi-bəxtimə çün baxdı münəccim, güldi,
Dedi: bərgəştədü bəxtin, sənə qovğa görünür!
Sağəri nəzm edən vəqtdə vəhdət sirrin,
"Şe'r əksərtə" bil kim, gözümə "la" görünür.[16]

---

[16] "Misranın mə'nası: Şe'ri çoxaltdın (uzatdın, çox yazdın) [-desələr], bil ki, mənim gözümə elə görünür (mənə elə gəlir) ki, yox, [mən şe'ri çox etmədim].

Səndən həzar qüssə dili-pürmehəndədür,
Hər birinin əlacı o sibi-təri-qəndədür.

Kor olsun ol gözi ki, baxar qeyrü cəhətə,
Şövqim bu ruyü lə'lü ləbi-gülbədəndədür.

Yıxdı evimi xoş hərəkatın mənim, gözəl,
İqrar mücrimə qıl, demə təqsir biləndədür.

Bu müshəfi-üzarına nə növ' baxmayum?
Bax qüdrəti-Xudaya, bu vəchi-həsəndədür.

Görməz əzabi-qəbr o kəs bərzəx içrə kim,
"Nadi Əli"[17] rəqəm olunubdur, kəfəndədir.

Xəlqi-cəhanı qıldı müsəxxər qulam edüb,
Bu hüsnü xülqü surəti-pakizə səndədür.

Rəhm eylə, Sağərini gəl öldürmə biəcəl,
Kafər degil sənin kimi, Allahbəndədür.

---

[17] Əlini çağır.

Aşiq olana çöhreyi-gülnar gərəkdür,
Mə'şuq olana qəmzeyi-xunxar gərəkdür.

Bu ahi-dilimdən həzər etmə, əgər etsəm,
İncit məni, mə'şuqə dilazar gərəkdür.

Mən istəmənəm hurivü qılmani-behişti,
Ancaq bana bir yari-vəfadar gərəkdür.

Fikrimdə, xəyalımda sən, ey dilbəri-məhvəş,
Sənsən bana mənzur, nə əğyar gərəkdür!

İma ilə dərdi-dilimi dərk edüb anla,
Mənzur olan aşiqə huşyar gərəkdür.

Ey eşq odı, könlümi əritmə, həzər eylə,
Hicran gecəsində bana qəmxar gərəkdür.

İncitdi məni naleyi-dil tən qəfəsində,
Bu qanə dönən zülfə giriftar gərəkdür.

Ey Sağəri, fəryadü fəğan eylə dəmadəm,
Atəşkədeyi-eşqə düşən zar gərəkdür.

Ta atəşi-eşqin bu dili-canə düşübdür,
Dil parələnüb hər biri bir yanə düşübdür.

Çin mülkini hindulər alub qarət edübdür,
Ya küfr gəlüb səfheyi-imanə düşübdür?

Könlüm quşı pərvaz edüb künci-qəfəsdən,
Bildüm ki, gedüb zülfi-pərişanə düşübdür.

Bihdanədi, ya danədi mürği-dilə, ya xal,
Marutsifət çahi-zənəxdanə düşübdür.

Nə danədi, nə xali-siyəh dövri-rüxündə,
Göz mərdümidi çöhreyi-cananə düşübdür.

Min dil cəm' olub dami-səri-zülfünə bişəkk,
Yalquz demə kim, bu dili-divanə düşübdür.

Lə'li sözini ağzına alma, həzər eylə!
Hər kəs ki alub ağzına, bil, qanə düşübdür.

Duzəx oduna Sağəri yanmaz, bu yəqindir,
Hicran gecəsi atəşi-suzanə düşübdür.

Camalın pərtövündən xirə olmuş didə giryandır,
Yüzin dərk eyləməkdə vəhm qasir, əql heyrandır.

Təalallah, nə surətdir ki nəqqaşi-əzəl yazmış?
Bu güldür, yasəməndir, yoxsa cənnətdir, gülüstandır?

Məni qorxutma,vaiz, sən, cəhənnəmdən nə qorxum var? –
Bana duzəx, yəqin qıl, atəşi-suzani-hicrandır.

Cəhənnəm odı yandurmaz mənim cismimi, ey nadan,
Buna yanmaq bəsi müşkül, ona yanmaqlıq asandır.

Soruşdum ağzını, oldı cəvabım "ləntərani" dən,
Dedi kim, bilməyüb bu nüktəni, bir sirri-pünhandır.

Xütən mülkin alubdur ləşkəri-zəngi-Həbəş, yoxsa,
Qəmər dövründə seyr eylər qara zülfi-pərişandır?

Bana piri-muğan fətva verübdür eşq, ey naseh,
Məhəbbət atəşinə yanmayanlar namüsəlmandır.

Cəhan əhli dersə Sağəri mə’şuqə maildir,
İnanma onlarun qövlünə, bil kim, kizbü böhtandır.

Yox gülə eşqi bülbülün, eşq odur ki, məndədir,
Güldə bu hüsn hardadır, hüsn odur ki, səndədir.

Zülfi-rüxin kimi degil mişki-Xütən, güli-səmən,
Bir belə lütf, bilmə sən, mişkdə, yasəməndədir!

Var-yoxunda ağzının varımı eylədüm ədəm,
Anlamadum bu sirri mən, bəs bu nə fəmi-xəndədir?

Şanəni urma zülfünə aləmi bərhəm eyləmə,
Bəs ki, olubdı cəm'i-dil, türreyi-pürşikəndədir.

Eyşü nəşatə vermə dil, badəvü sadədən usan,
Aşiqi-Həqq olgilən, zövq belə mehəndədir.

Baxma nəkirü münkərə, Şiri-Xudayə baxgilən,
Yoxdu sana hirasü xovf – eşqi-Əli bədəndədir.

Sağəri, xovf eyləmə qəbirdə hiç kimsədən,
Yox həddi kimsə zəcr edə, "Nadi Əli" kəfəndədir.

Aşiqi-suxtə heyran dolanur,
Nə olubdur belə bican dolanur?

Hansı xoşbəxti qılub qətl bugün,
Dümi-tiğində onun qan dolanur?

Dilbərün şiveyi-rəftarına bax! –
Sanasan sərvi-xüraman dolanur.

Zəngi Çin mülkinə qalib olmuş,
Şövkətü hüsn gedüb, yan dolanur.

Xəncərün zibi-kəmər eylə bu gün,
Dərgəhində neçə qurban dolanur.

Tökəcək qanımı çeşmin bişəkk,
Belə kim qəmzeyi-fəttan dolanur!

Mur əhvalına bax, kibr etmə,
Az çəkər, mülki-Süleyman dolanur.

Ruyinə mehrü qəmər aşiq olub,
Ançun çərxdə heyran dolanur.

Leyliyə qıldı təcəlla özi Həqq,
Qeys onı gördi, biyaban dolanur.

Sağəri badeyi-vəhdət içdi,
Kəsrətə meyl eləməz, yan dolanur.

Bu xali-siyəhdir, ləbi-canana düşübdür,
Ya kim qara qul çöhreyi-heyvanə düşübdür?

Bu gövhəri-dəndandı dürci-dəhən içrə,
Ya qətreyi-şəbnəm güli-xəndanə düşübdür?

Zülfüni edüb ahi-dili-xəlq pərişan,
Yoxsa səri-zülfə güzəri-şanə düşübdür?

Könlüm quşidür zülfi-pərişanda, yoxsa
Zənciri-səri-zülfünə divanə düşübdür?

Bu mərdüməki-didədü, ya əhli-həbəşdür?
Ya xali-siyəh çahi-zənəxdanə düşübdür?

Əzbəs ki urub tiri-müjən sinəmə, ey gül,
Biçarə könül çak olub, qanə düşübdür.

Eşq atəşinə yanmaqı canan bəncə bilməz,
Ey Sağəri, ahin odı imkanə düşübdür.

Gül çöhrəsini açsa, gülüstan nə gərəkdir?
Çak etsə giribanını, bustan nə gərəkdir?

Eşq atəşinə aşiqi-biçarə yanubdur,
Yanmaqa dəxi atəşi-niran nə gərəkdir?

Yar aldı niqabını yüzündən, yerə saldı,
Gögdə dolanan mehri-dirəxşan nə gərəkdir?

İmanə gəlür çöhrənə hər kim nəzər etsə,
Zahid nəzər etməz, ona iman nə gərəkdir?

Həqq talibiyəm, rağibi-vəsli-əhədiyyət,
Həqq aşiqinə çöhreyi-xuban nə gərəkdir?

Firdövsidü rüxsarü ləbi-çeşmeyi-kövsər,
Vaiz, sənin olsun, bana rizvan nə gərəkdir?

Zahid nə bilür eşq nədir, zövqü məhəbbət,
Mən aşiqi-Həqqəm, bana şeytan nə gərəkdir?

At qəmzə oxın canıma, öldür məni qurtar,
Mə'şuqdə, ey Sağəri, peykan nə gərəkdir?

Nə şurü nəvadır ki, gülüstanə düşübdür?
Bülbül gözi, yoxsa, güli-xəndanə düşübdür?

Gün gördi yüzin düşdi-ayağına, saraldı,
Mən kimi o da kuhü biyabanə düşübdür.

Hindu bəçədir mülki-Xütən içrə oturmuş,
Ya xali-siyəhdir, rüxi-cananə düşübdür?

Xoşbəxt qaradır ki, tapub çeşmeyi-heyvan
Bir danə ki, bu çahi-zənəxdanə düşübdür.

Əzbəs ki gözim ağladı sənsiz gecə-gündüz,
Biçarə könül mövceyi-ümmanə düşübdür.

Kim ah çəküb, oldı pərişan səri-zülfün?
Ya badi-səbaya güzəri-şanə düşübdür?

Könlüm quşı bir danə görüb, danədən ötri
Pərvaz edüb zülfi-pərişanə düşübdür.

Dil oldı kəməndi-səri-zülfündə müqəyyəd,
Fəxr eyləmə çox, Sağəri, zindanə düşübdür.

O zülfün riştəsi bərhəm düşübdür,
Xilas olmaz, könül, möhkəm düşübdür.

Qaşının şəklin qəza yazmış hilal,
Anınçün ay fələkdə xəm düşübdür.

Yüzündə xaldır, ya bir qara qul,
Hərimi-hüsnünə məhrəm düşübdür.

Kəməndi-zülfünə çox dil düşübdür,
Bu könlüm tək kəməndə kəm düşübdür.

Bu sinə çakının pərkaləsiçün,
Xədəngi-qəmzəsi mərhəm düşübdür.

Səri-kuyində tovfim-gördilər xəlq,
Birisi bilmədi kim, nəm düşübdür.

Ərəq dövri-rüxində qətrə-qətrə
Durub, guya gülə şəbnəm düşübdür.

Dəhanını nə bilsin xürdəbinlər,
Ədəm tək adı var, mübhəm düşübdür.

Əzəl qıl Sağərini məsti-mədhuş,
Ana çünki cami-Cəm düşübdür.

Zülfün kimi mişknab yoxdur,
Çöhrən kimi afitab yoxdur.

Rəhm eylə məni-əsirə, zalım,
Kafərdə məgər səvab yoxdur?

Vəslin bana gərçi can verübdür,
Hicranına canda tab yoxdur.

Eşq oduna düşdi yandı çoxlar,
Mən kimi olan kəbab yoxdur.

Eşqin məni türfə halə saldı,
Hər gecə gözümdə xab yoxdur.

Sordum ağzın ki var, o yoxdur,
Dedi: – Sana bir cavab – yoxdur!

Yandırmagilən məni, həzər qıl!
Canımda o qədr tab yoxdur.

Hicranda çəkən əzabü zəhmət,
Duzəxdə ona əzab yoxdur.

Çün Sağəri aşiqi-Həqq olmuş,
Həqq aşiqinə hesab yoxdur.

Ey könül, müjdə sana, qətlinə dildar gəlür!
Canını almaqa ol qəmzəsi xunxar gəlür!

Dümi-tiğindən anın qan tökülər, eylə həzər!
Səni öldürməgə cəlladi-sitəmkar gəlür!

Olmadı dərdi-dilimi sana izhar qılum,
Sənlə xəlvət edən vəqtdə əğyar gəlür.

Tiği-xunrizlə çak eylədi cismü tənimi,
Mən dedüm kim, yanıma dilbəri-qəmxar gəlür.

Bilmədüm şişə taxub, oda kəbab etməkçün,
Fəxr edirdüm ki, bu gün yanımıza yar gəlür.

Vəsl ümidilə keçüb gün, bu günüm xoş keçdi,
Çıxacaq nöh fələkə nalə, şəbi-tar gəlür!

Sağəri, çıxdı gözümdən şəbi-hicran suzi,
Riştəsin görməgə çün yari-vəfadar gəlür.

Qaldum cəhanda mən neçə min ruzgarlar,
Üqbadən ötri eyləmədüm karü barlər.

Hicranə adət eylədüm ol qədr, bilmədüm,
Vəslindən ötri eylədügüm – ahü zarlər.

Gər şanə ursa zülfi-pərişanə dilbərim,
Şəkksiz, düşər ayağına yüz min şikarlər.

Xaki-məzarə qoyma qədəm, qəflət etmə sən,
Yatmış bu xaki-tirdə çox gül'üzarlər.

Bir həmdü surə ilə edün şad ruhimi,
Gər qılsanız məzarıma, yaran, güzarlər.

Möhtaci-rəhmətəm, bana bir rəhmət eyləsün,
Gər düşə qəbrimə rəhi-xürdü kibarlər.

Bu piri-asiyə oxusun məğfirət o gün,
Etsə məzarım üzrə güzər bərrü barrlər.

Qəbrim daşında həkk eləsünlər bu misrai:
"Can verdi Sağəri Həqqə, qaldı nigarlər".

Gəl bu gün, badi-səba, halımı ol yarə yetür,
O şəhənşahi-məlahət, rüxi gülnarə yetür.

Xəsteyi-dərdi-fəraq oldı könül mürği bu gün,
Ərzimi eylə, səba, ol büti-dildarə yetür!

Sinəmin yarəsinə mərhəm olub əşki-gözüm,
Sinəmin mərhəmini qəmzeyi-xunxarə yetür.

Məni aşüftə qılub zülfi-siyahi bu gecə,
Ruzgarım gecə tək qarə olub, yarə yetür!

Şəbi-hicranı edüb aləmi zülmət gözümə,
Mənim ərzimi gedüb türreyi-tərrarə yetür.

Ondan ayru gecələr sübhə kimi dad edirəm,
Müxbir et dilbərimi, ol məhi-rüxsarə yetür!

Sağəri yandı fəraq atəşinə, çərx, bu gün
Himmət eylə, məni ol məsti-sitəmkarə yetür!

Bilmirəm, könlüm quşunın qəmküsarı hardadur,
Zülfdür məskən ona, imdi qərarı hardadur?

Bəhri-hicranda belə qərq olmuşam, ey naxuda,
Bilmərəm əsla bu dəryanın kənarı hardadur.

Dedilər dünya bəharı nikdir, gəldüm görüm,
Bu xərab olmuş cəhanın növbəharı hardadur.

Verme dil dünyayə, yoxdur e'tibarı bir kəsə,
Bivəfa gördüm onı mən, e'tibarı hardadur?

Mən eşitdüm kim, olur dünyadə dilrüxlər bəsi,
Xar gördüm cümləsin, bəs gül'üzarı hardadur?

Övrətə vermə könül, övladına fəxr eyləmə,
Sən öləndən sonra bilməzlər məzarı hardadur.

Sağəri, allamma, dünya mülkinə yox e'tibar,
Şami-zülmətdür cəhan, hərgiz, nəharı hardadur?

Hər kişi kim aşiqi-Həqq olsa, ruyi aq olur,
Mehr tək aləmlər içrə şöhreyi-afaq olur.

Müshəfi-ruyinə xətt çıxsa, məlahət arturur,
Mehr tək yarin yüzi aşiqlərə bərraq olur.

Müshəfin tə'rifi andandur səvad, vəchi var,
Olmasa əsla səvadı, bir neçə övraq olur.

Zahidin qövlünə baxma, fe'linə bir qıl nəzər,
Düşmüşəm mən bunlar ilə, əksəri füssaq olur.

Tünd olur məhvəşlər, əmma qəhrinin bir zövqi var,
Qaç kənarə quçdən, gər sahibi-əxlaq olur.

Gəl könül, sən də könül ver, Həqqə aşiq olgilən,
Aşiqi-Həqqin yüzi Həqq darində işraq olur.

Qəmlü könlüm, Sağəri, dünyadə hərgiz gülmədi,
Gər içəm lə'lin şərabından, dimağım çaq olur.

Qılmanə səri-zülfi-pərişanını göstər,
Mehrü qəmərə ruyi-dirəxşanını göstər.

Bu cilveyi-rəftarlə get gülşənə, ey gül,
Sərvə bu qəddi-sərvi-xüramanını göstər.

Qıl lə’lilə yaqutı xəcil lə’li-ləbindən,
Min tə’nə urub lə’li-dürəfşanını göstər.

Et qönçəni diltəng, gülin ilə xəcalət,
Bir xəndə edüb qönçeyi-xəndanını göstər.

Ur tə’nə cəhənnəm oduna qəhrü qəzəblə,
Hər ləhzə ona atəşi-hicranını göstər.

Hər kəs ki qıla Yusif adın zikr yanında,
O biədəbə çahi-zənəxdanını göstər.

Dil nalə qılur sinədə, yoxdur bana rahət,
Rəhm eylə, bana navəki-müjganını göstər!

Fəxr eyləsə gər lə’lilə gövhər öz-özinə,
Lə’li-ləbin aç, gövhəri-dəndanını göstər.

Gər çeşmeyi-heyvan edər izhar həyatın,
Aç lə’li-ləbin, çeşmeyi-heyvanını göstər.

Zülmatə düşüb Sağəri hicran ələmindən,
Lütf eylə, ona çaki-giribanını göstər!

Gərçi ruhim mürği daim, ey gözəl, yanındadır,
Ləzzəti-aşiq həmişə suzi-hicranındadır.

Könlümün mürğinə bir yer olmadı mənzil duta,
Bəs ki dillər cəm' olub, zülfi-pərişanındadır.

Tiri-peykanın kəm etmə sinəmdən, ey dilrüba,
Kim xəyalı könlümün ol tiri-peykanındadır!

Qalmadı dil məndə, tiri-eşq min çak eylədi,
Hər biri min göz olub, ol tiri-müjganındadır.

Vəchinə müshəf desəm, hərgiz xəta olmaz bana,
Sureyi-"Vəl-leyl" zülfi-ənbərəfşanındadır.

Ayeyi-"Vəş-şəms" vəslin zahir etmiş aləmə,
Nur-zülmət cəm' olub, xurşidi-rəxşanındadır.

Lütfi-şe'rim lütfdən saldı kəlamın lütfüni,
Ey Füzuli, lütf salmaq Sağəri şanındadır.

Aşiqə eşq odı əvvəl necə asan görünür,
Vay o gündən ona kim, atəşi-hicran görünür!

Necə kim aşiqü mə'şuq vücudi birdir,
Vəslü hicranı nigarın bana yeksan görünür.

Sinəmi çak eyləmə tiği-qəminlə, kafər,
Eşqini faş qılur, navəki-peykan görünür.

Şanənün zəcri düşər xatirimə, badi-səba,
Hər zəman kim gözümə zülfi-pərişan görünür.

Şərhi-əhval nigarimə bəsi müşküldür,
Anlamaz aşiq özin orda ki canan görünür.

Saralur beh kimi ruyim həvəsimdən o zəman
Mərdümi-didəmə çün sibi-zənəxdan görünür.

Görmədüm, Sağəri, mən çöhreyi-mehrin əsla,
Şəbpərə didəsinə mehri-dirəxşan görünür?

Hər zəman kim çöhrənə zülfin düşər, əfşan olur,
Gecəvü gündüz, nigarım, aşiqə yeksan olur.

Urma şanə zülfünə, məşşatə, yarın, qıl həzər!
Gər qırılsa bir teli, aləmdə yüz min qan olur!

Öz vücudini görən görməz rüxi-cananəsin,
Bir kişi kim keçsə candan, vasili-canan olur.

Əklü şürbi-aşiqin xuni-cigərdəndir müdam,
Eşq oduna yanmayanlar bilmə kim, insan olur.

Vəh nə surətdir ki, hər kim baxsa ruyi-pakinə,
Surəti-bican kimi rüxsarına heyran olur?

Dilbərim getsə gözümdən, can çıxar təndən gedər,
Ruh təndən çıxmaq hərgiz demə kim asan olur.

Sağəri, dut damənin şiri-Xudanın sidqlə,
Dutmayanlar damənin məhşərdə sərgərdan olur.

Səf çəküb, canı əlində dolanur heyranlar,
Qoy dolansun başına aşiqi-sərgərdanlar.

Gər ata qəmzə oxın sinəmə, tə’sir etməz,
Yoxdu bir yer bu könül içrə, dolub peykanlar.

Ey könül, meyl eləmə qəmzə oxundan, həzər et! –
Bu cəhan içrə töküb qəmzəsi yüz min qanlar.

Urma ol zülfi-pərişanına şanə, kafər,
Dəgsə gər şanə dişi, çərxə çıxar əfğanlar.

Firqeyi-zahidi mən’ eyləmə, bilməz nədir eşq,
Zövqi-eşqi nə bilür taifeyi-heyvanlar?

Sən də, ey xam, gəlüb lafi-məhəbbət urma!
Nə bilür eşq nədir sən kimi min kövdanlar?

Sağəri, mətləbə yetmək sana asan oldı,
Səf çəküb qətlinə gör kim o neçə müjganlar!

Rəsmdir xublar rüxündə zülfi-ənbərbar olur,
Gənc olan yerdə, bu adətdir, həmişə mar olur.

Tiri-peykanın çıxardı sinədən cərrahlər,
Qalmışam bu fikrə, ya Rəbb, kim bana qəmxar olur?

Qəddini təşbih edənlər sərvə olmazmı xəcil?
Sərvdə bir qəddi-mövzun var – bu rəftar olur?

Yoxdu aram aşiqə bir yerdə ta dutsun məqam,
Aşiqə aram olur – hər məhfil içrə yar olur.

Dişləsəm lə'li-ləbindən, sən məni mə'zur dut,
Qəhr qılma aşiqə, mə'şuq xoşrəftar olur.

Ey könül, gəl qılma nalə atəşi-hicran ara,
Dilbərim yatmış, məbada xabidən bidar olur!

Badeyi-lə'li-ləbindən Sağəri məxmur olub,
Vəh nə meydir, şərbəti-lə'lin içən hüşyar olur?

Vəh nə surətdir, nə dilbər kim, məlahət kanıdır!
Aşiqi-dilxəstənin gül çöhrəsi dərmanıdır.

Əhli-iman mən’ edər aşiqləri kim, bilməyüb –
Nuri-ruyi məhvəşin aşiqlərin imanıdır.

Vəsli-mə’şuq aşiqə firdövsidən bir vəchi var:
Atəşi-duzəxdən artux atəşi-hicranıdır.

Dəstinə yaxmış hənanı dilbərim, etmiş xizab,
Yoxsa aşiq öldürüb, dəstində aşiq qanıdır?

Zəxmi-sinəm gər saqalmaz zəxmdən, bir vəchi var:
Sinəmin zəxminə bais zülfi-mişkəfşanıdır.

Yatma, qafil, gecələr, bir xabi-qəflətdən oyan! –
Vəlvələ salmış cəhanə aşiqin əfğanıdır.

İki məhtəl’ət gəlür, ey Sağəri, min nazlən,
Bu mənim canımdı, bilməm o kimin cananıdır.

Vəh nə qamətdi, qiyamət, nə əcəb xoş rəftar!
Vəh nə təl’ətdi, nə surət, nə gözəl işvəsi var!

Qəmzəsi qəsd edər canıma kim, öldürsün,
Neyləyim, mane olur qətlimə, qoymaz əğyar.

Ey könül, navəki-peykanın əritmə, həzər et
Kim, tapulmaz sana hicran gecəsi bir qəmxar.

Fələkün var bənimlə qərəzi, mən bilürəm, –
Qoymadı hərgiz ola dideyi-bəxtim bidar.

Ey təbibi-dili-bimar, nəzər qıl bana sən,
Eyləyübdür məni, gör, eşq necə zarü nizar!

Daməni-gül əlimə düşdi gülüstan içrə,
Bağban qoymadı kami-dil alam bir miqdar.

Can verüb eşq təriqində əgər tapmadı kam,
Salmadı Sağəri dəstinə fələk daməni-yar.

Könül, uyma bu dünyayə ki, dari-mehnəti-qəmdir,
Güzər qıl axirət mülkinə, ey dil, gör nə aləmdir!

Vüsalın şərhini qılmaq bana mümkün degil, əmma
Fəraqın atəşi aşiqlərə çün ruhi-ə'zəmdir.

Müalic, sud qılmaz mərhəmin dil çakına, hərgiz,
Nigarın tirü peykani könül zəxminə mərhəmdir.

Fəğanü nalə sud etməz, könül, bəsdir, fəğan etmə,
Əlaci-atəşi-hicran şəriki-çeşmi-pürnəmdir.

Dəgübdür şanə, yoxsa bad edüb əfşan səri-zülfin?
Könül ahi əsər qılmış ona kim, belə dərhəmdir?

Buxari-atəşi-rüxsardır tabi-hərarətdən,
Əreqdir ar sənəmdə, yoxsa gül ruyində şəbnəmdir?

Gedüb Məcnunü Leyli rehlət etdi dari-üqbayə,
Mənəm Məcnunə varis, Sağəri eşqə müsəlləmdir.

Könlüm quşuna zülfi-siyəh aşiyanədir,
Mənzurimiz o zülfdi, nə abü danədir.

Məcruh cismü qanlu kəfən ruyi-zərdimiz,
Eşq atəşinə hər biri rövşən nişanədir.

Dutmaz dilim ki, şərh qılum hicr atəşin,
Mümkün degil ki, ağza alam, bir zəbanədir.

Mə'şuq qəhr qəmzəsini qılsa aşiqə,
Aşiq başına hər biri bir taziyanədir.

Gəh qəhrü gah nazü gəhi tə'nə urmaqı –
Öldürməgə bəni hamu bunlar bəhanədir.

Badü sabahü ah məni zəcr qılmadı,
Canım alan o zülfi-siyəh içrə danədir.

Hərçənd yazmışam neçə fərdi-arifanədən,
Çox yerdə Sağəri qəzəli aşiqanədir.

Hər zəman kim sərv qəddi cilveyi-rəftar edər,
Aşiqə ruzi-qiyamət qaməti izhar edər.

Heyf bu rəsmi-köhəndən, olmayaydı çərxdə! –
Zalıma izzət verür, məzlumi, gör kim, xar edər.

Nalə eylərdüm ki, bəlkə yarımı bidar edəm,
Bəxtə bax, fəryadımız əğyarımı bidar edər!

Sinəmin çakın görüb qılmun məlamət siz məni,
Mən özüm çak etmədüm, ol qəmzəvü xar edər.

Arizin tək, gül, gülüstan içrə gül açulmış,
Görsə gər rüxsarını, gül, gül özi iqrar edər.

Gül olur xəndan gülüstan içrə bülbül ruyinə,
Bülbüli-biçarəyə hər zülm edər kim, xar edər.

Hər zəman kim baxsa çeşmim nərgisi-şəhlasına,
Çeşmi-bimarı kimin canü dilim bimar edər.

Mən kimi gər, Sağəri, zahid baxa rüxsarına,
Zahidi gül çöhrəsinə aşiqi-didar edər.

Duzəxim bu cəhanda hicrandır,
Cənnətim ruyi-xubi-canandır.
        Qəddi tubavü lə'li kövsərdir,
        Hərəkatü rəvişdə qılmandır.
Sana insan deyən degil insan,
Əcəb heyvandı kim, der insandır.
        Bütpərəslik mənim şüarımdır,
        Deməsünlər bana – müsəlmandır.
Vəsldən ötri firqətində bu gün
Sinəmiz çak, didə giryandır.
        Aşiqi eşq odunda yandırma,
        O da insandı, sən kimi candır.
Sənsiz, ey dilsitan, gülüstanda,
Çöhreyi-gül gözümə peykandır.
        Bu gecə səndən ayru aşiqi-zar
        Şəm' tək məhfil içrə suzandır.
Atəşi-eşq yandırub cismim,
Dil kəbab oldı, cism büryandır.
        Firqətin gör məni nə halə salub,
        Görsə hər kəs deyər ki, bu candır?
Damənim qanlu yaşilən doldı,
Gəl gör, ey gül, necə gülüstandır!
        Xidmətim dərgəhində itlərinə,
        Xəlqə pünhan, sana nümayandır.
Sağəri halını soruşsan əgər,
Künci-möhnətdə zarü nalandır.

Səri-zülfün kimi eşqində könlüm bərqərar olmaz,
Necə aram dutsun şanə, zəcrindən qərar olmaz?

Şəbistani-səri-zülfündə könlüm görmədi bir gün,
Belə zülmatidə hərgiz mənim leylim nəhar olmaz.

Mənim göz yaşımı mən’ etməyün, eşqə giriftarəm,
Səhabə dəgməsə ta bərq, əsla əşkbar olmaz.

Çəkər zülfi-kəməndi, bir əsirəm, ixtiyarım yox,
Məni mən’ etməyün, aşiq əlində ixtiyar olmaz.

Yaxub aşiqlərin qanını dəstinə, edüb əlvan,
Əcəb birəhm kafərdir ki, hərgiz, şərmsar olmaz!

Çıxanda xətt yüzə bil kim, məlahət izdiyad eylər,
Xəzan ta olmaya gülşəni-cəhanda, növbahar olmaz.

Əzəl eşqində seyr eylə ki, yox hicran qəmi, hərgiz,
Məcaz eşqinə uyma, şahidində e’tibar olmaz.

Füzuli lə’lini, ey Sağəri, lə’lə edüb təşbih,
Bədəxşan lə’li lə’li tək, yəqindir, abdar olmaz.

Əsla bu məlahət rüxi-cananda qalmaz,
Hərgiz ki, təravət bu gülüstanda qalmaz.

Bu qamətini çərxi-fələk döndəri yayə,
Cilvə dəxi bu sərvi-xüramanda qalmaz.

Xətt ləşkəri az qaldı bu rüxsarını alsun,
Çəkməz o qədər, eşq odı bu canda qalmaz.

Aşiqlərün, ey büt, dağılur hər biri bir yan,
Dil mürği dəxi zülfi-pərişanda qalmaz.

Ver ağzıma lə'li-ləbini qılma təğafül,
Bu şəhdü şəkər çün ləbi-xəndanda qalmaz.

Ruyin mehini xətt dutar ay kimi, əsla
Bir zöv' dəxi bu məhi-tabanda qalmaz.

Uyma dəxi sən, Sağəri, dünyayə, həzər qıl! –
Aqil kişilər xaneyi-viranda qalmaz.

Yandurur cismü tənimi atəşi-əfğan hənuz,
Bir müalic qılmuyubdur dərdimə dərman hənuz.

Gərçi vəslinə yetişdüm, kami-dil hasil olub,
Çıxmuyubdur xatirimdən atəşi-hicran hənuz.

Ruh tək getdi tənimdən, cismimiz biruhdur,
Gəlməyübdür, intizarəm, ruh cismə, can, hənuz.

Şərbəti-tiğinə könlüm təşnədir, yetməz ona,
Vermədi cəllad çeşmi qətlimə fərman hənuz.

Mehr də bir mehri-ruyin eşqinə düşmüş məgər,
Gecə-gündüz dolanur ərş içrə sərgərdan hənuz?

Surəti-təhqiqi-halim qıldı eldən məhvəşim,
Aşiqindən bədgümandır dilbəri-canan hənuz.

Paybənd oldı kəməndi-zülfünə çün Sağəri,
Küfrdə baqi qalubdur, tapmayub iman hənuz.

Götür yüzdən niqabın, mehrü mah üzrə niqab olmaz,
Əgərçi lütfdə hərgiz yüzin tək afitab olmaz.

Cəhənnəm atəşindən sən məni qorxudma, ey vaiz,
Yanar duzəxdə kafər, mö'minə, hərgiz, əzab olmaz.

O ev kim zülmlə abad olubdur, tez olur viran,
Bir ev kim ədlilə abad ola, hərgiz, xərab olmaz.

Alubdur ixtiyarım çeşmi-məstü ruyi-gülnarı,
Dəxi bundan belə cismimdə tabü gözdə xab olmaz.

Təriqi-fəqrə düşmək səltənətdir arifə, billah,
Bu şahə mülki-fikrində dəxi bir iztirab olmaz.

Yetişdi başə ömrüm, yetmədüm mən vəslinə, hərgiz,
Şəbi-hicran canana, nedim, axərməab olmaz.

Düşübdür Sağəri zülmati-hicranə, qalub heyran,
Nedim vəsli-nigarımdan bana bir mahtab olmaz.

Bir nəzər halimizə ol məhi-Kən’an etməz,
Qəmzəsi lütf qılub qəsdi-dilü can etməz.

Mərəzi-eşq alub canımı, ümmidim yox,
Çeşmi-bimar mənim dərdimə dərman etməz.

Gülşəni-ruyini hər kimsə görə, ey gülrux,
Hüsnünə aşiq olur, meyli-gülüstan etməz.

Qönçeyi-lə’li-ləbin görsə əgər badi-səba,
Gülüstan içrə dəxi qönçəni xəndan etməz.

Gər üzarın mehini görsə fələk, ömründə
Məhü xurşidi fələk bir də dirəxşan etməz.

O ki əğyar məni zəcr qılur eşqində,
Cismi-zarıma mənim atəşi-hicran etməz.

Məni öldürdü bu qəm: eşq təriqində neçün
Sağəri çöhrəsinə çaki-giriban etməz?

Qıldı bu çərx şə’bədə ağaz,
Bana ənduhü qüssəni dəmsaz.

Aşiqi-Həqq olgilən, ey dil,
Bu təriq içrə yox nəşibü fəraz.

Gülşəni-vəhdətə könül mürği
Qəfəsi-təndən eylədi pərvaz.

Tapmadum mən həqiqi, hərgiz,
Məni məhrum qıldı eşqi-məcaz.

Dari-dünyadə görmədüm bir gün,
Zaye’ oldı əbəs bu ömri-diraz.

Rəhm qıl bəndənə, Xudavənda,
Qoydı topraqi-qəbrə ruyi-niyaz.

Sağəri, Həqqə qıl təvəccöhini,
Həqq səni xəlqdən qılur mümtaz.

Təəmmül atəşi-suzani-hicran eyləmək olmaz!
Rəqibin tə'nəsindən ahü əfğan eyləmək olmaz!

Təbiba, zəhməti-bica çəkirsən, əl götür məndən,
Mərizi-eşqə müşküldür ki, dərman eyləmək olmaz.

Məhəbbət aşikar eylər özin hər dildə kim olsa,
Yanar oddur könüldə, hiç pünhan eyləmək olmaz.

Alub canımı hicran az qalubdur can çıxa təndən,
Bu hali-zarımı izhari-canan eyləmək olmaz.

Könül mürği dutubdur küfri-zülfin riştəsin məskən,
Düşüb küfrə olub kafər, müsəlman eyləmək olmaz.

Məni səndən cüda qılmaq degil mümkün zəhi, nadan,
Bu əmri, müşkili fikr ilə asan eyləmək olmaz.

Alubdur, Sağəri, canımı hicran, yox ona tədbir,
Bu abi-şuri-çeşmi abi-heyvan eyləmək olmaz.

Gəlmədi, bilməm, neçün ol sərvi-xoşrəftarımız?
Ərşə çıxdı firqətində ahi-atəşbarımız.

İntizarım aşdı həddin, təndə taqət qalmadı,
Harda qaldı, gəlmədi məhbubi-məhrüxsarımız?

Vəsl fikrində rəhi-eşqində rahət görmədüm,
Yatmadı hicran evində dideyi-bidarımız.

Və'də vermişdi ki, gəlləm bir gecə mehman sana,
Ömrümüz başə yetişdi, gəlmədi dildarımız.

Gör, xəzani-bimürüvvət vermədi, hərgiz, aman,
Gülüstan oldı xəzan, pamal olub gülzarımız.

Qüdrətim yox – gülüstan seyrinə uçmaq istərəm,
Quş kimi məhbus edüb künci-qəfəsdə yarımız.

Sağəri, az qıl şikayət dilbəri-birəhmdən,
Cövri xoşdur rəhmdən, gər qılsa xoşgövtarımız.

Olmadı bir iltifat ol çeşmi-fəttandan hənuz,
Qılmadum qət'i-nəzər ol tiri-müjgandan hənuz.

Zülməti-zülfi məni zülmətdə sərgərdan qılub,
İçmədüm bir qətrə su ol abi-heyvandan hənuz.

Canımı qıldum ədəm, dərk etmədüm ağzın nədir,
Olmadım agah mən bu sirri-pünhandan hənuz.

Gər xəzan yetdi gülüstanə, xəzan etdi güli,
Kəsdim, hərgiz, nəzər suyi-gülüstandan hənuz.

Qalmadı bir yer könüldə tirü peykan olmasın,
Olmadı sirab dil ol tirü peykandan hənuz.

Can verüb canənə tapdum dövləti-vəslin əgər,
Var şikayət cismü təndə suzi-hicrandan hənuz.

Sağəri, dutdı əcəl dəsti giribanım mənim,
Tapmamış kami-dilim mən vəsli-canandan hənuz.

Çərxə netdim mən ki, hərgiz könlümi şad eyləməz?
Qəm alur can mülkini hər ləhzə, imdad eyləməz?

Ta pərişan türrədə könlüm quşı dutdı vətən,
Düşməni-canım olub, hərgiz, məni yad eyləməz.

Dil əlindən zari-cismimdə fərağət qalmıyub,
Xəstə canım öldürüb bir dəf'ə azad eyləməz.

Atəşi-hicran ara aşiq qılur fəryadü ah,
Yetsə mə'şuqinə aşiq, hiç fəryad eyləməz.

Cövri-mə'şuq aşiqə bir ləzzəti-ruhanidir,
Aşiqin fəryadı andandır ki, bidad eyləməz.

Nalə andandır – qılub azad könlüm mürğini,
Gər ola künci-qəfəsdə, nalə bünyad eyləməz.

Vəsl ümidi yoxdu bəndə atəşi-hicran ara,
Gər ola vəslə ümidi, Sağəri dad eyləməz.

Görmədüm hərgiz nigarımı ola əğyarsız,
Kim görübdür gülüstan içrə gül olsun xarsız?

Aşiqə mə’şuqə azarı verür can dəmbədəm,
Aşiqə mə’şuq, ya Rəbb, olmasın azarsız!

Atəşi-hicranda yandum, qalmadı, cismimdə tab,
Qalmışam hicran evində bikəsü qəmxarsız.

Bu könül mürği məni qıldı pərişan zülf tək,
Yoxdu rahət könlümə ol zülfi-ənbərbarsız.

Bir könül kim anda eşq dərdi cagir olmaya,
Bir dirəxti-şumdur bağ içrə bitmiş, barsız.

Mən’ etmün aşiqi gər ahü fəryad eyləsə,
Eşqdə aşiq olurmı ahi-atəşbarsız?

Ey fələk, insaf qıl, bəsdir, usan bir zülmdən,
Sağəri biçarədir, sən qoyma qalsın yarsız.

Can degil, insan degil hər kim ki canan istəməz,
Bir aqacdır bisəmər hər kim ki bir can istəməz.

Bir nəzər hər kim görübdür gülüstani-arizin,
Arizin fikrü xəyaliylə gülüstan istəməz.

Eşq dərdi aşiqə bir ləzzəti-ruhanidir,
Aşiqi-sadiq olan dərdinə dərman istəməz.

Qanlu yaşım faş qıldı eşqimi aləmlərə,
Hiç aşiq eşqini xəlqə nümayan istəməz.

Gər görə rəftari-qəddin bağban, ey sərvqədd,
Sərvə meyl etməz dəxi, bir sərvi-bustan istəməz.

Xubrulər çöhrə pünhan eyləməzlər xəlqdən
Necə kim, gül ətrini gülşəndə pünhan istəməz.

Sağərinin dinü imanı rüxi-cananədir,
Zahidani-xüşklər tək dinü iman istəməz.

Eşqdə qılmadum ziyan, hərgiz,
Etmədüm nalə, fəğan, hərgiz.

Qoymadı ruyini görəm bir dəm,
Vermədi qatilim aman, hərgiz.

Getdi əldən cəvanlıqım, səd heyf,
Olmadı yar mehriban, hərgiz.

Yox dilim yarə ərzi-hal qılum,
Olmasın kimsə bizəban, hərgiz.

Zülfi-pürçini saldı çöhrəsinə,
Etmədi ruyini əyan, hərgiz.

Atəşi-hicr, piçü tabi-fəraq,
Qoymadı məndə cismü can, hərgiz.

Sağəri çöhrənə olub aşiq,
Eyləməz meyli-gülüstan, hərgiz.

Bilmirəm qanda qalubdur gəlmədi cananəmiz?
Nişə səbr etsün fəraqında dili-divanəmiz?

Səndən idi eyşi-cəşnim, sənsiz ömrüm olmasun!
Beyti-hüzn olmuş əcəb, gəl görgilən, kaşanəmiz.

Fərqi-fəxrim çıxdı çərxə şövqdən çün, anladum,
Qətlimə fərman verübdür dilbəri-məstanəmiz.

Vəsl qədrin bilmədün, küfrani-ne'mət eylədün,
Gör necə od dutdı yandı hicr odunda  xanəmiz!

Tirü peykanü xədəngü navək könlümdədir,
Gör necə mə'mur olubdur xaneyi-viranəmiz!

Çün könül mürğini saldun dami-zülfə, ey gözəl,
Xatirindən çıxmasun dam içrə abü danəmiz.

Balü pər yandırmağa şəm'i-cəmalın dövrünə
Dolanur girdi-sərinə, Sağəri, pərvanəmiz.

Təng edübdür kəsrəti-peykan bana rahi-nəfəs,
Yox bana hicran evində, neyləyim, fəryadrəs.

Xətt degil dövri-ləbində səf çəkübdür hər tərəf –
Cəm' olubdur təng şəkkər dövrünə murü məgəs.

Eşq bazarında sərf oldı mətai-ömrümüz,
Bir tərəf zəcri-rəqiban, bir tərəf qeydi-əsəs.

Öylə mə'nusəm qəfəs qeydinə, fəryad etmənəm,
Xoş gəlür gülzar seyrindən bana künci-qəfəs.

Zad bumimdə qəribəm, bikəsəm, biçareəm,
İltifat etməz bana əhli-vətəndən hiç kəs.

Qılma tə'lim elmi-eşqi zahidə, ey piri-məst,
Zəhməti-bica çəkirsən, gül götürməz xarü xəs.

Sağəriyə badeyi-lə'lin belə vermiş firib,
Zəncəbilü Səlsəbilü Kövsərə qılmaz həvəs.

O zəman kim elədim çöhreyi-cananə həvəs,
Rəhi-eşqində onun eyləmədüm canə həvəs.

Görə pərvanə əgər şö'leyi-şəm'i-rüxüni,
Şö'leyi-şəm'ə edərmi dəxi pərvanə həvəs?

Vəsldən ötri keçüb aşiqi-sadiq candan,
Kim edübdür mən edim atəşi-hicranə həvəs?

Nuri-imanı edüb tərk, düşüb zülmət ara,
Qıldı könlüm quşı ol zülfi-pərişanə həvəs.

Bülbüli-zar giriftari-güli-xəndandır,
Gər görə çöhrəni, etməz güli-xəndanə həvəs.

Daneyi-xaldı bu arizi-gəndümgundə,
Yoxsa hindudı edüb atəşi-suzanə həvəs?

Bağban görsə bu rəftarlə sərvi-qədini
Ki, dəxi eyləməz ol sərvi-xüramanə həvəs.

Faş olub, Sağəri, eşqim qəmi afaq içrə,
Danışur xəlq: edüb bir məhi-Kən'anə həvəs.

Olmadı yar bana yar, əfsus!
Qoymadı yar ola – əğyar, əfsus!

Bülbülə künci-qəfəs oldı vətən
Ki, dutub daməni-gül xar, əfsus!

Bilmədüm qədri-vüsalin, hərgiz,
Getdi ol yari-vəfadar, əfsus!

Gecələr: "Ya Rəbb! Ya Rəbb!"imdən,
Olmadı yar xəbərdar, əfsus!

Ömrümi zaye' edüb aləmdə,
Olmadım aşiqi-didar, əfsus!

Məni öldürdi bu həsrət ki, neçün
Mənilə etmədi göftar, əfsus?!

Dərdü qəm oldı bana ərzani,
Olmadı, Sağəri, qəmxar, əfsus!

Könlümün mürğünə ol zülfi-pərişandır qəfəs,
Mürği-dəstamuzə bir türfə gülüstandır qəfəs.

Lütf edüb, səyyad, məhbusü əsirə qıl nəzər,
Qılmadı azad canım, aldı məndən can qəfəs.

Şəhpərim sındı qəfəs çubinə urmaqdan, nedim,
Gəl gör, ey səyyad, qanımdan nə əlvandır qəfəs!

Ol qədər balü pər urdum bu qəfəs küncündə mən,
Qalmadı bir yer qəfəsdə, cümləgi qandur qəfəs.

Gəl məni azad qıl künci-qəfəsdən, bağban,
Olmuşam diltəng, rəhm et, demə asandır qəfəs.

Sakit olma, ey könül, fəryadü əfğan etgilən,
Həbsə düşdün nalələr qıl, künci-əfğandır qəfəs.

Gülüstan oldı xəzan, kam almadum gülzardən,
Eyləyübdür Sağərini gör necə nalan qəfəs.

Eşq odına yandı canım, eşq odı düşvar imiş,
Bilməmişdim, imdi bildim eşq müşkül kar imiş!

Zümreyi-üşşaqi mən' eylədüm: – Əl çək eşqdən!
Fikri-batil eyləmişdüm, eşq əcəb kirdar imiş!

Mən' edərdüm aşiqi: – Baxma rüxi-məhvəşlərə!
Məzhəri-vəchi-Əzəl ayineyi-rüxsar imiş!

Həlqeyi-zülfində dutdı aşiyan könlüm quşı,
Həbsə düşsün, paybənd olsun, bana əğyar imiş!

Daneyi-xalını ərz etdi könül mürğinə yar,
Saldı dami-zülfə, al etdi, əcəb məkkar imiş!

Eşqi-dil anlar degil təqrirü təhririvü zövq,
Qandı hər kim qanmadı eşqi – əcəb əsrar imiş!

Nərgisi-şəhla sanurdum gözlərini görməmiş,
Məsti-xabi-nazə getmiş o iki bimar imiş!

Qəmzeyi-çeşmlə təsxir eylədi dil mülkini,
Afərin qıl, Sağəri, əfsuninə – səhhar imiş!

Çeşmi-bimarun məni eşqində bimar eyləmiş,
Zülfi-pürçinin könül mürğin giriftar eyləmiş.

Ey əcəl, gəl sən məni azad qıl bu qüssədən,
Dilbəri məndən cüda çərxi-sitəmkar eyləmiş.

Badəyə sahir desəm, olmaz əcəb, sehr eyləyüb
Çöhreyi-cananəmi mey, gör, nə gülzar eyləmiş!

Hali-zarımı deyüb badi-səba, yoxsa mənim
Naleyi-zarım nigarımı xəbərdar eyləmiş?

Yar gördükdə mənim qıldı təbəssüm ruyimə,
Kim gedüb dərdi-dilim cananə izhar eyləmiş?

Atəşi-eşqin düşüb can mülkini suzan edüb,
Ahi-zarım aləmin xəlqini bizar eyləmiş.

Görmədi bir yaxşı gün, hərgiz, cəhanda Sağəri,
Qəm mətainə fələk könlüm xəridar eyləmiş.

Dil düşüb zülfi-pərişanə pərişan olmuş,
Kafərə tabe’ olub bəndeyi-fərman olmuş.

Badeyi-lə’li-ləbin zövqi-xəyalında könül
Bəs ki, fəryad qılub badə kimi qan olmuş!

Əzm qılmışdı mənim qətlimə, bəxt olmadı yar,
Mən nə tədbir qılum, yar peşiman olmuş?!

Gördi çün ayinədə əksi-rüxün, qıldı nəzər
Dilbərim çöhrəsinə – mən kimi heyran olmuş.

Məni mən’ eyləməyün, yoxdu qərarım bu gecə,
Məhfili-qeyrə gedüb, şəm’i-şəbistan olmuş!

Bu gecə yatmamışam sübhə kimi hicranda,
Zülm bihədd bana, cövr firavan olmuş.

Daməni-vəslinə, ey Sağəri, yetməz dəstim,
Qismətim ruzi-əzəldən bana hicran olmuş.

Təlxi-mey çöhreyi-dildarımı gülgun etmiş,
Həsrəti-təl'əti-canan cigərim xun etmiş.

Cəm' olub gənci-qəmin könlümi qıldı məhzun,
Dövləti-eşq məni dəhrdə Qarun etmiş.

Eşqi tərk eyləmək olmaz bana mümkün, hərgiz,
Leyliyi-eşq cəmalı məni Məcnun etmiş.

Şükrlillah ki, könül kami müyəssər oldı,
Sinəmi navəkü peykanlə məşhun etmiş!

Zülfdə görmədi bir gün bu könül mürği əgər,
Tiri-müjgan könül mürğini məmnun etmiş.

Dağıdub badi-səba zülfüni qıldı bərhəm,
Zülfə zülm eyləməyüb – könlümi məhzun etmiş.

Badeyi-eşq məni məst qılub, layə'qəl,
Halimi, Sağəri, bu bad digərgun etmiş.

Kafəri-zülfün könül mürğini kafər eyləmiş,
Eşqə bax bir, kafəri müslimə rəhbər eyləmiş!

Gördi cananım məni, qəhr eyləyüb, yüz döndərüb,
Sadə yarim düşmənin qövlinə bavər eyləmiş.

Həqqdən qəflət bana mümkün degil, ey dilrüba,
Nütfeyi-napakdən sən kimi gövhər eyləmiş.

Aç gözin bax qüdrəti-Həqqə, təğafül etmə sən,
Həqq, gör kim, xakdən bir belə peykər eyləmiş!

Könlümün seyd olmaqı oldı mühəqqəq, Sağəri,
Tiri-müjganını çeşmi-məstə yavər eyləmiş.

Dil düşüb zülfi-pərişanə giriftar olmuş,
Yetişüb mətləbə könlüm, bana əğyar olmuş.

Bax giribanıma, ey kafəri-birəhm gözəl,
Gözümün qanlu yaşından necə gülzar olmuş!

Görməmişdüm yüzüni, gördüm o gül çöhrəsini,
Güli-gülşən gözümə hər biri bir xar olmuş.

Bağə seyr eylədi ol gülrüx pakizə gühər,
Gül görüb çöhrəsini aşiqi-didar olmuş.

Türrə dövründə bana olmadı bir gün rahət,
Şanəvü bad könül mürğinə xunxar olmuş.

Bədənim tabü təbi-atəşi-hicranə düşüb
Eylədi qət’ həyatın, belə kim zar olmuş!

Ey əcəl, tap məni sən, eylə bu qəmdən azad,
Dilbərim tərkim edüb, qeyrə gedüb yar olmuş!

Sağəri, qılma şikayət ki, bana yox qəmxar,
Tirü peykanı könüldə bana qəmxar olmuş.

Dilbərim məh ruyinə zülfin pərişan eyləmiş,
Sübhü şamı aşiqə mə’şuq yeksan eyləmiş.

Əl qoyubdur qəbzeyi-şəmşirə? qətlimçün gəlür,
Şükrlillah, dilbərim qəsdi-dilü can eyləmiş!

Çeşmi-məstindən həzər qıl, ey gözüm, qılma nəzər!
Bir müərbid fitnədir, aləmdə min qan eyləmiş!

Navəki-müjgan atub dil qəsdinə əbru kəman,
Oxları zahir qılur, yayını pünhan eyləmiş.

Bülbüli-dil naleyi-əfğan qılur ol zövqdən, –
Sinəmi kim navəkü peykan gülüstan eyləmiş.

Sinəmin dağın görüb etmə məlamət yarımı,
Sinə dağın atəşi-suzani-hicran eyləmiş.

Dad bu çərxin əlindən Sağəri eylər müdam –
Şişə mülkini bana bir həbsü zindan eyləmiş.

Bilmədüm hiç rəhi-eşqdə mən can nə imiş,
Görmədüm ömrdə mən surəti-canan nə imiş.

Şərbəti-lə'li-ləb qətrəsini nuş etdüm,
Oldı mə'lum bana, çeşmeyi-heyvan nə imiş!

Danə fikrilə könül zülfi-pərişanə düşüb,
Bildi ol zülmət ara zülfi-pərişan nə imiş.

Bilməzidim ki, nədir cənnət ara qılmanı,
Çöhrəsin gördi gözüm, bildi ki, qılman nə imiş.

Eşidürdüm ki, edər naleyi-əfğan aşiq,
Mən bilürdümmi ki, bu naleyi-əfğan nə imiş?

Bana bir busə əta qıldı zənəxdanından,
Anladum imdi ki, o sibi-zənəxdan nə imiş!

Sağəri vəsldə bilməzdi nədir atəşi-hicr,
İmdi mə'lum elədüm atəşi-hicran nə imiş.

Atəşi-hicran bəni, gəl gör, nə suzan eyləmiş! –
Xanəmi bərbad edüb, zülmlə viran eyləmiş.

Gecəvü gündüz bana oldı bərabər hicrdə,
Bu yəqindir kim, yüzə zülfin pərişan eyləmiş.

Qanlu yaşım, bəs ki, mövc urdı fəraqında sənin,
Gəl gör, ey zalım, tənimi qərqi-ümman eyləmiş!

Vəsl qədrin bilmədüm, ömrüm təmam oldı əbəs,
Vəsl evin hicran edüb, hicranı zindan eyləmiş.

Odlu ahim yandurub rəxtü libasi-cismimi,
Aşiqin könlüni zülfin tək pərişan eyləmiş.

Qanlu yaşım, bəs ki, axdı didələrdən, eşqdə
Qalmadı bir yer – onı rəşki-gülüstan eyləmiş.

Sağəri kəsməz ümidün vəsldən ta zindədir,
Ərçi zülfün tək məni hicran pərişan eyləmiş.

Olmadı naleyi-zarımdan ola yar xilas,
Şəbi-firqətdən ola dideyi-bidar xilas.

Vəqt-bivəqt qılur naləvü fəryad, fəğan,
Mərəzi-eşqdən olsun dili-bimar xilas.

Ənbəri-zülfi-müsəlsəldə könül dutdu vətən,
Olmasun bari Xudaya, bu giriftar xilas!

Bu cəhan xəlqini bir ahlə qıldum bərbad,
Olı bu fitnə telindən necə əğyar xilas?

Nə qədər vardur canım bu tən içrə, ya Rəbb,
Olmasun tiri-qəmindən diləfgar xilas!

Nə qədər var könül məndə, fərağət yoxdur,
Məni qılsun görüm ol qəmzeyi-xunxar xilas!

Xətt çıxub məmləkəti-hüsnini qıldı tarac,
Sağəri, oldı əcəb aşiqi-didar xilas!

Bülbüli-şuridəyə səhni-gülüstandır qərəz,
Gülüstani-eşqdə fəryadü əfğandır qərəz.

Naləvü fəryad edər könlüm quşı, ey gülrüxüm,
Könlümün mürğinə ol zülfi-pərişandır qərəz.

Rişteyi-zülfə əgər pabənd olub könlüm quşı,
Zülf mənzur etməyüb, ol ruyi-rəxşandır qərəz.

Daneyi-xalindən ötri eyləməz əfğan könül,
Naləvü əfğandan ol tiri-müjgandır qərəz.

Zülməti-zülfündə könlüm mürği seyr eylər əgər,
Xızr tək ol zülmət içrə abi-heyvandır qərəz.

Bülbülə gül, aşiqə mə'şuq lazımdır, vəli
Zahidə firdövs içində hurü qılmandır qərəz.

Aşiqə mənzur yoxdur dəhr içində, Sağəri,
Bülbülə gül, aşiqə didari-canandır qərəz.

Ərzimi gəl, ey səba, qıl bu gün ol canə ərz,
Surəti-bicanımı eylə o cananə ərz.

Türreyi-şəbrəngini etmə pərişan yüzə,
Kafəri cənnət ara qılma müsəlmanə ərz.

Eylə xəcalət güli, şurə gətür bülbüli,
Arizi-gülrəngini eylə gülüstanə ərz.

Sərv ayağdan düşər, xaklə yeksan olur,
Sərv qədin eyləsə sərvi-xüramanə ərz.

Qönçə açılmaz dəxi badi-səba gər əsə, –
Qönçə dəhanın edə qönçeyi-xəndanə ərz.

Gün saralur qüssədən, məhv olu rüxsarına,
Çöhrəsini gər qıla mehri-dirəxşanə ərz.

Qarə olubdur günüm zülf kimi, Sağəri,
Şanəyə e'lam edüm, zülfi-pərişanə – ərz.

Olmadı dövri-fələkdən dili-suzanə nəşat,
Verməyübdür Həqq özi zərreyi-imkanə nəşat.

Günimi qıldı qara zülfi-pərişanında,
Qılub avarə məni, etdi özi şanə nəşat.

Qılub amadə xəzanı ki, edə zir-zəbər,
Neçə gün verdi əgər səhni gülüstanə nəşat.

Öldürüb aşiqi-biçarəsini həsrətlən,
Bu cəhətdəndi edər dilbəri-cananə nəşat.

Kafərin eyşü nəşatlə qılub təxmirin,
Verməyüb ruzi-əzəl hiç müsəlmanə nəşat.

Oldı mö'tad qəmü qüssəvü ənduhə könül,
Həqqdən istəmişəm; odə düşüb yanə nəşat!

Bu fəna mülkdə aludə olub qılma sürur,
Kim görübdür eyləsün dəhrdə fərzanə nəşat?

Ləzzətü eyş tapub atəşi-suzan içrə,
Yandurub bal-pərin eylədi pərvanə nəşat.

Qəmü ənduhlə həmsöhbət olubdur könlüm,
Qorxuram salə səni, Sağəri, böhtanə nəşat.

Nigarım qeyrə uymuşdur, edər söhbət, Xuda – Hafiz!
Ki, məndə yoxdu taqət çəkməgə xiffət, xudahafiz!

Bu axır ömrdə gəl bir əlimi al ələ bir dəm,
Edək ta bir-birimizlə halal-himmət, xudahafiz.

Cəmalın bağını seyr etməmiş gürgi-əcəl gəldi,
Məni səndən cüda qıldı o biqeyrət, xudahafiz!

Neçə illər qapuda itlərin tək eylədüm əfğan,
Ki, bundan böylə bəsdir çəkdügim zillət, xudahafiz!

Alubdur mülki-cismi ləşkəri-xəttin, edüb qarət,
Talandı hüsn şəhri, yox sana rəğbət, xudahafiz!

Könül dutdu vətən zülfün telində, görmədi bir gün,
Bana, hər qanda olsam, yoxdu bir rahət, Xuda – Hafiz!

Könül dürci dolubdur xunilən, ənduhə yer yoxdur,
Haram etmiş bana Həqq, Sağəri, işrət, Xuda – Hafiz!

Can çıxub təndən gedər, ey zülfi-canan, əlvida!
Çəkdi əl cismi-zəifimdən, gedər can, əlvida!

Tiri-peykanın əritdi atəşi-dil sinədə,
Əfv qıl, üsyan edüb dil, çeşmi-fəttan, əlvida!

Görmədi bir gün qara zülf içrə könlüm, neyləyüm,
Ənbəri-zülfin kimi oldı pərişan, əlvida!

Ey şəbi-hicran, "Ya Rəbbim!"lə incitdim səni,
Gəlgilən, axır nəfəsdir, eylə: – Hicran, əlvida!

Ölmədüm ruzi-vidai-yar, həsrət bundadır,
Ol zəman ki, mən dedüm: – Ey mehri-rəxşan, əlvida!

Lal olaydı dil, çıxaydı ruh təndən ol zəman
Dedüm: – Ey sərvi-rəvan, ey mahi-Kən'an, əlvida!

Doymamış nəzzarəsindən Sağəri, gəldi əcəl,
Eylədi səndən cüda, baçeşmi-giryan, əlvida!

Ey könül, gəl kəsgilən zülfi-pərişandan təmə'!
Hər teli bir mari-su'bandur, götür andan təmə'!

Vəsldən nomid olub kəsdüm təmə' ol zövqdən,
Necə kim, xəffaşə kəsdi mehri-rəxşandan təmə'.

Qalmadı dil məndə, peykanı olubdur dil bana,
Dil hanı təndə ki, qılsun tiri-müjgandan təmə'?

Əl götür gəl bütpərəstlikdən, könül, məkruh dut,
Ya ona meyl eylə, ya kəs nuri-imandan təmə'.

Gər müxəyyər qılsalar cananilə canım bana,
Qılmanam canandan, qət' eylərəm candan təmə'.

Ləbləri şəhd bana verdi həyati-cavidan,
Ol səbəbdən kəsmişəm mən abi-heyvandan təmə'.

Öylə mə'nus olmuşam hicran odunda yanmaqa,
Qət qıldum, Sağəri, mən vəsli-canandan təmə'.

Paybənd olmuş mənim tək zülfi-ənbərsayə şəm',
Mən kimi aşiq olubdur ol güli-rə'nayə şəm',

Nisbəti yoxdur rüxi-cananə şəm'in hüsndə,
Necə bənzər lütfdə[18] ol arizi-həmrayə şəm'?

Canına od düşdi şəm'in rəşk odundan, dilbərim,
Oldı aludə mənim tək bu rüxi-zibayə şəm'.

Etmək olmaz şəm'ə nisbət çöhreyi-cananımı,
Mümkün olmaz hiç ki, qədrilə yetsin ayə şəm'.

Necə Məcnun olmayum eşqində bir Leylivəşin? –
Görsə şəm'i-ruyini, mən tək düşər səhrayə şəm'.

Şəm' tək hicran odı yandırdı cismü canımı,
Ağladı əhvalıma görcək məni-rüsvayə şəm'.

Dudi-dildir şəm' başından çıxar məhfil ara,
Sağəri tək, gör, düşübdür tazədən sevdayə şəm'.

---

[18] Əlyazmasında bu sözün üstündə ikinci variant kimi "hüsndə" sözü yazılmışdır.

Arizi-cananimə mən tək olub heyran çırağ,
Hər gecə bu cismi-zarım tək yanar giryan çırağ.

Bikəsəm, yoxdur ənisim hicr evində sübhə tək,
Çöhreyi-yarım xəyaliylə mənim tək yan, çırağ.

Şö'leyi-ahım şəbi-hicranımı rövşən qılub,
Od salubdur canıma pərvanə tək hicran, çırağ.

Könlümün ahı qılub tə'sir, ya eşq atəşi,
Şö'ləvər olmuş, yanar hər dəm, tapar nöqsan çırağ?

Gər soruşsa yar səndən aşiqin əhvalını,
Sölə kim, eşqində verdi həsrətilə can, çırağ.

Sinəmə dağlar çəküb hicran odı hicran ara,
Yaxşı olmaz həşrə tək könlüm, olubdur qan, çırağ.

Necə giryan olmayum mən Sağəri hicran ara,
Od salubdur canıma sən tək mənim canan, çırağ.

Yar qılmaz neyləyüm hərgiz bana qəmxarlıq,
Yandı canım eşq odunda, yarım etməz yarlıq.

Atəşi-hicran mənim yandırdı cismi-zarımı,
Peşə oldı könlümə, zalım, əcəb xunxarlıq.

Ey əcəl, canımı al, sən gəl məni eylə xilas,
Bisəbəb yarım qaçar məndən, qılur bizarlıq.

Bilmirəm dərdi-dilimi kimə izhar eyləyüm? –
Ol ki yar idi bana imdi qılur əğyarlıq.

Mən özüm yıxdum evimi öz əlimlə, ey könül,
Sud qılmaz hicr evində sübhə tək bidarlıq.

Eşq olan yerdə tapulmaz səbrü aramü şəkib,
Hər kişi kim aşiq oldı, vacib olmuş xarlıq.

Sağəri məhrum oldı vəsli-dilbərdən bu gün,
Atəşi-hicranə yandırdı təmami-varlıq.

Məni hicran evində zülf tək qılmış pərişanlıq,
Tərəhhüm qıl bana, kafər, degil rəsmi-müsəlmanlıq.

Olaydum kaş dərgahində bir it gecəvü gündüz,
Görəydüm ruyini hər dəm, edəydüm bəndəfərmanlıq.

Dolandum başına, öpdüm ayağından, bihəmdillah,
Yetişdüm kamıma, tapdum cəhanda türfə sultanlıq.

Quzı qurbanını məqbul qılmaz Həqq, qətl etmə,
Kəsəllər gusfəndi-pür başin, olsa, qurbanlıq.

Yüzin mehrü məhin dərk etmək olmaz, səxt müşkildür,
Cəmalın pərtövündən hasil oldı bəs ki heyranlıq.

Nəfəs təng oldı, çıqmaz sinədən, ey dilrüba, neylim,
Xədəngi-qəmzədən könlüm olubdur çünki peykanlıq.

Özün qıldun özünə hər nə qıldun vəslü hicranda,
Səmər verməz sana, ey Sağəri, hərgiz peşimanlıq.

Eşqə düşdün, ey könül, eşqində yarın urma laf,
Muy tək barik olur, gər eşqə düşsə Kuhi-Qaf.

Vəsldə gördi məni çərxi-fələk kim, rəşkdən
Aşiqi mə’şuqdən ayırdı, saldı ixtilaf.

Məhbəsi-hicran müqəyyəd eyləyüb canım mənim,
İstitaət olsa, eylərdüm səri-kuyin təvaf.

Atəşi-hicran məni yandırdı, tabım qalmadı,
"Rəbbi, xəllisni minən-nari vəl-firaqi ma nəxaf"[19].

Şərbəti-vəslin əlac etməz mərizi-qəlbimə,
Zəhri-hicran könlümə əzbəs ki vermiş inhiraf.

Hər yana qılsam nəzər vəchin nümayandur bana,
Qəlb güzgüsinə seyqəl verdi eşqin, qıldı saf.

Sağəri oldı səbəb hicranına, ey dilrüba,
Hiç kəs təqsirinə qılmaz cəhanda e’tiraf.

---

[19] Mənşəyini aydınlaşdıra bilmədiyimiz bu ərəbcə ifadənin tərcüməsi belədir: "Ey Tanrım, məni oddan və ayrılıqdan qurtar, bizim qorxduğumuz [budur]".

O zəmandan ki olub sinə xədənginə hədəf,
Eşq odı xirməni-ömrümi mənim qıldı tələf.

Məni mən’ eyləməyün xaki-rəhindən götürüz,
Yüz qoyub dərgəhinə mən kimi canlar səf-səf.

Görə gər gövhəri-dəndanını, ey afəti-can,
Ki çıxarmaz gövhərin dişrə dəxi hiç sədəf.

Gər düşə daməni-vəslin əlimə, ey kafər,
Qoymaram əldən onı yanə, odur izzü şərəf.

Qanlu yaşım tökülür çöhrəmə min həsrətilən,
Hər zəman kim, ki düşər xatirə əyyami-sələf.

Kafəri-könlümə küfri-səri-zülfindü qərəz,
Kafərə sud yetişməz, oxuna min müshəf.

Yetmədüm vəslinə mən, Sağəri, hicran ələmi
Yandudı cismimi, canımı mənim qıldı tələf.

Yandudun sən ki məni atəşi-hicranə, fəraq,
Yanasan mən kmi sən atəşi-suzanə, fəraq!

Çıx aradan, məni sən vəslə yetür, rəhm eylə,
Səni mən and verürəm ayeyi-Qur'anə, fəraq!

Bivəfa yarımı agah qıl əhvalımdan,
Ey səba, atəşi-suzanı salub canə fəraq!

Bir zəman xali degil fikrü xəyalindən dil,
Bilürəm kim salacaq, könlümi min qanə fəraq.

Yandudı canilə cismimi mənim nari-fəraq,
Kaş o da mən təki hər ləhzə oda yanə, fəraq.

Vəsldən kəsdi ümidini könül, qan oldı,
Vəsldə qəhr edüb, atdı məni yanə fəraq.

Sağəri, öldürəcəkdir məni hicran ələmi,
Belə kim saldı məni mövceyi-tufanə fəraq.

Mənəm, ey dilbəri-gülçöhrə, sana aşiqi-sadiq,
Bu məhəbbət ki mənim var, budur şər'ə müvafiq.

Qərəzim eşqi-həqiqidi, degil eşqi-məcazi,
Xaki-payinə qəsəm, mən sənəyəm aşiqü sadiq.

Rüxün ayinəsidir Həqq qılur aşiqə zahir,
Az çəkər qət' olur eşqi-rüxündən bu əlaiq.

Məni mən' eyləmə sən, çöhrənə baxsam gecə-gündüz,
Zahir eylər bana bu ayinə əsrari-həqayiq.

Gəl qulaq asma rəqibin sözünə, eyləmə bavər,
Eylə rəftar mənimlə belə kim adəti-sabiq.

Məni öldürmə fəraqında, Xudadan həzər eylə,
Aşiqi-sadiqi qətl eyləmə, olmaz sana layiq.

Aşiqi-paki-nəzərbaz mənəm eşqdə daim,
İncimə, gər deyələr Sağəri olmuş sana aşiq.

Fəraqında olub gəl görgilən xunincigər aşiq,
Səbəb oldur ki, qılmaz çöhrənə bir dəm nəzər aşiq.

Rüxündən qeyr meyl etməz rüxi-məhvəşlərə hərgiz,
O gündən kim olub könül  sana, ey simbər, aşiq.

Məni mən’ eyləmə seyri-səri-kuyindən, ey məhvəş,
Könül mürğündən ötri eylərəm hər dəm güzər, aşiq.

Gözümi ol səri-kudən yana döndərmənəm hərgiz,
Əgər yüz min uralar firqəmə tiğü təbər, aşiq.

Xədəngi-qəmzəni eylə rəvanə canə hər ləhzə,
Xədəngi-qəmzənə qılmış tənü canın sipər aşiq.

Könül mürğini qorxutma xədəngi-qəmzədən, kafər,
Xədəngü tiri-məhvəşdən necə qılsın həzər aşiq?

Məni, ey Sağəri, öldürdü eşq, yoxdu dərmanım,
Səbəb oldur: olub mə’şuqindən bixəbər aşiq.

Neyləmişdüm sana, kafər, cigərim xun etdün,
Mənlə şiveyi-rəftarı digərgun etdün?

Nəzərindən məni-biçarəni saldun yenə sən,
Düşməni şad qılub, sən məni məhzun etdün.

Hərəkati-rəvişi-şiveyi-rəftarinlə,
Çoxları mən kimi bu şivədə Məcnun etdün.

Əhd qıldun ki, vəfa etməyəsən aşiqinə,
Məni dilgir elədün, düşməni məmnun etdün.

Səni də mən kimi bu dərdə giriftar olasan,
Belə kim göz yaşımı hicrdə Ceyhun etdün!

Həmnişin oldı rəqiblə nigarım, ey çərx,
Bu nə rəftardı etdün, necə qanun etdün?

Günbəgün, Sağəri, artar qəmi-eşqi-canan,
Çünki saldın nəzərindən məni, dilxun etdün.

Tiği-fəraqın eylədi köksimi çak-çak,
Yandırdı hicr odı tənimi, eylədi həlak.

Müşkildü eşqdən çəkəm əl ta ki zindeəm,
Ta olmaya bu cismü könül dəhr içində xak.

Mənzur yox bana, bana mənzur hiç kəs,
Qılmaz könüldə cilvə rüxi-vəchi-masivak.

Hicranda od dutar tənü canım yanar o dəm
Vəslindən ötri çəksəm əgər ahi-dərdnak.

Min il əgər fəraq oduna yandusan məni,
Eşqindən əl götürmənəm – odun bana nə bak!

Eşqi-rüxün çü dutdı könül mülkini vətən,
Qıldı təmami-eşqi bu dil içrə cümlə pak.

Sal xatirinə Sağərini, dərdmənddür,
"Ey mən fədayi-to, ləki ümmi və əbi fədak".[20]

---

[20] Birinci hissəsi farsca, ikinci hissəsi ərəbcə olan bu ifadənin tərcüməsi belədir: "Ey fədası olduğum, anam-atam sənə fəda olsun!"

Düşəndə xatirimə hər zəman zülfi-pərişanın,
Məni eylər pərişan zülf tək bu suzi-hicranın.

Bu gün canımı nəzr etdüm edüm cananıma qurban,
Əgər görsəm anın min nazlə rəftari-cövlanın.

Məni mən' eyləmə tövfi-səri-kuyindən, ey dilbər,
İnani-ixtiyarım aldı əldən çeşmi-fəttanın.

Yüzin görcək könül Məcnun olub canın fəda etdi,
Görən Leyli cəmalını gərək təslim edə canın.

Atar səngi-məlamət el əgər cismimə, xoşhaləm,
Sipər qılmış bəla daşına Məcnun cismi-üryanın.

Yanan eşq atəşinə istəməz rahət bu aləmdə,
Gərək töksün təriqi-eşqdə min şövqlə qanın.

Belə kim mən təriqi-eşqdə, ey Sağəri, çəkdüm,
Başına gəlməsün aləmdə, ya Rəbb, bir müsəlmanın.

Kim qıldı fəda canını cananə mənim tək?
Kim bağladı dil ol məhi-Kən'anə mənim tək?

Can zülfünə bağlandı, könül qəmzə oxuna,
Kim eylədi bu qəsdi dilü canə mənim tək?

Çox yandı fəraq atəşinə aşiqü bidil,
Kim yandı, deyün, atəşi-hicranə mənim tək?

Çox kimsənəni məst qılub badeyi-eşqin,
Divanə olub – olmadı divanə mənim tək.

Pərvanə gecə yandıdı balü pərin, əmma
Gündüz-gecə yandurmadı pərvanə mənim tək.

Çox aşiqə zülm eylədi bu kafəri-bidin,
Zülm eyləmədi hiç müsəlmanə mənim tək.

Çox seyd qılub qəmzən oxı eylədi məcruh,
Ey Sağəri, kim batdı belə qanə mənim tək?

Atəşi- hicranə saldun, vəslə fürsət vermədün,
Canım aldun, ey əcəl, bir ləhzə möhlət vermədün!

Günbəgün lütfin kəsüb məndən nigarım, ey könül,
Vəsldə cananına hərgiz nəsihət vermədün.

Neyləmişdüm mən, sana, məhrum qıldun vəsldən,
Atəşi-hicranə saldun cismi, taqət vermədün?

İstəridüm dərdimi, ey dilrüba, izhar edüm,
Vəslə etdüm şərhi-qəm, əmrinə rüxsət vermədün.

Göz yaşilə pərvəriş verdüm nihali-qəddinə,
Neyləmişdüm, ey fələk, sərvə təravət vermədün?

Və’də verdün edəsən min lütf, min qünci-dəlal,
Hansı gün keçdi bana kim, onda xiffət vermədün?

İmdi bildüm düşmənimdir çərxi-pürlacivərd,
Bais oldur, Sağəri, karinə surət vermədün.

Badeyi-xunilə rüxsarını gülgun etdin,
Rəşk odunda cigərim parəsini xun etdin.

Könlümi aldı əlimdən, bana mə'lum degil
Necə aldı, dili-cananə nə əfsun etdin?

Göstərüb türreyi-lə'lin bana, Leyli, nagəh,
Dili-divanə qılub, eşqdə Məcnun etdin.

Gərçi üşşaqə qılub zülm, cəfayi-bihədd,
Zülmü cövri bana ol cümlədən əfzun etdin.

Qoymadun hicrün evində məni sən nalə qılam,
Aqibət, mənzilimi dəştlə hamun etdin.

Məni yandurma, Xudaya, Sən özin rəhm eylə!
Eşqi-cananilə sən sinəmi məşhun etdin.

Sağəri atəşi-hicranə yanan dəmdədi kim,
Fikri-vəslilə o od içrə nə məzmun etdin?

Eşq əhli dəhr içində xəstə can olmaq gərək,
Aşiqə mə'şuq daim mehriban olmaq gərək.

Kim deyübdür əhli-eşqə şad olun, eşqdə
Aşiqin könli həmişə ləxtə qan olmaq gərək.

Ey gözüm, qan ağlama, ey dil, həzər qıl xəlqdən,
Eşq sirri xəlqdən daim nihan olmaq gərək.

Vəsl əldən getdi, ey dil, olma sakit bir zəman,
Hicr evində sübhə tək ahü fəğan olmaq gərək.

Əqrəbi-zülfini salma ay gözünə, qıl həzər,
Lütf andandur, hamu xəlqə əyan olmaq gərək.

Yandum, ey əğyar, sən də mən kimi yan odlara,
Yoxdu taqət yanmaqa, hicranda can olmaq gərək.

Həsrətim qaldı könüldə, qılmadum izhari-hal,
Neylüyim, yoxdür zəbanım, bir zəban olmaq gərək.

Nəng qılma tə'neyi-əğyardan, ey Sağəri,
Əşki-aşiq çöhreyi-zərdə rəvan olmaq gərək.

Ey könül, eylə nəzər gör nəzəri-ehsanın,
Çəküb öldürməgə tiğini ki, töksün qanın.

Bu xəyaliylə olub ömr tamam aləmdə:
Olacaqdır, görəsən, bircə gecə mehmanın?

Məni canana yetür, ey şəhi-mülki-lövlak,
Sidqlə çəng urub dutdı sənin damanın.

Canını eylə fəda payinə min şövqlə gər
Gəlsə hicran evinə pursiş içün cananın.

Can xilas olmayacaq tiği-qəmindən hərgiz,
Çıxacaq nöh fələkə nalə ilə əfğanın.

Gər yetürsən məni vəslinə bu gün, əhd etdüm:
Canü ruhü bədənim cümlə ola qurbanın.

Çarə qıl dərdinə, hicran gecəsi gəldi genə,
Sağəri, müşkil olur suzi-qəmi-hicranın.

Ey könül, nalə elə, aşiq olan zar gərək,
Atəşi-hicrdə qəmxarü giriftar gərək.

Gülməyə çöhrəsi hicran sitəmindən hərgiz,
Vəsl fikriylə gecə didəsi bidar gərək.

Aşiqi-sadiqdə səhhəti-can olmasa, leyk
Mərəzi-eşqə düşən kimsənə bimar gərək.

Nə behiştə təmə'im var, nə duzəxdə yerim,
Bana didari-rüxi-yari-vəfadar gərək.

Keçmişəm varü yoqından bu cəhanın cümlə,
Neyləyim var-yoxı, aşiqə dildar gərək.

Hüsn mətlub degil aşiqə mə'şuqindən,
Olsa gər ümdə, budur: şiveyi-rəftar gərək.

Sağəri, olmadı mümkün görəsin çöhrəsini,
Ölməgim oldı yəqin, çöhreyi-didar gərək.

Ey rüxün əksi afitabi-fələk,
Görməyüb dideyi-fələk sən tək.

Könlümün yarəsinə yoxdu əlac,
Yarəmə hicr evində səpdi nəmək.

Eylə tədbiri-vəsl, ey həmdəm,
Öldürür eşq aşiqi, bişəkk.

Ağladı çərx, gördi tabü təbim,
Od dutub yandı bəhr içində səmək.

Gəlmədi yar, qaldı göz yolda,
Zindəganlıq bana olub ölmək.

Çöhreyi-zərdimə baxub anla,
Sana əhvalımı dəxi nə demək?

Gər soruşsan ki, Sağəri noldı? –
"Qətələl-eşqü fil-firaqi, hələk".[21]

---

[21] Ərəbcə misranın mə'nası: "[Onu] eşq ayrılıq içərisində öldürdü, o, həlak oldu".

Mənim, ey çərxi-dun, gözdən məhü mehrim nihan etdin,
Qəmi-eşqimi qıldun faş, xəlq içrə əyan etdin.

O gül kim, pərvəriş verdüm gözüm yaşilə ömrümdə,
Fələk, mən neylədim, qeyri gülimə pasiban etdin?

Düşüb eşqi-rüxün könlümə nagəh, ey büti-ziba,
Mənim bu pir olan könlümi eşqinlə cəvan etdin.

O gülrüx kim qılurdı mehribanlıq aşiqə hər dəm,
Fələk, əğyarə o yarı neçün sən mehriban etdin?

Əcəb yıxdun evimi işvəvü nazlə, ey həmdəm,
Məni divanə qıldun eşqdə, bixaniman etdin.

Könül, rəhm etmədi ol səngdil gülrux sana, hərgiz,
Nə qədr ağladun, qanlu yaşin gözdən rəvan etdin.

Qərarü səbri eşqin aldı məndən, yoxdu bir çarə,
Mərizi-eşq olubdur Sağəri, sən qəsdi-can etdin!

Ey fələk, əğyarımı yarimə sən yar eylədün,
Zülfi-mişkin kimin sən ruzimi tar eylədün.

Atəşi-hicranə yandurdun dili-suzanımı,
Dəhr içində könlümi gözdən salub xar eylədün.

Zülmlən aldun əlimdən, ey fələk, dildarımı,
Yarımı, ey çərxi-dun, əğyarə dildar eylədün.

Ey məhəbbət, eylədün tüğyan təriqi-eşqdə,
Aşiqi-xunxardan mə'şuqi bizar eylədün.

Sərəfraz etdün bu gün, yarım, məni, basdun qədəm,
Beyti-hicranımı, canan, rəşki-gülzar eylədün.

Fikr qıl dərdim əlacında, təbibim, bir zəman,
Çeşmi-məstinlən mənim könlümi bimar eylədün.

Vəsldən kəsdi ümidin Sağəri, ey dilrüba,
Atəşi-hicran içində sən məni zar eylədün.

Vəsl əyyamı bana hiç cəfa eyləmədün,
Atəşi-hicrə salub, vəslə vəfa eyləmədün.

Dərdə saldun dili-pürxunimi eşqində əcəb,
Ey təbib, dili-bimarə dəva eyləmədün.

Könlümi seyd eylədün navəki-müjganınla,
Afərin şişinə kim, hiç xəta eyləmədün.

Nə qədər əcz elədüm mən sana, qaçdun məndən,
Könlümün mətləbini hiç rəva eyləmədün.

Hərəmi-vəsldə əğyar olub məhrəmi-raz,
Məni hicranə salub, heyf, rəha eyləmədün.

Qərəzim vəsldi, məhrum elədün vəslindən,
Nə səbəbdəndi qılub əhd, vəfa eyləmədün.

Sağəri atəşi-eşqində yanub can verdi,
Yandudun aşiqi hicranə, nəva eyləmədün.

Yandıdı biçarə cismim daği-hicranın sənin,
Yadi-vəsli, xəbər olsun, tökdi qanın sənin.

Bu cəhanda tapmadım hərgiz cəm' olan bir könül,
Olmamış pabəsteyi-zülfi-pərişanın sənin.

Yansun ol dil kim, qəmi-eşqində qəmgin olmadı!
Ölsün ol can – olmadı şövqlə qurbanın sənin!

Yanmaqa taqət gətürməzdi könül hicran ara,
Könlüm içrə olmasaydı qanlu peykanın sənin.

Qalmayub dil məndə kim, hicranda əfğan eyləsün,
Parə-parə eyləyübdür tiri-müjganın sənin.

Ləxti-xun olsun, fəraq odunda yansun ol könül –
Gördi ruyi-xubini, olmadı heyranın sənin.

Sağəri bir dərdə düşdi – yox əlacı dəhr ara,
Almış əldən ixtiyarım çeşmi-fəttanın sənin.

Yandurub eşq atəşinə cismimi halın sənin,
Öldüməz, bir dəf'ə öldürdi bu ehmalın sənin.

Hicrdə öldüm əgər tapdum həyati-cavidan,
Ölməz ol kimsə ki, oldı, dust, pamalın sənin.

Gülüstani-vəslə uçmaqlıq, könül, oldı mühal,
Səngi-hicranilə sınmışdır pərü balın sənin.

Öz vücudimi ədəm qıldum rəhi-eşqində mən,
Görmədüm hərgiz doyunca o rüxi-alın sənin.

Çoq müsəvvir surətin təsvirini qıldı bana,
Aciz oldı, olmadı təhrir timsalın sənin.

Dilbərim lütf eyləyüb məndən soruşdı hicrdə:
Necə keçdi mənsiz, ey aşiq, məhü salın sənin?

Qətlinə fərman verübdür, Sağəri, şəhla gözi,
Şükr qıl Allaha kim, yar oldı iqbalın sənin.

Abi-vəsl ilə mənim könlümi sirab eylədün,
Çeşmeyi-çeşmimi, min şövqilə pürab eylədün.

Bir neçə gün qaçdı məndən yanə gülrux dilbərim,
Noldı bais, ey gözəl, sən meyli-əhbab eylədün?

Yar fikrilə gecəm gündüz, sabahım oldı şam,
Neyləmişdim, didəmi, ey eşq, bixab eylədün?

Aşiqi-sadiqdən əl çəkdün, nə gördün, bivəfa,
Bülhəvəslər xeylini vəslinə əshab eylədün?

Hicr evində, dilbərim, həsrətlə qoydun didətər,
Naxuni-həsrət könül tarına mizrab eylədün.

Atəşi-hicranə yandum, qalmadı cismimdə tab,
Rəhm qıl, ey dilrüba, könlümi bitab eylədün.

Hiç kəs hicran odunda yanmaqa tab etmədi
Sən kimi, ey Sağəri, yandun, əcəb tab eylədün!

Yandurur hər ləhzə cismim suzi-hicran, ey fələk!
Qalmadı cismi-zəifimdə dəxi can, ey fələk!

Aşiqi mə’şuqdən qıldun cüda, ey bihəya,
Atəşi-hicranda könlüm eylədün qan, ey fələk!

Neyləmişdim mən sana, aldun əlimdən yarımı,
Hicr evində eylədün cismimi giryan, ey fələk?

Şərbəti-lə’li-ləbindən doymamış qıldun cüda,
Zülfi-canan tək məni qıldun pərişan, ey fələk!

Vəsldən qıldun ümidim qət’ hicran içrə kim,
Qalmışam mən öz-özümə matü heyran, ey fələk.

Yetməsəm vəslinə yarın, eyləsəm qət’i-ümid,
Həşr olunca eylərəm mən ahü əfğan, ey fələk!

Sağərini eylədün zülmilə yarından cüda,
Xaneyi-eyşini qıldun sən nə viran, ey fələk?

Dideyi-aşiq həmişə eşqdə pürnəm gərək,
Hicr evində paybəstü eşqdə möhkəm gərək.

Baxma çeşmü taqi-əbrusinə allamma, könül,
Rəmz bilməz xamdır – mə'şuqdə çəm-xəm gərək.

Bülhəvəs olma, könül, qılma nəzər hər məhvəşə,
Aşiqə bir sərvqədd, mahru həmdəm gərək.

Qamətim xəm olsa eşqində, şikayət etməzəm,
Bari-qəmdən qaməti-aşiq həmişə xəm gərək.

Talibi-vəsl olma, ey aşiq, ki, vəslin hicri var,
Hicrə adət qıl ki, aşiq hicrdə bərhəm gərək.

Bir bütə ver könlini əsla rəqibi olmasın,
Dideyi-mehrü qəmərdən daima mübhəm gərək.

Sağəri, qəm badəsindən məst ol, gör kim nə var,
Zümreyi-üşşaqdə peyvəstə dərd-qəm gərək.

Dilbərim, bəzmim bu gün rəşki-gülüstan eylədin,
Mərhəmi-vəslilə dərdi-hicrə dərman eylədin.

Qılmadı göz bir nəzər rüxsari-yarə vəsldə,
Bəs ki, ey zalım, məni mö’tadi-hicran eylədin!

Tökmədün yalquz mənim qanım təriqi-eşqdə,
Hər nəzər saldıqca didə, xəlqə min qan eylədin.

Gecəvü gündüz bana oldı bərabər ol zəman,
Ənbəri-zülfin rüxi-alə pərişan eylədin.

Vəsl evin viran edüb, tə’mir qıldun hicr evin,
Cismimi bu nar içində həbsi-zindan eylədin.

Ey könül, tərk eylə eşqi-yarı, əl çək eşqdən,
Qorxgilən, meyl etmə eşqə, yadi-qiran eylədin!

Sağəri, qıldun qəsəm Qur’anə, Həqqdən xovf qıl,
Yarlən qıldun əxxərtə[22], əhdü peyman eylədin.

[22] İfadənin mə’nası: "Yarla geriyə qaldın (xəlvətə çəkildin)".

Nə gördün sən vəfadə, aşiqə tərki-vəfa etdün?
Vəfanı tərk qıldun, bivəfa, yüz min cəfa etdün?

Məni tərk eyləyüb, əğyarə yar oldun sən, ey gülrux,
Salub eşq atəşinə, cismimi andan rəha etdün.

Vüsalın xanəsin viran edüb, hicran evin tikdün,
Dağıtdun xaneyi-vəsli, məni biaşina etdün.

Təğafül qılma aşiqdən sən, ey mə'şuqi-səngindil,
Məni dərdə salub, əğyar dərdinə dəva etdün.

Məni bir dərdə saldun kim, əlacı yoxdu aləmdə,
Mənim rəğmimə əğyar hacətin, dilbər, rəva etdün.

Rəqibi rəğmimə qıldun nəvaziş, canımı aldun,
Könül mülkini eşqində əcəb sən bisəfa etdün.

Özümdən oldı hər nə oldı, yoxdu yar təqsiri,
Zəbanın lal olaydı, Sağəri, sən bihəya etdün!

Eylədüm tərki-həvəs, leyk bu biçarə könül
Axtarur kuçəbəkuçə, gəzər avarə könül.

Bədənim mülkini tərk eyləyübən etmə firar,
Neyləyim, məndə dəxi qalmadı bir çarə, könül.

Dil həbs eyləmək olmaz ki, ölür hicranda,
Hər məkanda kim olur, yarə qaçar, yarə könül.

Öldürür qəmzeyi-nazilə səni, eylə həzər,
Çeşmi fəttan, yüzi gül, qəmzəsi xunxarə, könül.

Məni tənha qoyuban getmə, könül, yarə tərəf,
Vəsl məqdur degil kim sana həmvarə, könül!

Getmə mənsiz səri-kuyinə, könül, rəhm eylə,
Mənsiz etmə o rüxi-alinə nəzzarə, könül!

Sağəri hicr oduna yandı, könül, gəl getmə,
Baxgilən hicr oduna, bircə, şəbi-tarə, könül!

Firqətində, dilbərim, oldı könül qan, oldı, gəl!
Göz yaşımdan bu cəhanda səxt tufan oldı, gəl!

Sənsiz, ey dilbər, mənim hərgiz qərarım yoxdu, yox,
Ənbəri-zülfin kimi oldum pərişan, oldı, gəl!

Vəsldə gördün, fələk, hicranə qıldun aşina,
Bir nəzər qıl bu şəbi-tarimə, hicran oldı, gəl!

Can verüb yüz həsrətlə, can fəda qıldum sana,
Xak altında tənim həsrətlə pünhan oldı, gəl!

Qılduqun vəsl ilə tə’mir sərayi-eşqə bax,
Hicr gərdi-badilə oldı viran, oldı, gəl!

Eyşü cəşnim həmmü qəm oldı fəraqında, gözəl,
Xəndeyi-eşqim mənim yüz ahü əfğan oldı, gəl!

Xovfdan çıx, dilbərim, kim, Sağəridən yoxdu xovf,
Aşiqü mə’şuqlə çün əhdü peyman oldı, gəl!

Hüsnünə heyran olubdur gərçi yüz min əhli-dil,
Mən kimi onlar sana, ey dilrüba, heyran degil.

Hər könüldə olmaya şuri-məhəbbət dəhr ara,
Surəti-insanilə mövcud olub, insan degil!

Versə can hicran evində aşiq, mən' etməyin,
Atəşi-hicranə yanmaq, əhli-dil, asan degil.

Dərdim elə dərddir olmaz əlacı, ey təbib,
Çəkmə zəhmət dərdim üçün, qabili-dərman degil.

Çıxsun ol göz – eşqdə peyvəstə xunəfşan degil!
Yansın ol dil – fikri-vəslilə, nigarım, qan degil!

Candan əl çəkmək bana müşkil degil, ey dilrüba,
Vəsldən əl çəkmərəm, vəslin bana min can degil.

Bir zəman çıxmaz xəyalımdan nigarım, Sağəri,
Necə çıxsun xatirimdən, çıxmaqı imkan degil.

Bir çeşmi-məst aldı əlimdən qərari-dil,
Oldı əsir, məndə degil ixtiyari-dil.

Qıldı vətən ol zülfi-siyahında dilbərün,
Hərgiz yanımda yoxdu dəxi e'tibari-dil.

Könlümi qıldı şanə pərişan o zülf tək,
Yaran, nə növ'ilə keçən ruzigari-dil!

Pabənd olubdu rişteyi-zülfündə, neyləsin,
Xunxar dil, nizar dil, biqərar dil?

Gülzari-vəsl oldı xəzan, qalmadı əsər,
Heyhat! Ola vüsal ilə bir də bəhar dil!

Olmaz xilas türreyi-şəbrəngdən könül,
Yarun kəməndi-zülfünə olmuş şikar dil.

Kaş öldürəydi, Sağəri, hicran odı məni,
Yanmaq olubdı hicrdən o rində şüari-dil.

Aşiyani-səri-zülfündə dutub xanə könül,
Qıldı aşüftə məni şanə, dönüb qanə könül.

Xatirim zülf kimi oldı pərişan ki, çəkər
Gəh səba qüssəsi, gahi ələmi-şanə könül.

Zülməti-zülf ara oldı könül sərgərdan,
Cəhd qıldı nə qədər, çıxmadı bir yanə könül.

Günimi qarə edüb silsileyi-türrələri,
Verməsin kimsə dəxi zülfi-pərişanə könül!

Titrəşür həlqeyi-zülfində, dəgər bir-birinə,
Hər zəman zülfi-pərişanə dəgər şanə, könül!

Şanə, məşşatə, urub zülfə pərişan etmə,
Olmasın silsileyi-zülfdə divanə könül!

Küfri-zülfində könül kafər olub dutdı vətən,
Nə qədər cəhd elədüm gəlmədi imanə könül.

Sağəri, müxtəsər et zülf sözüni, tul etmə,
Bəhsi-barikdi, bilməz onı divanə könül.

Zülfə bax, gör nə pərişandı, könül!
Hər teli avizeyi-candı, könül!

Zülf içində dolanursan küstax,
Üzülür bir tel – min qandı, könül.

Vəslə yetsəm dəxi abad olmaz,
Firqətində elə virandı könül!

Ruhdur aşiqə ol qəmzə oxı,
Ursa canə, demə peykandı, könül.

Eyləmə bak ölümdən, ey dil,
Dəhəni çeşmeyi-heyvandı, könül.

Can fəda eylə o peykanə, dolan
Başına kim, sana mehmandı, könül.

Sağəri, ceşn elə kim, oldı vüsal,
Qəm sana çoxdu, firavandı könül.

Lə’lü ləbin tək, gözəl, lə’li-Bədəxşan degil,
Çöhreyi-safun kimi mahi-dirəxşan degil.

Şəm’ əgərçi yanar məhfil ara hər gecə,
Mən kimi hicran ara şəm’ də suzan degil.

Ahi-dilimdən mənim zülf pərişan olub,
Badi-səba dəgməyüb zülfə, pərişan degil.

Eşqi-rüxün pərvəriş verdi dilü canıma,
Olmasa bir təndə eşq, cism degil, can degil!

Yandıdı hicri-atəş canü dilim, ey təbib,
Dərdim elə dərddür – qabili-dərman degil.

Eşq odı yandurub cismü tənü canımı,
Cismimi dağ eyləyən atəşi-hicran degil.

Ruzi-əzəldən mənəm aşiqi-didar ona,
Eşqdən əl çəkməgüm, Sağəri, imkan degil.

Vəsl hicran oldı, ey dil, naləvü fəryad qıl!
Ləzzəti-ruzi-vüsalın zikr edəndə dad qıl!

Hicr odı yandırdı cismimü canımı, ey göz yaşı,
Qoyma yansın cismi-zarımı mənim, imdad qıl!

Yanmaqa taqət yoxumdı atəşi-hicran ara,
Ey əcəl, gəl sən məni bu qüssədən azad qıl.

Ey fələk, ya vəslə vasil qıl məni, ya canımı
Atəşi-hicranə yanmaqı tənə mö'tad qıl.

Zülfün içrə mürği-dil dutmuş vətən, ey gülbədən,
Xah zəcr et könlümə zülf içrə, ya kim şad qıl.

Atəşi-hicranda qoydun, ey könül, tənha məni,
Olma, qafil, bivəfa bu mürdə cismim yad qıl.

Sağəri bir bəndədir, sən padişahi-hüsnsən,
İltifat eylə ona, ya cəbr – min bidad qıl!

Ey dil, o zülfi-pürşikəni aşiyanə qıl!
Tirü xədəngi-qəmzəyə canın nişanə qıl!

Ol çeşmi-məst tərkini qılma cəhanda sən,
Tirü xədəngi-qəmzəni hər dəm fəsanə qıl!

Hicran güni nə növ' ilə olsa keçər, könül,
Fikrü xəyali-atəşi-hicri-şəbanə qıl!

Əl çəkmə kuyi-yaridən, ey dil, dolangilən,
Gər mane' olsalar sana, yüz min bəhanə qıl.

Yetməz əlin vüsalə dəxi, qət' qıl ümid,
Göz yaşını cəm' eylə, könül, bir xəzanə qıl.

Qanlu yaşım fəraqda qərq etdi cismimi,
Ey səngdil, nəzzarə bu hicranda qanə qıl!

Canan olubdu Sağəridən bədgüman bu gün,
Rəftarını nigarilə sən aşiqanə qıl.

Eşq sirrin bilməyən aləmdə əhli-dil degil,
Surəti-insandadır, insan degil, kamil degil.

Bir zəman çıxmaz xəyalımdan rüxi-alın sənin,
Qanə dönmüş dil xəyalından sənin qafil degil.

Hicr odına qeyri yandırma, məni yandırgilən,
Eşq odunda yanmaqa hər xamlər qabil degil.

Görməsəm ruyini, müşkildir bana ölmək bu gün,
Gər görəm ruyini, vermək can bana müşkil degil.

Ona aşiq olubdur yüz mənim tək rindü şeyda,
Mən kimi bu cümlədən bir kəs sana mail degil.

Ol dili yansın ki, yoxdur eşq odundan bəhrəsi,
Qanə dönsün ol könül kim, eşqinə qail degil.

Sağərini eyləmiş divanə eşqin hicrdə,
Görsə mən divanəni hər kim, deyər: aqil degil.

Bu nə şurü nə qovğadır salub dövranə, gül, bülbül?!
Xəzani-bimürüvvətdən yetübdi canə, gül, bülbül!

Gülüstan içrə qoymaz bağban pəs bimürüvvətdir,
Rüxin yadilə nalandır, batubdur qanə, gül, bülbül.

Vüsalından ayurma, qoygilən bir ləhzə şad olsun,
Təhəmmül eyləməz biçarədir hicranə, gül, bülbül.

O bülbül kim gülüstan içrə eylərdi fəğan hər dəm,
Olubdur mənzili bir cüğd tək viranə, gül, bülbül.

Xəzani-bimürüvvət gəldi gülzarı edüb bərhəm,
Fəraqın qüssəsi qılmış onı divanə, gül, bülbül.

Belə pabəstdir eşqində, fikri-aşiyan etməz,
Əsiri-damdır getsün necə bir yanə, gül, bülbül?

Muradım gül degil, bülbül degil, məhbubü aşiqdir,
Demə kim Sağəri yazmış bunı əfsanə: gül-bülbül.

Çöhrəsin gördüm könül oldı giriftar, ey həkim!
Neyləyim qoymaz gedüm kuyinə əğyar, ey həkim!

Yoxdu bir kəs dərdimi cananə izhar eyləsin,
Dərdimi bildün, sən et dildarə izhar, ey həkim!

Zəhmətin çəkdüm yetürdüm, dil bilən dəmdə, nedim,
Aldı əldən yarımı zülmlə əğyar, ey həkim!

Eşq alubdur canımı gör, bəstəri-hicran ara,
Dərdimin dərmanıdır lə'li-ləbi-yar, ey həkim!

Bu mərəzdən tapmanam səhhət, yəqinimdir mənim
Şərbəti-lə'li-ləbidir dərdi-bimar, ey həkim!

Əl götür dərdim əlacından, dəva yoxdur bana,
Çəkmə zəhmət, saldı bu dərdə məni yar, ey həkim!

Sağəri mə'yus olubdur, vəsldən kəsdi ümid,
Qasidim yoxdur, olubdur kar düşvar, ey həkim!

Hicran odunda qət' olub  zindəganlıqım,
Saldı məni bəla oduna bizəbanlıqım.

Hər kəs ki bais oldı, sana, eylədi cüda,
Düşsün fəraqə mən kimi, qansın fəğanlıqım.

Zəhmət çəküb bitürmişdim gülbini-gül,
Açılmamış hənüz gedüb bağbanlıqım.

Qıldı cüda fələk səni məndən nə zülmlə,
Bazari-həşrə qaldı mənim kamranlıqım.

Eşqində sərf eylədüm ömrümi, aqibət,
Məqbul qılmadı özünə pasibanlıqım.

Yıxdı evim rəqib, cüda qıldı yardən,
Olsun necə rəqibə mənim mehribanlıqım?

Pir olmuşam təriqi-məhəbbətdə, Sağəri,
Heyhat! Bir də dəstimə düşməz cəvanlıqım.

Tərəhhüm eyləməz, hərçənd gülrux yarə yalvarram,
Nedim bir güldən ötri hər zəman min xarə yalvarram.

Vüsalından olub məhrum hicran atəşi üzrə,
Fəğanü nalə ilə yaş töküb əğyarə yalvarram.

Səni görmək bana mümkün degil, bir rəhm yox səndə,
Səri-kuyində hər dəm mən dər-divarə yalvarram.

Məni yad eyləməz birəhm kafər, rəhm yox anda,
Töküb qanlu sirişkim səfheyi-rüxsarə, yalvarram.

Salubdur əqrəbi-zülfin, qəmər dövründə seyr eylər,
Qılub könlüm pərişan, zülfi-ənbərbarə yalvarram.

Könül murğini seyd etdi iki cəlladi-cadusı,
Xilas etməz, nedim, ol qəmzeyi-xunxarə yalvarram.

Səbahü şamımı qılmış bərabər zülfi-rüxsarı,
Gəhi ol sübhə, gahi türreyi-tərrarə yalvarram.

Doyubdur Sağəri canə, deyün dərdini canana,
Olubdur xanə viranə, gedüb küffarə yalvarram.

Həşrə qaldı söhbətim getdi əlimdən dilbərim,
Vəh nə dilbər: sərvqəddü mahruyi-ənvərim.

Hər zəman canan düşər könlümə, könlüm qan olur,
Neyləyim, bir kəs yoxumdur yarə ola rəhbərim.

Eylədüm pünhan könüldə dərdi-eşqin, ey gözəl,
Sirri-eşqi verməröm, gər getsə eşqində sərim.

Olmasın hərgiz cəhanda zindəganlıq aşiqə,
Qeyri-ahü nalə hicran içrə yoxdur yavərim.

Hiç kəs baxmaz yüzinə aşiqin, göz xar olub,
Çün məni saldun nəzərdən, dilbəri-məhmənzərim!

Tanımaz əsla əgər görsə məni ol dilrüba,
Atəşi-hicran təğyir etdi cismü peykərim.

Eşq odı yandırdı cismim, Sağəri, hicran ara
Öylə yandum həsrətində, qalmadı xakistərim.

Öz əlimlə vəsl evini səxt viran eylədüm,
Canımı məhbusi-qeydi-künci-hicran eylədüm.

Zülfi-canan eylədi könlüm pərişan türrə tək,
Mən də zülfi-yar tək xəlqi pərişan eylədüm.

Neçə müddət zəhməti-tə'lim çəkdim, aqibət,
Dilrüba nadanımı axır zəbandan eylədüm.

Qaçdı məndən yanə hər kəs kim, eşitdi naləmi,
Atəşi-hicran ara əzbəs ki əfğan eylədüm.

Etmədim canım fəda canane, ar olsun sana,
Ol zəman kim yarlə mən əhdü peyman eylədüm.

Firqətində qalmadı bir yer cəhanda sərbəsər,
Göz yaşımla, dilbərim, gəl gör, gülüstan eylədüm.

Saxladum canımı hicran atəşindən, yanmadı,
Sağəri, şükr eylə, axır yarə qurban eylədüm.

Hicran odunda yanmaqa yox tabü taqətim,
Hər dəm füzun olur qəmü əndühü möhnətim.

Qanımı tökmə qəmzeyi-xunrizi-çeşmlə,
Yoxdur təriqi-eşqdə hərgiz xəyanətim.

Aldun nigar yarımı əldən mənim, fələk,
Xunincigər olubdu mənim eyşü işrətim.

Qıldı qiyam sərvqəddim, eylədi xüram,
Baxdum o sərvqəddə, nə qopdı qiyamətim!

Qanlu sirişk, çöhreyi-zərdü dəmadəm ah,
Faş etdi əhli-aləmə eşqü məhəbbətim.

Can eylədüm fəda səri-kuyində itlərə,
Eşqində, ey gözəl, demə yoxdur dəyanətim.

Ruhim çıxaydı kaş bədəndən mənim o gün,
Ey Sağəri, çü oldı mənim qət' ülfətim.

Könül mürğini ol türreyi-tərrarə tapşurdum,
Dili-divanəni ol zülfi-ənbərbarə tapşurdum.

Zibəs fəryad qıldı mürği-dil, sinəmdə qan oldı,
Könül pərgaləsin qəmzeyi-xunxarə tapşurdum.

Mənim canü dilim, hərgiz, cəhanda görmədi rahət,
Təriqi-eşqdə canü dilimi yarə tapşurdum.

Könül, gəl tövbə qıl kim, bütpərəslikdən səmər yoxdur,
Dəxi, bəsdir, səni mən neçə il dildarə tapşurdum.

Bana müşkildü bundan böylə qalmaq dari-dünyadə,
Gülimi öz əlimdən mən verüb, əğyarə tapşurdum.

Atanda qəmzə oxın sinəmə min nazilə canan,
Xədəngü tirü peykanın dili-bimarə tapşurdum.

Alubdur dinü imanımı əldən, Sağəri, ol büt,
Edüb qəflət əcəb, imanımı küffarə tapşurdum!

Aldı əldən işvə ilə yar könlüm, neyləyim?
Atəşi-hicrə yanub qəmxar könlüm, neyləyim?

Hər zəman eylər təmənna şərbəti-lə'lin könül,
Təngə gəldi sinədə xunxar könlüm, neyləyim?

Eşq dərdinə düşüb, yoxdur əlacı könlümün,
Şərbəti-lə'li axtarur bimar könlüm, neyləyim?

Gülrüxüm əldən gedüb yoxdur ümidi-vəsl ona,
Güldən ötri xar istər zar könlüm, neyləyim?

Dinü imanın verüb ol nərgisi-şəhlasına,
Bütpərəst olmuş, nedim, küffar könlüm, neyləyim?

Düşdi dil rənci-xümarə, hüşyar olmaz dəxi,
Olmadı bu xabdən bidar könlüm, neyləyim?

Badeyi-eşq məni, ey Sağəri, sərməst edüb,
Həşrə tək olmaz yəqin hüşyar könlüm, neyləyim?

Mən qətili-tiği-eşqi-gül’üzari-sadeəm,
Verməgə can rahi-eşqində durub amadeəm.

Qəhr edüb mə’şuq getdi ömr tək, gəlməz dəxi,
Çəkmərəm əl damənindən, ta ki mən dünyadeəm.

Yüz qoyub xaki-rəhinə aşiqin min əczlə,
Dut əlimdən, rəhm qıl, ey sadə, mən üftadeəm.

Eşq qeydində müqəyyəd oldı ta könlüm quşı,
Canü dildən əl götürdüm mən, əcəb azadeəm.

Yandıdı kafər məni eşq atəşində, anladı
Əhli-imanəm, cəhanda mən müsəlmanzadeəm.

Canımı qıldum sipər tiği-fəraqə səbr edüb,
Canü dildən keçmişəm mən, ölməgə amadeəm.

Məst edübdür Sağərini badeyi-lə’li-ləbin,
Xəlqi-aləm belə bilmişlər: xərabi-badeəm.

Bütpərəslikdir cəhanda rəsmi-ayinim mənim,
Desələr kafər, qəmim yoxdur, budur dinim mənim.

Yarımı əğyarlə gördüm olubdur həmnişin,
Kaş olaydı kor bu çeşmi-cəhanbinim mənim.

Təlx keçdi ruzgarım firqətində, dilbərim,
Aqibət çıxdı tənimdən cani-şirinim mənim.

Qəhr edüb getdi kənarımdan nigari-məhvəşim,
Mümkün olmaz həşrə tək hiç yerdə təskinim mənim.

Ruyini görsəm olur təmkinü səbrim izdiyad,
Yarsız olmaz cəhanda hiç təmkinim mənim.

Vermədi təmkin bana dil eşq odunda yanmaqa,
Bülhəvəslik eylədi bu qəlbi-bidinim mənim,

Zindəganlıq etməz, hərgiz, cəhanda Sağəri,
Yar olubdur tazə qeyrə yari-dirinim mənim.

Qoy dağılsın yüzünə zülfi-siyəh, ənbərfam,
Mah rövşən görünür, olsa əgər leyl zəlam.

Getdi əldən, dəxi görməzsən onı ömrində,
Eyləmə vəsvəsə minbə'd sən, əndişeyi-xam.

Yoxdu təskinü qərarı, könül, bir yanda,
Harda dildar ola, can dutar orda aram.

Məni qorxutmagilən həşr günindən, zahid,
Aşiqə ruzi-qiyamət qəddidür, qılsa xüram.

Yetmədüm vəslinə mən şərh qılum dərdi-dilim,
Bu ümidilə günim keçdi, olub ömr təmam.

Qəhr edüb aşiqə mə'şuq neçün yad etməz,
Bürci-əqrəbdə dutubdur özünə mah məqam?

Baxmadı ruyimə lütflə bana qəhr etdi,
Sağəri qoydı yüzin dost ayağına müdam.

Gözin tək gözlərim nuri mənim bimardur, könlüm,
Cəmalın gülşənində əndəlibi-zardur könlüm.

Həzər qıl, urma şanə zülf zəncirinə, ey aqil,
Müsəlsəl zülfi-pürçinində Məcnunvardur könlüm.

Ləbü çeşmin xəyalı qanə döndərmiş könül mülkin,
Ayaği-badə tək qandan dolub sərşardur könlüm.

Xəyali-türreyi-pürçinilə şamım sabah olmaz,
Qəsəm ol türreyi-mişkinə, daim tardur könlüm!

Əcəb təqsim qıldum könlümi, hər şahidə verdüm,
Təsəvvür eyləmə, ey dilrüba, kim, vardur könlüm.

Nə cənnəti-şövq var bəndə, nə gülşəni-zövq var səndə,
Vüsalın getdi hicranda, əcəb gülzardur könlüm!

Könül mülkində andan qeyr yox bir kafəri-bədxu,
Onun eşqində bu kəz daima qəmxardur könlüm.

Xədəngi-qəmzəni qoymaz hədəfdən yanə rədd olsun,
Çəkər ahənrübanın kamına hüşyar olan[23] könlüm.

Gözümdə xab yoxdur, istirahət yox bana bir dəm,
Sənin fikrü xəyalinlə mənim bidardur könlüm.

Ənbərü mişki-zülfin, ənbərü xalin xəyalilə,
Dükkan açmış, təndə, gör, əcəb əttardur könlüm!

Qocalıq yayə döndərdi qəddün, ey Sağəri, leykən
Könül hərgiz qocalmaz, aşiqi-didardur könlüm.

---

[23] Olmalıdır: "huşyardır".

Çıxdı hicran atəşində aqibət canım mənim,
Atəşi-hicran içində oldı tufanım mənim.

Öldüdi bir qəm məni aləmdə, hərgiz, bilmədüm,
Qəhr qıldı, nə səbəbdən getdi sultanım mənim?

Qılmadı tə'sir ahım məhvəşi-səngindilə,
Dutdı çərxi-duni dudi-ahü əfğanım mənim.

Rəhm qıl aləmlərə, ağlatma çeşmi-zarımı,
Qərq edər aləmləri bu çeşmi-giryanım mənim.

Göz yaşımdan qıl həzər, ta kim səni qərq etməsin,
Mövcə gəlmiş firqətində bəhri-ümmanım mənim.

Canımı qıldum fəda canană neylim xəlq ara,
Demədi, hərgiz: cəhanda oldı qurbanım mənim.

Sağəri, hərgiz, cəhanda tapmadı məqsudini,
Olmadı bir gecə, olsun yar mehmanım mənim.

Ol qədr eşqində, dilbər, naleyi-dad eylərəm,
Şişə mülkin, aqibət, ahimlə bərbad eylərəm.

Könlümi şad eyləyən bil kim, vüsalındır sənin,
Öylə bilmə hicr evində könlümi şad eylərəm.

Sən yatarsan bəstəri-rahətdə, aqil, hər gecə,
Sübhə tək eşqində mən min ahü fəryad eylərəm.

Vəhmin andandır: məbada kim ola aşiq sana,
Cövrüni xəlqə deyüb, mən nalə bünyad eylərəm.

Atəşi-hicran məni az yandurur, təskin tapar
Hər zəman kim, vəsli-cananı mən yad eylərəm.

Səxttərdir atəşi-duzəxdən hicran atəşi,
Deməsin bir kəs ki, könlüm ona mö'tad eylərəm.

Sağəri, bəsdir, şikayət qılma hicrandan dəxi,
Az çəkər, hicran odundan oxın azad eylərəm.

Nə xoş zamandı ol dəm ki, yarə həmdəm idim,
Təfaxür eylərdüm öz-özimə xürrəm idim.

Nə dərdi-hicr bilürdüm, nə ahü əfğanı,
Öz aləmimdə şəhənşahi-külli-aləm idim.

Gözi gözümdə, əli əldə yar yanımda,
Vəsli-yari-vəfadarımıza məhrəm idim.

Təğafül etməzdi məndən ol vəfapərvər,
Vüsal məmləkətində əzizü əkrəm idim.

Fələk ayırdı məni gülşəni-vüsalından,
Behişt içində gəzərdüm bəsani-adəm idim.

Rəqib ayırdı məni vəsldən qılub məhrum,
Vüsal evində sərəfrazü bəs müəzzəm idim.

Nə xoş zamandı əyyami-vəsl, getdi, nedim,
O gülüstanda mən, Sağəri, mükərrəm idim.

Ol gün ki mən bu guşeyi-hicranə yetmişəm,
Yandırdı suzi-eşq məni, canə yetmişəm.

Yetdüm vüsali-yarə, yetişdüm muradıma,
Mən bütpərəst xaneyi-imanə yetmişəm.

Hicranda dil mərizdi eşqindən, ey gözəl,
Vəslin tapub, könül, necə dərmanə yetmişəm.

Qət’ etməzəm gözimi yüzündən, necə edüm?
Hicranda can verüb belə cananə yetmişəm.

Çox gecələr səbahə kimi yatmayub gözüm,
Min xuni-dil yeyüb belə qılmanə yetmişəm.

Çox xuni-dil əgərçi yedüm hicr evində mən,
Yüz şükr, imdi sən kimi sultanə yetmişəm.

Sənsən xəyalü fikrdə, xali degil könül,
Fikrinlə getdi Sağəri, hər yanə yetmişəm.

Əğyar təhrikilə qəhr eylədi nigarım,
Dildarsız, Xudaya, tar oldı ruzgarım.

Dami-vəfayə saldum ol ahuyü qəzal,
Qıldı xilas əğyar ol damdən şikarım.

Rəftarü hüsnü xülqi aramü səbrim aldı,
Tərk etməgə bu eşqi yox əldə ixtiyarım.

Gülzari-vəsl soldı, bilməm nigar noldı,
Hicran evində yandum, oldı xəzan baharım.

Ey mahru nəharım, vey sərvqədd yarım,
Tar oldı ruzgarım, sənsiz gedüb qərarım.

Qasid, tərəhhüm eylə, mən zarü natəvanəm,
Yarin yanında yoxdur bir zərrə e'tibarım.

Ey Sağəri, şikayət etmə o dilrübadən,
Təqsiri-bu'd sənsən, çox mehribandı yarım.

Axirət mənzilinə çünki olubdur səfərim,
Bilmərəm varı-yoqı, yoxdu özümdən xəbərim.

Dil düşüb silsileyi-zülfünə, zülmətdə qalub,
Nə qaranqu gecədir, hiç açılmaz səhərim!

Vəslini istəmənəm, hicrinə oldum mö’tad,
Yar olan yerdə, yəqindir ki, görünməz əsərim.

Hasilim olmadı eşqində sənin qeyr tə’əb,
Atəşi-eşqdə yandı dilü canü cigərim.

Bədənim lağər edüb atəşi-hicran, canan,
Gecə-gündüz ki səri-kuyinə düşməz güzərim.

Canımı nəzr elədüm, payinə qurban olsun,
Gər düşə çöhreyi-gülgununa ta ki nəzərim.

Eylədüm eşqini mən dildə xəfi müddətdir,
Sağəri, eylədi rüsvay məni çeşmi-tərim.

Qüdrətim olsaydı, tərki-eşqi-yar etməzmidim?
Eşqdə gər səbrim olsaydı, qərar etməzmidim?

Uydun əğyarə, məni saldun nəzərdən bisəbəb,
Xaki-payinə məgər mən can nisar etməzmidim?

Tapmadum bir əhli-dərdi dərdimi izhar edüm,
Tapsaydım əhli-dərdi, aşikar etməzmidim?

Vəslinə təhris edər hər ləhzə mə'şuq aşiqi,
Yoxsa mən təhsili-təmkini-vüqar etməzmidim?

Cəzbeyi-eşq çəkər hər yanda olsam kuyinə,
İqtidar olsaydı, mən tərki-nigar etməzmidim?

Görmədüm hərgiz vəfa mə'şuqə mə'şuqdə,
Olsaydı hər birində, ixtiyar etməzmidim?

Görmədüm mən e'tibari-şahidi-gülçöhrəsin,
Sağəri, olsaydı gər, mən e'tibar etməzmidim?

Bisəbəb qəhr eylədi, getdi əlimdən dilbərim,
Atəşi-hicran ara yandı mənim balü pərim.

Dad hicran atəşindən eylərəm mən həşrə tək,
Yandurub cismim, yelə verdi mənim xakistərim.

Səndən ayru aşiqə səbrü şəkib asan degil,
Neylim kim, atəşi-hicranə saldun bəstərim?

Tanımaz mə'şuq görsə aşiqin, oldur səbəb:
Yandurub hicran odı dağ eyləyübdür peykərim.

Yox ənisü munis hicran evində qeyr qəm,
Qanlu peykanlar olubdur könlüm içrə yavərim.

Olmadı hadi nigarın kuyinə, olsun bana
Eşq özi, bir mürşidi-kamildi, oldı rəhbərim.

Sağəri hicran evində padişahi-qəm olub,
Aləmi təsxir edübdür, şükrlillah, ləşkərim.

Dəhənin var-yoqın hiç güman etməz idim,
Bilsə idim onı yox, bağrımı qan etməz idim.

Bilsə idim ki qəmi-eşq olacaq xəlqə əyan,
Hər yetən xamə qəmi-eşq əyan etməz idim.

Gər bileydim dili-bimarimə eylər dərman,
Dərdi-eşqi bu könül içrə nihan etməz idim.

Bilmədim tə'neyi-əğyari səri-kuyində,
Beyti-hicranda olub, orda məkan etməz idim.

Anlasaydum gələcək yanıma min işvə ilə,
Göz yaşım səfheyi-rüxsarə rəvan etməz idim.

Vəsl məqdur bana olsaydı aləmdə,
Meyli-firdövsi-bərin, qəsdi-cinan etməz idim.

Bilmədüm yar mənim halimə olmuş vaqif,
Sağəri, bilsə idim ahü fəğan etməz idim.

Atəşi-hicrə olub dağ, yanubdur bədənim,
Od dutub yandı məzar içrə qəmindən kəfənim.

Göz qalub yolda, könül qanə dönüb, badi-səba,
Harda qaldı ki, dəxi gəlmədi vəchi-həsənim.

Firqətində demə kim eyşü nəşatım vardur,
Oldı gülgun könül qani ilə pirəhənim.

Və'də vermişdi gələ, gəlmədi, ya Rəbb, noldı?
Bilmərəm harda qalub, gəlmədi sərvi-çəmənim.

Yoxsa əğyarə olub yar, salubdur gözdən
Məni ol zülfi-müənbər, rüxi-gül, yasəmənim?

Görsə mə'şuq, yəqindir, tanımaz aşiqini,
Bəs ki hicran ələmi lağər edüb cismü tənim.

Yağsa gər, Sağəri, daş başıma kuyində xoşam
Ki, urar cənnətə min tə'nə nəimi-vətənim.

Hicran oduna yandı tənim, bilmədi halim
Ol mahrüxü sərvqədd tazə nihalim.

Ahim odı canana, nedim, etmədi tə’sir,
Tə’sir edüb aləmə ənduhi-məlalim.

Hicranda yanar cismi-zəifim gecə-gündüz,
Mənzur bana vəsldi, yox fikrü xəyalim.

Ayırdı məni düşməni-xunxar gülümdən,
Qanımı töküb, cəm’ qılub vizrü vəbalim.

Gülzari-səri-kuyinə uçmaq dəxi olmaz,
Sındı qəfəsi-eşqdə yoxdur pərü balim.

Olmaz bana məqdur vüsali, bu yəqindir,
Çün ləşkəri-hicran dağıdub cah-cəlalim.

Hicran sitəmi Sağərinin qəddin əgibdür,
Qəm aldı könül mülkini, yox eyşə məcalim.

Gör necə yıxdı evim zülmlə əğyar mənim,
Qanımı istər içə yari-dilazar mənim.

Yardur fikrü xəyalim, bana bir mətləb yox,
Yarımdan qeyr degil kim, qərəzim var mənim.

Görməsə çöhreyi-gülgun, gözüm ağlar qan,
Nə bu gün, həşrə kimi gözlərim ağlar mənim.

Bu xəyal ilə ki, mən bir gecə vəslini tapub,
Zülfi-şəbrəng edübdür günümi tar mənim.

Dinü imanı alub nərgisi-məsti məndən,
Ənbəri-zülf salub boynuma zünnar mənim.

Vəsldən qət'i-ümid oldı könül hicranda,
Həşrə tək ağlayacaq bu dili-bimar mənim.

Necə məxfi eləsin Sağəri eşqin ələmin?
Eşqimə vaqif olubdur dər-divar mənim.

Gəlmədi, göz qaldı yolda, ey fələk, yarım mənim,
Allah! Allah! Necə keçsin bu şəbi-tarım mənim?

Görməsəm bir dəm rüxi-cananı, müşkildür bana,
Sübhətək qan-yaş tökər bu  çeşmi-bidarım mənim.

Yandıdı eşq atəşinə cismi-canım, gəlmədi,
Harda qaldı, bilmərəm, yari-vəfadarım mənim.

Nəzr qıldum canımı qurban edüm, gəlsə əgər
Beyti-hicranıma yüz naz ilə dildarım mənim.

Görməsəm ruyini bir dəm, Həqq şahiddir Özi:
Həşr olunca nalə eylər bu dili-zarım mənim.

Urmaram mən vəsldən dəm, gər uram canım çıxar,
Ta ölüncə hicrdir hər ruz göftarım mənim.

Sağəri divanə oldı çün səri-zülfin görüb,
Tiri-qəmzə olmadı bir ləhzə qəmxarım mənim.

Düşübdür atəşi-hicranə könlüm,
Salubdur vəlvələ imkanə könlüm.

Genə gördi o zülfi-ənbərin,
Olub şeyda genə divanə könlüm.

Görüb şəm'i-cəmalını münəvvər,
Dolanur başına pərvanə könlüm.

Əsiri-türreyi-tərrarun oldı,
Məni atdı kənarə, yanə könlüm.

Səri-zülfündə könlüm görmədi gün,
Şəbi-zülfündə doydı canə könlüm.

Genə zülfin görüb divanə oldı
Bu axır ömrdə fərzanə könlüm.

Yetişməz, Sağəri, fəryadə bir dəm,
Doyubdur yoxsa bəndən canə könlüm?

Eşqi-ruyin aldı əldən ixtiyarım, ey sənəm!
Çeşmi-məxmurin alub dildən qərarım, ey sənəm!

Yoxdu hiç yerdə qərarım qeyr kuyindən bana,
Kaş olaydı ol səri-kudə məzarım, ey sənəm!

Xatirindən eyləmə hərgiz fəramuş aşiqin,
Qıl təzəkkür harda qalmışdır şikarım, ey sənəm.

Badi-zülm əsdi, gülüstani-vüsal oldı xəzan,
Naümid oldum, dəxi olmaz baharım, ey sənəm.

Beyti-hicranımda gör cah-cəlalim rövnəqin,
Xuni-dil oldı mənim şamü nəharım, ey sənəm.

Az qalub divanə olsun aşiqin, ey dilrüba,
Rəhm qıl bir aşiqi-nalanə, yarım, ey sənəm!

Az qalub ömrüm təmam olsun təriqi-eşqdə,
Sağəriyə rəhm qıl, ey gül'üzarım, ey sənəm!

Fikrim budur gedüb genə mən yarə yalvarım,
Ol çeşmi-məst, qəmzəsi xunxarə yalvarım.

Hicranməriz oldı, könül zarü xəstədir,
Əğyarə yalvarım, dili-bimarə yalvarım?

Dərdi-dilimə hiç təbib etmədi əlac,
Yaran, nedim, o qəmzeyi-dildarə yalvarım?

Ey şanə, zəcr qılma könlümə, zülfündə dilbərün
Qoy bir doyunca türreyi-tərrarə yalvarım.

Mə'şuq, dil – hər ikisi oldı ədüvv bana,
Mən yarə yalvarım, dili-əfkarə yalvarım?

Gülzari-vəsl oldı xəzan badi-hicrdən,
Oldı xəzan gülim, gedirəm xarə yalvarım.

Ey kirdgar, görmə bu zülmi rəva bana,
Yarımdan ötri mən necə əğyarə yalvarım?

Etsin xilas hicr qəmindən səni bu gün,
Qoy, Sağəri, o qəmzeyi-xunxarə yalvarım.

Həqq Özi agahdır kim, mən sənin heyranınam,
Keçmişəm candan təriqi-eşqdə qurbanınam.

Canü dildən keçmişəm eşqində, ey məhvəş, sənin,
Hökm qıl, ey dilrüba, mən bəndeyi-fərmanınam.

Ta tənimdə var həyatım çəkmənəm əl eşqdən,
Eşq bir candır bana, məhbub, sərgərdanınam.

Can çıxar təndən gedər, axır nəfəsdir, rəhm qıl,
Vəsl evində, bimürüvvət, mən sənin mehmanınam.

Qönçə tək açulmadı könlüm təriqi-eşqdə,
Bais oldur: arzuməndi-ləbi-xəndanınam.

Qılma məndən çöhrəni məxfi, əyan eylə görüm,
Xəlqi-aləm cümlə bilmişdir – sənin heyranınam.

Çeşmi-məstin məst edübdür Sağərini, ey gözəl,
Mən xərabi-çeşmi-məsti-nərgisi-fəttanınam.

Mənəm kim, Turi-vəhdətdə düşüb, didarə həsbəndəm,
Təcəlli eyləyən gülçöhreyi-dildarə həsbəndəm.

Təcəlli eyləyüb Həqq, ruyi-məhvəşdə olub zahir,
Ançun çöhreyi-gülnari-rüxsarə həsbəndəm.

Züleyxa tək səni pir eylədi eşqində Yusifvəş,
Qayıt Həqq canibə, mən belə rəftarə həsbəndəm.

Çü yoxdur hasili eşqi-məcazun qeyri-xiffətdən,
Həqiqət gülşənin seyr eylə, ey dil, yarə həsbəndəm.

Təcəlli eyləyüb rüxsari-məhvəşlərdə Həqq, andan
Həmişə talibi-məhtəl'ətü didarə həsbəndəm.

Əzəl məhbubinə gəl aşiq ol, ey dil, xoş aləmdir
Ki, əsla hicr yoxdur, mən belə gülzarə həsbəndəm.

Olubdur Sağəri məsti-meyi-vəhdət əzəl gündən,
Ançun nərgisi-caduvəş, xəmmarə həsbəndəm.

Qəbrə getdüm həsrət ilə dust nurin görmədüm,
Sahibi-əsrü zəmanın mən zühurin görmədüm.

Şişə tobraqın qəza qəmdən qılub təxmirini,
Bu vilayət xəlqinin eyşü sürurin görmədüm.

Əksəri tabe’ olub şeytanə, dindən əl çəküb,
Həqq canibə mən bir kəs mürurin görmədüm.

Əhli-dil nayab olub bu şəhrün içrə, yoxdu, yox!
Bu vilayət içrə mən bir kəs şüurin görmədüm.

Qalmayub İslamdən hərgiz əsər, bir adı var,
Gərçi derlər var, əsla mən hüzurin görmədüm.

Cümləsin gördüm – qürurü kibrdə kamildilər,
Tapmadum bir əhli-dil – kibrü qürurin görmədüm.

Sağəri ömri təmam oldı bu viran Şişədə,
Qəmdə mən əsla özim kimi səburin görmədüm.

Şişənin əhlində mən hərgiz dəyanət görmədim,
Aşina oldum təmamilə, sədaqət görmədim.
Alimü zahidlərində yoxdı bir Həqq canibi,
Damü təzvir, hiylədən qeyri halət görmədim.
Çox namaz etdim cəmaətlə xüşui-qəlblə,
Leyk axırda imamında imamət görmədim.
Kinü buğzü hiyləni gördüm imamında tamam,
Hiylədən qeyri o şeytanda ibadət görmədim.
Cümlə mə'mumi edər İblisə guya iqtida,
Cümlə mə'qulində mən qeyr əz səfahət görmədim.
Əhli-din nayab olub, məzhəb itüb bu şəhrdə,
Vaizi-bədtinətində qeyr bid'ət görmədim.
Tazə məzhəb xəlqə iğva eyləyüb təşrih edər,
Xaliqi-yekta üçün qeyr əz şərakət görmədim.
Bir-birinin qətlinə fərman verüb təkfir edər,
Hiç millət içrə mən bir belə adət görmədim.
Bir-birinə iftira, böhtan dedilər cümləsi,
Ömrüm axır oldı, böhtanə nihayət görmədim.
Bu xərab olmuş Qarabağ içrə hörmət qalmayub,
Mən bu əhlin cümləsində hiç hörmət görmədim.
Şişə əhli cindir, təsxir edüblər Şişədə,
Bu şəyatinlər arasında bir ülfət görmədim.
İnziva qıldum xəlayiqdən o gün kim, Sağəri,
Hər nə gördüm anda gördüm, belə ne'mət görmədim.

Atəşi-hicrdə mən öylə pərişan degiləm
Ki, biləm canımı mən candı, ya can degiləm.

Bu qədər atəşi-hicrinə yandırma tənim,
Yanmışam eşq odına, layiqi-hicran degiləm.

Məni qorxutma cəhənnəm odı ilə, vaiz,
Yandurub eşq məni, calisi-niran degiləm.

Cinsi-eşqi xərid eyləmişəm xanə, könül,
Nəqdi-canım ala gər dust, peşiman degiləm.

Küfri-zülfündə könül kafər olubdur, kafər!
Bütpərəstəm mən, dindar müsəlman degiləm.

Yüzümə gül, məni dindirgilən, ey qönçədəhən,
Kim deyübdür, gözəlim, mən sana heyran degiləm?

Atəşi-hicrə könül öylə edübdür adət,
Sağəri, hicrdə mən talibi-canan degiləm.

Qan oldı könül qönçeyi-xəndanun əlindən,
Gün görməmişəm zülfi-pərişanun əlindən.

Yer qalmadı köksümdə – dolub qəmzə oxundan,
Fəryad edirəm hər gecə peykanun əlindən.

Dil kətm edər eşqini bu sinədə daim,
Fəryad edərəm dideyi-giryanun əlindən.

Yüz qoydum ayağına dutub daməni-pakin,
Çəkdi ətəgin büt bu müsəlmanun əlindən.

Neylüm, kimə dərdimi deyüm, yoxdı əlacım,
Qan oldı könül qəmzeyi-fəttanun əlindən.

Qalmaq bu cəhanda nə rəva mən kimi pirə?
Qədd döndi kəmanə məhi-Kən'anun əlindən.

Saqqal aqarub, Sağəri, qədd döndi kəmanə,
Fəryad, aman, dad, bu hicranun əlindən!

Ur şanəni ol zülfi-pərişanə, dağılsun,
Dillər tökülüb cümlə biyabanə dağılsun.

Vermə bana sən və'deyi-vəsli, həzər eylə,
Qorxum budu kim, xəlqə bu əfsanə dağılsun.

Çak eyləmə qətlimdə giribanü üzarın,
Açma o qədər ruyini, peykanə dağılsun!

Cəm' eyləmə zülfi, yüzünə eylə pərişan,
Qoy  əbr kimi mehri-dirəxşanə dağılsun.

Beyti-mihəni-hicrdə yandı dili-zarım
Ey vəsl, mədəd qıl ki, bu kaşanə dağılsun!

Min dil cəm' olub zülfi-pərişanına mənsiz,
Qoy ah çəküm, hər biri bir yanə dağılsun.

Hicran ələmi qıldı fəramuş vüsali,
Ey Sağəri, ah eylə, bu viranə dağılsun.

Yüzündən al niqabın sal yerə, gül şərmsar olsun,
Gülüstan içrə güllər həsrətindən xarü zar olsun.

Könül mürği pərişan zülf ara hiç olmadı eymən,
Mənim könlüm kimi, ya Rəbb, o zülf biqərar olsun!

Rəqibi-rusiyəh qıldı məni məhrum vəslindən,
Rəqibin xanəsi zülfin teli tək tarü mar olsun!

Qənimət bil bəhar əyyamını, ey dil, fəğan eylə!
Vəfa yoxdur bu ömrə, il dolansın növbəhar olsun.

Yüzin gördün neçün can vermədün, ey aşiqi-sadiq?
Təriqi-eşqdə candan keçüblər, sana ar olsun!

Soruşdum əhli-dildən aşiqü mə'şuq rəftarın,
Dedilər: olmayub aləmdə aşiq bəxtiyar olsun.

Məni hər kim ki xar etdi, gözümdən nur tək getdi,
Oni də mən kimi, ya Rəbb, cəhanda xar-zar olsun!

Əcəl peyki giribanım dutub canım alan vəqtə
Rəqəm qıldum bu şe'ri mən, cəhanda yadigar olsun.

Dəxi nəzm eyləmə, ey Sağəri, şe'rü qəzəl bəsdir,
Cəhan əhlinə sirrin, qorxuram kim, aşikar olsun.

Bürci-əqrəbdən neçün, ey mahtəl’ət, çıxmadun?
Aşikar etdün məni, ey bimürüvvət, çıxmadun?

Naümid etdün məni vəslindən, ey sərvi-rəvan,
Aşiqə oldı fəraqında qiyamət, çıxmadun.

Görmədüm ruyin təsəlli hasil olsun könlümə,
Aldı cismü canımı bari-küdurət, çıxmadun.

Ol qədər baxdum görüm ruyini, məqdur olmadı,
Öldidi cismi-zəifmi bu həsrət, çıxmadun.

Cəzbeyi-eşqin çəkər, yoxdur əlimdə ixtiyar,
Kuyinə hər ləhzə, neylüm, sərvqamət, çıxmadun.

Çox dolandum kuyini bəlkə görəm rüxsarını,
Görmədüm ruyini mən, etdün xəyanət, çıxmadun.

Sağəri fəryad edər kuyində, ey  kafər, sənin,
Etmədün bir rəhm, ey kani-məlahət, çıxmadun.

Gər dutam bir də əgər ol büti-rə’na ətəgin,
Qoymaram bir də əlimdən çəkə ziba ətəgin.

Eşqi-Leylivəş edübdür məni Məcnuni-cəhan,
O səbəbdən dutaram sidqlə Leyla ətəgin.

Məni kafər elədi eşqi-büti-gülçöhrə,
Dutmanam bir də mən ol kafəri-tərsa ətəgin.

Qoymadı eşq məni-Vamiq baxsın gözünə,
Yetmədi əl ki, dutam dilbəri-Əzra ətəgin.

Ömrdə olmadı məqdur bana aləmdə
Ki, dutum şövqlə mən ömrdə, əsla, ətəgin.

Xak tək düşdüm ayağına dutam damənini,
Anladı mətləbi, çaldı belə əmda ətəgin.

Oldı meyxaneyi-eşqin bana məskən, dilbər!
Sağəri sidqlə dutdı meyü səhba ətəgin.

Və'də verdün bəs neçün, ey gül'üzarım, gəlmədün?
Yandudun hicran oduna, ey nigarım, gəlmədün?

Atəşi-hicranə qıldun mübtəla cismü tənim,
Çıxdı ərşə hicr ara fəryadi-zarım, gəlmədün.

Sən görən aşiq degil imdi, qəmə həmrah olub,
Tar olubdur firqətində ruzgarım, gəlmədün.

Bir də görsəm ruyini, canımı qurban eylərəm,
Atəşi-hicran təmam etdi qərarım, gəlmədün.

Öldürür axır məni eşqin, fəqirəm, rəhm qıl,
Və'deyi-vəsl eylədün, ey şəhsüvarım, gəlmədün.

Arzuyi-zülfü ruyində keçirdüm ömrümi,
Firqətində bir olub leylü nəharım, gəlmədün.

Ruzi-vəslin həşrə qaldı gər tapam mən, ya nəsib!
Həsrətilə Sağəri can verdi, yarım, gəlmədün!

Görməsəm gər mən bu gün ol dilbəri-rə'na yüzin,
Aləmi viran edər əşkim, dutar dünya yüzin.

Kuçə içrə nagəhan tuş oldı dildarım bana,
Gördi ruyi-zərdimi, döndərdi ol tərsa yüzin.

Çöhrəsin göstərmədi hərgiz bana ol səngdil,
Göstərdi əğyarə hər dəm ol büti-ziba yüzin.

Atəşi-hicran kəbab etdi vücudum yandıdı,
Bəxt yar olmaz görəm mən ol mələksima yüzin.

Səndən ayru ol qədər qan ağladı göz mərdümi,
Qanlu yaşım mövc urub sürx eylədi dərya yüzin.

Nə deyübdür, bilmərəm, əğyar yarə tazədən
Döndərür hər dəm görəndə yar istiğna yüzin.

Görmədüm didari-yari, Sağəri, mən ömrdə,
Ta alam kami-dilim, bir dəm görəm bəyza yüzin.

Əlim üzüldi, nedim, yari-mehribanımdan,
Təğafül eylədi bu çeşmi-xunfəşanımdan.

Çıxaydı ruh tənimdən, tənim olaydı ədəm,
O gün ki qəhr qılub getdi yar yanımdan!

Dutubdı bəndü rəgü ruhi-cismimi eşqin,
Qiyamətə kimi çıxmaz bu xəstə canımdan.

Xədəngi-qəmzə tənim çak-çak edüb, ey gül,
Zəminü xak olub sürx rəngi-qanımdan.

Bu canımı çıxarun cismdən, xilas qılun,
Çıxarmın oxunı cismi-natəvanımdan!

Könüldə navəkü peykanı ruhdur canə,
Ayırmın onı bir ləhzə cismü canımdan.

Yetür vüsalə bu gün Sağərini, ey qasid!
Cəhan əhli yanubdur mənim fəğanımdan.

Şikayət eylədüm əzbəs ki, zalım ruzi-hicrandan,
Qoyub həsrət vüsalə ruhimi, qıldı cüda candan.

Vüsalında təğafül eyləyüb, zikri-behişt etdüm,
Behiştün qapusin açdı bana çaki-giribandan.

Könül dutdı vətən zülfi-siyahın, eylədi məskən,
Cəhanda görmədüm bir gün kərəm zülfi-pərişandan.

Gedübdür qasidim gəlməz, könül titrər, gözüm ağlar,
Xudaya, noldı, qasid gəlmədi ol türfə canandan?

Yüzini gördim təsəlli almadı dil vəsldə, hərgiz,
Necə alsın təsəlli, doymaq olmaz vəsli-canandan.

Əritdi atəşi-eşqim könüldə tiri-peykanın,
Xəcalət eylədün, ey dil, məni ol tiri-peykandan.

Dəxi müşkil olubdur zindəganlıq, Sağəri, canə,
Kəsübdür qismətim dövri-fələk ol tiri-müjgandan.

Bilmədim mən eşqdə könlüm pərişan olduğın,
Meyl etməzdim ona, bilseydim hicran olduğın.

Vəsli-yarə eyləməzdim meyl, bilseydim əgər,
Bilməmişdim atəşi-hicrə cigər qan olduğın.

Nagəhan gördüm yüzini, titrədi canü könül,
Eylədüm mə'lum dildarım peşiman olduğın.

Canü dil istər səni, hər dəm dolansın başına,
Vəsl əl verməz bana, neylim dilü can olduğın?

Səcdə qıldı taqi-əbruna könül təsdiq edüb,
Eylədüm mə'lum könlüm əhli-iman olduğın.

Küfri-zülfin gördi röhban əl çəküb zünnardən,
Bilmədi kafər bu zülfün kafəristan olduğın.

Olmuşam bir kafəri-bidinə aşiq Şişədə,
Sağərini öldürür, bilsə müsəlman olduğın.

Hicr odı saətbəsaət eşqimi eylər füzun,
Çöhreyi-zərdim qılubdur qanlu yaşım ləlagun.

Ayırub çərxi-fələk səndən məni, qıldı cüda,
Ey Xuda, olsun görüm bu çərxi-dun sərnigun!

Hardasan, ey vəsl, yandum atəşi-hicranə mən,
Tap məni, mən bikəsəm, ey vəsl, halimdir zəbun.

Necə kim eşqində yandırdun, səni Həqq yandusun!
Dərdə qılsın mübtəla mən tək səni də çərxi-dun!

Qət'i-ümid etdim vüsalindən, gözüm qan-yaş tökər,
Gəl gör, ey zalım, şəbi-hicranım olmuş bəhri-xun.

Əşki-çeşmimdən həzər qıl, ta səni qərq etməsin,
Mövc urar çeşmim, gəlübdür cuşə bu dəryayi-xun.

Sağərini mən' edərsən eşqdən, ey dilrüba!
Hüsni-əxlaqın mənim eşqimə oldı rəhnümun.

Mən kimi kafər də eşqində pərişan olmasun!
Hicr evində didəsi giryan, cigər qan olmasun!

Böylə kim hicran evində yandı canım, ey fələk!
Kafəri də mən kimi pabəndi-hicran olmasun!

Aşiqi ayırdular mə'şuqdən min zülmlə,
Gör nə zülm olmuş bana, bir belə dövran olmasun!

Yansın ol dil – olmayub aludə eşqinin sənin!
Ölsün ol can – şövqlə payəndə qurban olmasun!

Əzm qıldı qətlimə ol kafəri-bidin, məst,
İstərəm Həqqdən: bu əzmindən peşiman olmasun!

Keçmişəm bu cani-dildən mən səbili-eşqdə,
Aşiqə canan gərək hicran ara, can olmasun!

Eylədün divanə eşqində məni, ey səngdil!
Sağəri tək hüsnünə bir kimsə heyran olmasun!

Məni əğyar ayırdı zülmlə ol sərvqamətdən,
Müsəlsəlmuy, gülruy xocəstə mahtəl’ətdən.

Cəhənnəm atəşindən tiztərdir atəşi-hicran,
Necə tab eyləsin cismim, düşübdür tabü qüvvətdən.

Qiyamətdən məni qorxutma, vaiz, qorxmuram andan,
Qəddi dildarımın, vaiz, əlamətdir qiyamətdən.

Dəxi tə’sir qılmaz cismimə tirü xədəng, hərgiz,
Olub bir qəl’eyi-möhkəm bana səngi-məlamətdən.

Kəsəydi başımı bir dəf’ə tiği-tiz ilə, ey kaş!
Edəydi canımı rahət mənim bu bari-möhnətdən!

Dutubdur çərx üzin ahim, dağıldı şövkətü cahim,
Salub gözdən məni şahim, yanar canım bu həsrətdən.

Həzər qıl, ey könül, ol sərvqədd mahmənzərdən,
Vəfa yoxdur sana, ey Sağəri, ol sərvqamətdən.

Neçə gündür olub qafil şəhim xeyli-gədalərdən,
Niyə qıldun təğafül, səngdil, bu binəvalərdən?

Fələkdən qılmazam hərgiz şikayət mən, nə yarımdan,
Şikayət eylərəm mən bəxtdən, həm aşinalərdən.

Nigarım tifldir, bilməz qəmi-eşqimi, qafildür,
Ançun incidir hər dəm məni zülm, cəfalərdən.

Vəfa rəsmini tərk etdi nigarım, qəhr edüb getdi,
Könül, əl çək sən, bəsdir, bu növ' bivəfalərdən.

Məni hər kimsə yandırdı, fəraqın odına yansun!
Mənim tək olmasun məhfuz bu dərdü bəlalərdən!

Xəta qıldı nigarım, bivəfa oldı vəfasından,
Səni məhfuz qılsun Həqq Özi cümlə xətalərdən!

Olubdur Sağəri, bimari-hicran, yox ona dərman,
Xilas etsün məni Xaliq bu dərdi-bidəvalərdən!

Ol zəmandan kim məni məhbusi-hicran eylədün,
Ənbəri-zülfin kimi könlüm pərişan eylədün.

Tökmədün yalquz mənim qanımı nazü qənclə,
Şiveyi-rəftarlə hər ləhzə min qan eylədün.

Eylədün, dilbər, vüsalindən məni məhrum, leyk
Oda saldun canımı, əğyarı mehman eylədün.

Bivəfa, hicran odunda yandudun cismim mənim,
Rəğmimə sən qeyrlə seyri-gülüstan eylədün.

Vəsldə qıldun nəvaziş könlümi[24] bir neçə gün,
Hicrə saldun aqibət könlüm, peşiman eylədün.

Göstərüb əğyarə ruyin, lütfi-bihədd eyləyüb,
Gözlərimdən çöhreyi-mahini pünhan eylədün.

Sağəri düşdi ayağdan canını təslim edüb,
Cameyi-gülgunlə çün əzmi-cövlan eylədün.

---

[24] Haşiyədə: "sən məni"

Aşiqi zindani-eşqində giriftar eyləyən,
Qafil olmaz bir zəman dərdiylə bimar eyləyən.

Atəşi-eşqində canımı əritdün mum tək,
Bivəfa olma, bana, ey ərzi-rüxsar eyləyən!

Eylə pünhan eşqimi, ey dil, əyan etmə onı,
Aşiqi-sadiq degil eşqini izhar eyləyən.

Xar edüb əğyar yanında məni ol səngdil,
Xar olsun aşiqin dəhr içrə hər xar eyləyən!

Qövlimi rədd eyləsin hər müddəi insaflən,
Kimdü aləmdə xəzan mülkini gülzar eyləyən?

Qafil olma aşiqindən atəşi-hicran ara,
Ey məni hicran evində didəbidar eyləyən!

Aşiqü mə'şuq xud sirr bilmə – Həqqdəndir bu iş,
Sağəri, Həqqdir səni eşqində hüşyar eyləyən.

Məh cəmalın dövrünə zülfin pərişan eylədin,
Tirə etdün ruzgarım, qəsdi-iman eylədin.

Məst çıxdun, nazlə cövlan edüb etdün xüram,
Sən nə qatilsən – dönüb baxduqda min qan eylədin!

Vəsldən məhrum qıldun aşiqi, kafər, neçün
Zülmlə məhbusi-qeydi-künci-hicran eylədin?

Qəhrlə baxdun yüzimə, titrədi canü könül,
Şövqüm əfzun oldı kim, qəsdi-dilü can eylədin.

Bəzmi-vəslindən məni məhrum qıldun bisəbəb,
İltifatın xanına əğyarı mehman eylədin.

Eylədin rövşən cəmalın mahini aləmlərə,
Mən nəzər qılduqda məndən ruyi pünhan eylədin.

Dərk qılmaz Sağəri nikü bədin, hərgiz, bu gün,
Şərbəti-lə’li ləbindən məstü heyran eylədin.

Səni, ey sərv, görüm xaklə yeksan olasan!
Zülf tək dərhəm olub zarü pərişan olasan!

Belə kim sən məni hicranda pərişan qoydun,
Gülməsin hiç yüzin, daxili-hicran olasan!

Səni bir dərdə giriftar eləsin İzədi-pak,
Mən kimi ah çəküb, hicrdə büryan olasan!

Yandudun şəm’ kimi canımı hicran gecəsi,
Şəm’ tək sübhə kimi hicrdə suzan olasan!

Damənin dutsun əcəl, aşiqini qurtarsun,
Tirə xak içrə görüm kim, səni pünhan olasan!

Məni heyran elədün hüsnünə sən, ey kafər!
Sən də mən tək birinə valehü heyran olasan!

Yandudun balü pərim hicr oduna, ey kafər!
Sağəri tək səni də atəşi-suzan olasan.

Gərçi mən gördüm cəhanda vəsli-yarin ləzzətin,
Min onun tək çəkmişəm hicranda hicran xiffətin.

Vəsldə aşiq nəşatü bəhcəti əfzun idi,
Hicr odı məhv etdi dildən ruzi-vəslin bəhcətin.

Dövləti-vəsli əlimdən aldı bu kəcru fələk,
Nəkbəti-hicran ara könlümə saldı möhnətin.

Can verüm min şövqlə payində, qurban eyləyim,
Nəzr qıldum, gər görəm o mahtəl’ət təl’ətin.

Getdi əldən daməni-vəsli, ümidim kəsmişəm,
Qaldı ruzi-həşrə, ey dil, dilbər ilə söhbətin.

Xabdə bir də görərsən vəsli-yarı, ey könül!
Gəldi əyyami-küdurət, getdi eyşü işrətin.

Bu həyatımdan məmatım, Sağəri, xoşdur bana,
Böylə kim mə’şuq kəsdi aşiqindən ülfətin.

Ey könül, məhv eylə dildən vəsli-canan surətin,
Nəqş qıl qəlbində bundan belə hicran surətin.

Adət eylə, ey könül, hicran odunda yanmaqa,
Gəl fəramuş eylə ol mahi-dirəxşan surətin.

Yox vəfası dilbərün, hərgiz, vəfa etməz sana,
Eyləmə, hərgiz, təmənna mehri-taban surətin.

Kafər oldun zülfi-pürçinində, ey dil, tövbə qıl,
Gəl çıxar dildən bu gün zülfi-pərişan surətin.

Ey könül, eşqi-həqiqətdən dəm ur, bir Həqqi tap,
Xatirindən məhv qıl ol mahi-Kən’an surətin!

Yandıdı pərvanə tək balü pərin hicr oduna,
İstəmə hərgiz cəhanda şəm’i-suzan surətin.

Gəl həyatından götür əl, Sağəri, xoşdur məmat,
Arzu qılma ləbi-lə’lü zənəxdan surətin.

Səni, ey şux, görüm eşqə giriftar olasan!
Atəşi-hicr ara dərd çəküb, xar olasan!

Həqqdən istəmişəm kim, səni rüsva qılsın,
Bəd əməldə dutub əl, şöhreyi-bazar olasan!

Gedüb əğyarə olub yar, vəfadar oldun,
Əhd qıldun ki, bana yari-vəfadar olasan.

Məsti-çeşmin necə kim eylədi bimar məni,
Bəstəri-atəşi-hicranda bimar olasan.

Yandudun atəşi-hicranə məni, ey zalım!
Yanasan sən də mənim tək oda, qəmxar olasan!

Min cəfavü tə'bü dərd çəküb aləmdə,
Yetdim mən səni kim, yar, bana xar olasan?

Niyə saldun nəzərindən məni sən, ey kafər!
Düşəsən sən də nəzərdən, gözəlim, xar olasan!

Gözlərimdən kəsilüb xab şəbi-hicranda,
Sağəri tək səni də hər gecə bidar olasan!

Həzər qıl aşiqin, mə’şuq, çeşmi-əşkbarından,
Təğafül qılma, zalım, hicr evində ahü zarımdan.

Təriqi-eşqdə ölmək asandur, səadətdir,
Bu müşkildir, ola aşiq cüda bir ləhzə yarından.

Məgər rəhmi Xuda xəlq etməyüb qəlbində, ey kafər,
Məni görcək qaçub üz döndərürsən biqərarından?

Sana kim eylədi tə’lim bu rəftarü göftarı:
Görəndə aşiqin qaç, yanə çıx sən rəhgüzarından?

Bana mümkün degil eşqindən əl çəkmək bu aləmdə,
Məgər mə’yus ola aşiq həyati-müstəarından?

Məni qorxutma hicran atəşindən – türfə aləmdir!
Keçübdür aşiqi-zarin bu odda cümlə varından.

Təğafül eyləməz, ey Sağəri, mə’şuq aşiqdən,
Necə qəflət qılur səyyad pabəstə şikarından?

Düşəndə xatirimə hər zəman zülfi-pərişanın,
Gözimə tar olur aləm, içər könlüm cigər qanın.

Vüsalından məni məhrum qıldı çərxi-dun, dilbər,
Əritdi cismimi, yandırdı canım suzi-hicranın.

Bana mətlubdur ölmək təriqi-eşqdə, ya Rəbb,
Vüsalından olan məhrum aşiq verməsin canın!

Çəkübdür surətin nəqşin könüldə eşq nəqqaşı,
Degil bir ləhzə dil qafil, basub bağrına cananın.

Məhəbbət atəşində yanmıyan arif degil, ey dil!
Məhəbbət atəşində, ey könül, yan, eylə əfğanın!

Gülüstani-vüsal oldı xəzani-viran, asandu hicran,
Açulmaz gül gülüstanda, xəzan oldı gülüstanın.

Soruşsan Sağəri halin əgər, ey dilrüba məhvəş,
Fəraqında verüb can, həsrət ilə oldı qurbanın.

Göz yaşımdan, ey fələk, bir rudi-Ceyhun eylədin,
Qanlu yaşımla rüxi-zərdimi gülgun eylədin.

Yarımı aldun əlimdən, yarsız qoydun məni,
Leyk eşqində axır türfə Məcnun eylədin.

Qıldun əğyarı nəşati-eyşə məşqul, ey fələk,
Qəm oduna yandurub canımı məhzun eylədin.

Vəsldən üzdin əlim, hicranə qıldun mübtəla,
Günbəgün, saatbəsaat eşqim əfzun eylədin.

Neyləmişdim mən sana, ey səngdil kafər, de kim,
Eylədin qəmgin məni, əğyarı məmnun eylədin?

Vəsldən məhrum qıldun atəşi-hicran ara,
Qəflət etdün ol qədər, ta könlümi xun eylədin.

Necə fəryad etməsin hicran odunda Sağəri?
Atəşi-hicranda əhvalım digərgun eylədin.

Vüsalı cənnətü firdövsdür, bişəkk, cananın,
Cəhənnəm atəşindən tiztərdir nuri-hicranın.

Olur aşüftə könlüm zülfi-pürçinin kimi hərdəm,
Düşəndə xatirimə ənbəri-zülfi-pərişanın.

Çəkübdür surətin nəqşin könüldə eşq nəqqaşi,
Onı məhv eyləsə könlüm içrə yüz min cigər qanın.

Gülüstani-cəmalından bana açulmadı bir gül,
Görüm badi-xəzanla xəzan olsun gülüstanın!

Saqalmaz yarəsi ta həşr olunca könlümün hərgiz,
Belə məcruh edübdür könlümi ol tiri-müjganın!

Şəhidə bir əzab olmaz qiyamətdə, yəqindür bu,
Mənim qətlimə şahiddir xədəngü qanlu peykanın.

Olubdur Sağəri məhbusi-hicran, vəsldən məhrum,
Alub səbrü qərarımı ləbü lə'li-zənəxdanın.

Vəslə yetməz hicr evində gecələr zar olmayan,
Səhhəti bilməz cəhanda hiç bimar olmayan.

Vəsli-hicran mülkini seyr etməyən aşiq degil,
Hicri-vəsli anlamaz pabəndi-dildar olmayan.

Eyşü vəsli anlamaz aləmdə zahirdir bu kim,
Xiffəti-hicran çəküb hicranda qəmxar olmayan.

Gəl kəvakib seyrini məndən soruş, qafil yatan!
Kövkəbin seyrin nə bilsün gecə bidar olmayan?

Gəl bana yar olgilən, mə'şuqi-zarəm eşqdə,
Yar qədrin hiç bilməz aşiqə yar olmayan.

Bu mətai-atəşə candan xəridar olmayan,
Anlamaz eşqi nədir eşqə giriftar olmayan.

Sağəri hicran odunda oldı xari-ruzgar,
İzzəti-vəslə yetişməz hicrdə xar olmayan.

Alubdur ixtiyarımı əlimdən çeşmi-fəttanın,
Urubdur sinəmə min zəxmi-möhlik suzi-hicranın.

Xudavənda, nə hikmətdir, bu nə eşqi-məhəbbətdir,
Tökə mə’şuqi-kafər dəmbədəm qanın müsəlmanın?

Məhəbbət türfə aləmdir, əgər mə’şuq yar olsa,
Nedim, yar olmadı yarım bana, tökdi könül qanın.

Qara zülfində könlüm görmədi bir gün, ola xürrəm,
Məni qıldı pərişan aqibət zülfi-pərişanın.

Mənim tək biqərar olsun, cəhanda xarü zar olsun,
Salub hicranə yandırdı bu xəstə aşiqin canın.

Yüzünə gər baxam, mən’ etmə, ey kafər, məni andan,
Gözüm nurin ziyad eylər baxanda mahi-tabanın.

Demişəm canımı qurban edəm mən, Sağəri, yarə,
Qəbul etsə əgər ol novcəvan bu pir qurbanın.

Əl üzüldi vüsali-canandan,
Gəlmişəm təngə suzi-hicrandan.

Qıldı əğyar xanəmi viran,
Məni məhrum eylədi andan.

Tiğü tirindən ehtirazım yox,
Çünki eşqində keçmişəm candan.

Vəsldən eyləmə məni məhrum,
Gəl ayurma[25] məni gülüstandan.

Qərq edər aqibət səni, dilbər,
Həzər eylə bu çeşmi-giryandan.

Bivəfa olma, bivəfa yarım!
Həzər et ahi-gərmi-suzandan!

Sağəri az qalub həlak olsun,
Eylə təhqiq bir müsəlmandan.

---

[25] Haşiyədə: "çıxarma"

Sən kimi bir kafərə birəhm canan olmasun!
Mən kimi bir kimsənə pabəndi-hicran olmasun!

Sən kimi bir bivəfa yoxdur cəhanda hiç kəs,
Mən kimi bir kəs o zülfün tək pərişan olmasun!

Sən kimi hərgiz cəhanda qatilü xunxar yox,
Mən kimi məcruhü zar didəgiryan olmasun!

Sən kimi mə’şuq yoxdur şiveyi-rəftardə,
Mən kimi aşiq sənə bir kimsə heyran olmasun!

Sən kimi dildar, dilazar, biinsaf yox,
Mən kimi məcruhi-tiri-çeşmi-fəttan olmasun!

Sən kimi namehriban mə’şuq olmaz aşiqə,
Mən kimi aşiq sana, ey afəti-can, olmasun!

Sən kimi xunxar görmüb Sağəri, ey bivəfa,
Mən kimi aşiqlərə bu ah, əfğan olmasun!

Eşq odunı saxlaridim dildə mən eldən nihan,
Aqibət faş etdi sirrim xəlqə bu əşki-rəvan.

Oldı əğyarıma yarım yar, məndən yad olub,
Saldı gözdən aşiqini ol büti-namehriban.

Vəsldən mə’yus olub biçarə dil hicran ara,
Ol qədər fəryad edüb hicranda oldı ləxtə qan.

Şəkli-canan nəqş olub könlümdə, getməz həşrə tək,
Ol səbəbdəndir ki, çıxmaz xatirimdən bir zəman.

Mümkün olmaz dərdimi canana izhar eyləyüm,
Atəşi-hicranə yandum, atəş yaman oldı, yaman!

Aşiqə gər olsa mənzil ol səri-kudə müdam,
Həqqə and olsun, təmənna eyləməz dari-cinan!

Yar kuyindən ayağ çək, çox dolanma, Sağəri,
Öldürür bişəkk səni, gər görsə kafər pasiban.

Bir sərvqədd, mahrüx, atəşi-suzan,
Yandırdı məni eşq oduna, qıldı pərişan.

Peyvəstə qaşı çəkdi kəman qətlimə nagəh,
Əlminnətü lillah ki, edüb qanıma qəltan!

Mən xud nə bilürdüm ki, nədir eşq cəhanda?
Min işvə edüb qıldı məni hüsnünə heyran.

Vəslindən əlin üzdi könül, düşdi ayağdan,
Xakistər edüb aşiqini atəşi-hicran.

Məxfi elədüm eşqini mən dildə, nə hasil,
Bu qanlu yaşım qıldı onı xəlqə nümayan.

Nə badi-səba dəgdi səri-zülfə, nə şanə,
Ahim yetişüb zülfə, qılub zülfi pərişan.

Hicran gecəsi, Sağəri, yoxdur bana rahət,
Əzbəs ki qılub zəxmi-tənim navəkü peykan.

Və’də vermişdün bana, bu gecə mehman gəlmədün,
Gözümi yolda qoyub, ey mahi-taban, gəlmədün.

Bir günim sənsiz keçər min il bana, ey dilrüba!
Az qalubdur canım alsun suzi-hicran, gəlmədün.

Bir günim sənsiz cəhanda olmasın, ya Rəbb, mənim!
Göz yaşımdan hicr evində oldı tufan, gəlmədün.

Nəzr qılmışdım, gələndə mən dolanum başına,
Arzum qaldı gözümdə, sərvi-bustan, gəlmədün.

Demədimmi bir fəqirəm, dar gözlər yolumı?
Kim səni etdi məlamət, dil olub qan, gəlmədün?

Və’də vermişdin ki, gəlləm gəlmədün, ey bivəfa,
Eylədin zülfin kimi könlüm pərişan, gəlmədün.

Sağəri çəkməz əlin səndən nə qədər ömri var,
Öldüdün, kafər, məni, ey dinü iman, gəlmədün.

Məni eşq atəşinə yandırub, dilbər, kəbab etdün,
Bana hicran evində zülmü bihəddü hesab etdün.

Vüsalından məni məhrum qıldun, uydun əğyarə,
Məni bu atəşi-hicran ara püriztirab etdün.

Olanda həşr alsın Xaliqim səndən ərz, kafər,
Belə kim atəşi-hicranda canıma əzab etdün.

Gedüb əğyarlə seyri-gülüstan eylədün, billah,
Məni hicran evində zar edüb, halim xərab etdün.

Tərəhhüm qıl mənim göz yaşıma, mə'şuq, rəhm eylə,
Məni qəmgin edüb, əğyarı şad etdün – səvab etdün!

Tərəhhüm qıl, məni, qatil, bu gün bicürm öldürmə,
Neçə gündür məni şişə çəküb, odə kəbab etdün.

Xilas etsin məni Xaliq bu qəmdən, Sağəri, azad,
Məni hicran odunda yanmaqa çün intixab etdün.

Bütim, ağlatma sən, gəl rəhm qıl bu çeşmi-xunbarə,
Qərəzin faş eyləmə, baxsın mənim rəğmimə əğyarə!

Pərişan qılma giysu, cəm' etgilən bu mah rüxsarə,
Məni Məcnun edüb, Leyli, buraxma dəştü kuhsarə.

Niqabın alma ruyindən, nəzər ta qılmasun bir kəs,
Yaxan çak eyləyüb, cənnət qapusın açma küffarə.

Məni qorxutma, vaiz, atəşi-suzi-qiyamətdən,
Qiyamət qamətindən bir əsərdir, gəlsə rəftarə.

İki cəllad müşkildir bir aşiq qətlinə, kafər!
Xədəngi-qəmzəni mən' eylə, tapşur çeşmi-xunxarə.

Neçə gündür bana məqdur olmaz vəslinə yetmək,
Nedim mən, neylim, netmək gərək bu qövmi-əşrarə?

Mərizi-eşq olubdur Sağəri, yox dərdinə dərman,
Təbibim, gəl təğafül qılma, qıl bu dərdinə çarə.

Könül mürği qılubdur aşiyan zülfi-pərişanda,
Düşüb zülmatə sərgərdan qalub şami-qəribanda.

Bu nə dami-bəla, zülfi-müsəlsəl, ənbərin mudur,
Dutub mehrü qəmər dövrin təvaf eylər gülüstanda?

Vüsalın görmədüm ta kami-dil hasil qılam andan,
Yetişdi başa ömrüm, neyləyüm, bu dari-hicranda.

Bu surətdə, bu hey’ətdə, məlahətdə, lətafətdə,
Tapulmaz böylə surət, bu məlahət, mahi-Kən’anda.

Nə surətdir, çəküb Nəqqaşi-qüdrət kilki-sün’indən,
Tapulmaz bir gözəl sən tək nə Turanda, nə İranda.

Alub canım müjən, vallah, edübdür könlümi viran,
Mənim çeşmim qalubdur bilgilən ol bir məkanda.

Görənlər məhv olullar, surətində əql heyrandur,
Pəridür, huridür olmaz bu surət hiç insanda.

Nigarım, Sağəri, kafəri-cəlladi-bədxudur,
Tökər qanımı kafər rəhm qılmaz görsə hər qanda.

Ey salan mülki-məlahətdə məni sevdayə!
Nə münasib ki, deyim çöhrəni bənzər ayə?

Olmadı könlümə ol zülfi-siyəhdə təmkin,
Şanəvü bad salub könlümi min qövğayə.

Qaməti verdi bana ruzi-qiyamət xəbərin,
Bağlıdur ruzi-qiyamət bu qəddi-balayə.

Görməyüb arizini mən' edərlər məni xəlq.
Görsələr, məhv olullar o rüxi-həmrayə.

Dil hanı məndə qılum mən' ki, olma aşiq?
Vermişəm könlümi mən tifli-büti-tərsayə.

Çak-çak eylədi gərçi bədənim tə'nə daşı,
Ar yoxdur qəmi-eşqində məni-rüsvayə.

Ahü fəryad çəküb Sağəri hicran gecəsi,
Necə zəcr eylədi, gör kim, dili-qəmfərsayə!

Ərz qıl, badi-səba, əhvalımı cananıma,
Rəhm qılsun bəlkə yarım naleyi-əfğanıma.

Yusifim aldı əlimdən gürgi-birəhm fələk,
Kaş ric'ət eyləyəydi külbeyi-əhzanıma.

Vəsldə gördün məni, həsrət apardun, ey fələk!
Gəl nəzər qıl, bədnəzər, bir xaneyi-hicranıma!

Rəhm qılmaz dilbərim, görcək məni yüz döndərür,
Rəhm edər kafər mənim bu dideyi-giryanıma.

Ey nəsimi-sübhü şanə, dəgmə yar zülfünə,
Mürği-dil, qanə düşər, bais olursan qanıma.

Eşqi-tirindən qılan ikrah, bil, aşiq degil,
Yüz min ox hər ləhzə yarım kaş uraydı canıma.

Eşq odunda cismü canım yandı, vəslə yetmədüm,
Bəxtimə bax, Sağəri, bir ləhzə gəlməz yanıma.

Rəqibi mən kimi, ey çərxi-gərdun, kamran etmə!
Gülə xari-cəfakarı rəfiqü pasiban etmə!

Məni gözdən salub, əğyarə yarım həmnişin olmuş,
Xudavənda, o birəhmi rəqibə mehriban etmə!

Bana ol qədr möhlət ver ki, yari-mehriban gəlsün,
Amandır, ey əcəl, bir dəm bana sən qəsdi-can etmə!

Pərişan zülf ara dutdun vətən, ey dil, xoş aləmdir!
Tikübsən aşiyanə anda, tərki-aşiyan etmə!

Əlimdən dutgilən, ey vəsl, hicran taqətim almış,
Məni çeşmi-mərizin tək mərizi-natəvan etmə!

Nəzər qıl, şanə, dəgmə zülfi-pürçininə cananun,
Dağutma dilləri ol zülfdən, ey şanə, qan etmə!

Çıxarma xatirindən "innə bə'dəl-üsri yüsran"i[26]
Olur şiddət fərəc, ey Sağəri, bəsdir, fəğan etmə!

---

[26] Qur`anın "Şərh" (yaxud "İnşirah") surəsinin 6-cı ayəsi. Əslində belə olmalıdır: "İnnə məəl-üsri yüsran". Mə`nası: "Çətinliklə birlikdə bir asanlıq da olur". Sağəri buradakı "məə" sözünü "bə`də" (sonra) sözü ilə əvəz etmişdir.

Surətin nəqş qılubdur bu könül can içrə,
Yardan qeyr tapulmaz dili-suzan içrə.

Anlamış eşqimi gülzari-camalında sənin,
Bağban qoymadı bir ləhzə gülüstan içrə.

Dürrü gövhərdi, olub nəzm yədi-qüdrətdən,
İqdi-şəbnəmdi, düşüb qönçeyi-xəndan içrə.

Qanlu əşkim tökülüb didələrimdən o qədər,
Qərq olub aşiqi-biçarə bu gün qan içrə.

Məni mən' eyləməyün hicrdə qılsam nalə,
Necə aram dutum atəşi-suzan içrə?

Ey könül, əzm elə gülzarü bustan rahin,
Gör nə güllər açulub bağü bustan içrə!

Sağəri, dərdi-dilimi kimə izhar qılum?
Saldı bir tifl məni atəşi-hicran içrə.

Yandudun cismimizi atəşi-hicranə genə,
Gətidün könlümizi naleyi-əfğanə genə.

Basdı zülmat cəhanı, gözümə tar etdi,
Şanə urmış məgər ol zülfi-pərişanə genə?

Türrəsin qıldı pərişan, yüzinə saldı bu gün,
Aqil olmuşdı könül, eylədi divanə genə.

Məni görcək yüzümə güldi, təbəssüm etdi,
Şəm'i-ruyinə məni eylədi pərvanə genə.

Danə mehrü vəfa rahinə səpib, cəhd eylə,
Vəhşini damə salur, ram qılur danə genə.

Nə deyübdür sana əğyar, nigarım, yarım!
Döndərürsən yüzini, yar, niyə yanə genə?

Əql irşad qılub Həqqə bu gün Sağərini,
Həqqə min şükr, olacaq Sağəri fərzanə genə!

Və’də vermişdi gələ türfə nigarım bu gecə,
Gözümi yolda qoyub gəlmədi yarım bu gecə.

Görməsəm mahi-rüxin, səbrü qərarım olmaz,
Xəlqi bidar edər naleyi-zarım bu gecə.

Sübhə tək əşk töküb, didələrim qan ağlar,
Gəlməsə yanıma gər lalə üzarım bu gecə.

Gedüb əğyarə olub yar, yıxub xanəmizi,
Yuxu gəlməz gözümə, getdi qərarım bu gecə.

Mümkün olmaz ki, görəm çöhrəsini cananın,
Yanacaq atəşi-hicranına varım bu gecə.

Gəlməsə türbətim üstünə nigarım, billah,
Dutub od cümlə yanar xaki-məzarım bu gecə.

Gəlmədi yar, məni zar qılub hicranda,
Bilmərəm necə keçər bu şəbi-tarım bu gecə.

Yuxu gəlməz gözümə, vaqiədə yarı görəm,
Sağəri müşkil olubdur necə karım bu gecə!

Pərişan eyləmə ol mişki-zülfin mahi-rüxsarə,
Günimi eyləmə qarə, tərəhhüm qıl məni-zarə.

Olubdur tiri-qəmzəndən könül min çak, səd parə,
Olurmı əyyamı, bir könüldə olsa min yarə!

Mənim əhvalımı, badi-səba, get yarə ərz eylə,
Dilim yoxdur, gəlim canan yanında nitqü göftarə.

Vüsalından cüda qıldı məni dövri-fələk, ey gül,
Nə qədr cəhd qıldum, hicr evində, yetmədüm yarə.

Təbiba, zəhməti-bica çəkirsən, əl götür məndən,
Bu dərdi-eşqdir, əsla əlac olmaz bu bimarə.

Dolandum çox səri-kuyin, gecə-gündüz fəğan etdüm,
Nə hasil, olmadı, şərh eyləyim dərdimi dildarə.

Gülümi, Sağəri, aldı əlimdən xari-dilazar,
Xudavənda, rəva görmə, gedəm mən, yalvaram xarə.

Ənbəri-zülfin kimi könlüm pərişan eyləmə!
Səfheyi-rüxsarına zülfünü əfşan eyləmə!

Vəslinə yetsəm əgər, öldür məni, azad qıl,
Bir də cismi-zarımı pabəndi-hicran eyləmə!

Qorxuram, bidar ola dildar xabi-nazdən,
Ey könül, qan ağlama, fəryadü əfğan eyləmə.

Bivəfa yarım olub əğyarə həmdəm, neyləyim?
Ey fələk, bəsdir dəxi, sən könlümi qan eyləmə!

Sirri-eşqim faş olur aləmlərə, bir qıl həzər!
Caməmi, ey göz yaşı, qanilə əlvan eyləmə!

Qoy baxum rüxsarına, mən' etmə baxmaqdan məni,
Baxmasam, canım çıxar, ruyinə, pünhan eyləmə!

Atəşi-hicranə yandırma vücudum, qıl həzər!
Sağəri biçarədir, hicranda giryan eyləmə!

Könüllər mürğini qıldı hirasan zülf ara şanə,
Həzər qıl, urma şanə bir zəman zülfi-pərişanə.

Rüxün şəm'i münəvvər olsa hər məhfildə, rövşəndür,
Dolanub canımı yandurram ol şəm'ə çü pərvanə.

Həzər qıl göz yaşımdan, ta səni qərq etməsün nagəh,
Fəraqında gözüm yaşı dönübdür bəhri-ümmanə.

Gülüstani-üzarın gördi könlüm, eylədi nalə,
Görəndə gül yüzini bülbül gəlür fəryadü əfğanə.

Cəmalın pərtövini dutdı çü əbr zülfi-pürçin,
Sirişki-ali-çeşmim saldı cismim gör nə tufanə!

Könül mürğini dami-zülfə saldı daneyi-xalin
O gün kim, eylədi rəğbət o xali-ənbərəfşanə.

Məni məst eyləyübdür, Sağəri, lə'li-ləbi-meygun
O gündən kim, verüb eşqi mənim dəstimə peymanə.

Əqrəbi-zülf salub ay kimi rüxsarəsinə,
Aləmi tirə qılub aşiqi-biçarəsinə.

Yarı əğyar cüda eylədi məndən, ya Rəbb,
Qıl cüda mən kimi, qan sal oların arəsinə!

Ey müəllim, məni mən' eyləmə dərgahindən,
Gəlmişəm dilbərimin şövqlə nəzzarəsinə.

Qəmzə tirindən olub yarə bu min çak könül,
Yoxdu tədbiri-müalic bu könül yarəsinə.

O qədər ağladı göz atəşi-hicranında,
Ağ düşüb ağlamaqımdan gözümün qarəsinə.

Ey könül, çəkmə ayağ yar səri-kuyindən,
Olı kim rəhm qıla eşqinin avarəsinə.

Yandıdı atəşi-hicranə məni, dağ etdi,
Sağəri, vermə könül bir də o ay parəsinə!

Kim demişdir aşiqi-suzanını yad eyləmə?
Xaneyi-hicranımı vəslinlə abad eyləmə?

Qorxuram ruzi-vüsalın mən fəramuş eyləyim,
Bivəfa olma, məni hicranə mö’tad eyləmə!

Seyd qıldun könlümi, eşqində məhbus eylədün,
Ol qəfəsdən sən məni, səyyad, azad eyləmə!

Qıl həzər ahi-dilimdən, yandurur, billah, səni!
Vəsl evin viran edüb, hicranı abad eyləmə!

Səndən əl çəkmək degil mümkün bana, ey dilrüba!
Aşiqə, mə’şuq, rəhm et, zülmü bidad eyləmə!

Var ümidim kim, səni canane mülhəq eyləsin,
Həqq özi imdad qılsın, bu qədər dad eyləmə!

Xatirindən məhv qılmaz aşiqi mə’şuqlər,
Dilbərindən, Sağəri, bu qədr fəryad eyləmə!

Vay o gündən kim, nəzərdən mahrüxsarım gedə,
Vəsl evin viran edüb, qəhrlə dildarım gedə.

Belə kim yoxdur qərarım bir zəman dildarsız,
Qət' olur, billah, həyatım, tərk edüb yarım gedə.

Çıxsa canım cismdən, müşkil degil hərgiz bana,
Bir qiyamətdir bana, gər zülfi-zünnarım gedə.

Ey könül, kam al vüsalından, məqami-vəsldir,
Qorxuram, dövri-fələkdən yarü qəmxarım gedə.

Dur, qənimətdir, dolan başına, ey dil, dilbərün,
Xövfim andandur, könül, bu sərvrəftarım gedə.

Ey gözüm, eylə nəzər rüxsari-yarə, qorxuram
Kim, səni tənha qoyub, ol çeşmi-xəmmarım gedə.

Sağəri oldı kəbab hicran evində atəşə,
Tərsim[27] andandur könüldən naleyi-zarım gedə.

---

[27] Haşiyədə: "xövfim"

Məni xar eylədi dövri-zəmanə,
Urar başıma hər dəm taziyanə.

Məni tənha qoyub getdün, nigarım,
Çəkər hicran odı hər dəm zəbanə.

Vüsalın qismət eylə bir də, ya Rəbb!
Götürdi hicr odı canım əmanə!

Təmənna eylədüm lə'li-ləbindən,
Gətürdi hər zəman yüz min bəhanə.

Alubdur ixtiyarımı əlimdən,
Çəküb məndən üzin künci-nihanə.

Gözüm yolda qalubdur, yar gəlməz,
Çıxubdur ahü naləm asimanə.

Olur zülmat aləm gözlərimə,
Pərişan zülfünə gər ursa şanə.

Xudavənda, vüsalın qismət eylə,
Doyubdur Sağəri hicranda canə!

Yetürdi hicr odı hicran evində aşiqi canə,
Deyən yoxdur, nedim, əhvali-zarım yarü cananə.

Rəhi-eşqində keçdüm canü dildən, mülki-dünyadən,
Məni aqil xəyal et bu cəhanda, xah divanə.

Vəfa zatində təxmir etməyüb ruzi-əzəldən Həqq,
Necə mə'dum olur mövcudi-mütləq, gəlməz imkanə?

Məni məhrum qıldun vəsldən, ey bivəfa yarım,
Qədəm rəncə qılub, bir dəm güzər qıl beyti-ehzanə.

Əlim dut, ey əcəl, qəmdən xilas et canımı, qurtar,
Dağıldı xaneyi-eyşim cəhanda, oldı viranə.

Vüsalından əgər məhrum oldun, ey könül, yarın,
Qənimətdir, əgər mərdanə olsan suzi-hicranə.

Necə aram dutsun Sağəri hicran ara, ey gül,
Məni həsrət qoyubdur fələk ol mahi-Kən'anə.

Ey şanə, utan türreyi-əfşanına dəgmə!
Canım çıxar, ol zülfi-pərişanına dəgmə!

Etmə günimi qarə mənim, zülf, həzər qıl!
Çin-çin tökülüb mehri-dirəxşanına dəgmə!

Ey sürmə, həya eylə, günim eyləmə tirə,
Çeşmi-siyəhi-nərgisi-məstanına dəgmə!

Ey zülf, həya qıl, məni sən etmə pərişan,
Hər dəm tökülüb, ol məhi-tabanına dəgmə!

Cənnət qapusın bağlama sən aşiqi-zarə,
Ey badi-səba, çaki-giribanına dəgmə!

Qoy canımı çıxsun, bana rəhm eyləmə, cərrah,
Əl urma bana, navəki-peykanına dəgmə!

Yıxma evini Sağərinin, bad, həzər qıl,
Hər ləhzə əsüb sibi-zənəxdanına dəgmə!

Hicrani-ələmdən çəkirəm hər gecə nalə,
Döndərdi qəmi-eşq mənim cismimi nalə.

Dil qanə dönüb, cism yanar nari-fəraqə,
Hər dəm ki düşər vəsl güni fikrü xəyalə.

Görsə tanımaz aşiqini ol büti-kafər,
Hicran ələmi cismimi döndərdi hilalə.

Çıxmaz fələkə xicləti-ənduhdən əsla,
Düşə nəzəri mehrü məhin böylə cəmalə.

Tap aşiqi-biçarəni, mə'şuq, həzər qıl,
Öldürməgilən, salma özini vizrü vəbalə!

Aləm gözümə tar olur zülfi-siyəh tək,
Çün türreyi-mişkini salur arizi-alə.

Qoymadı fələk, qıldı cüda dilbəri məndən,
Xuni-dililə gər yetdüm həddi-kəmalə.

Dəhr içrə yüzi gülməsin hər kim səbəb oldı,
Min hiylə qılub saldı məni dari-məlalə.

Hicran ələmi Sağərini yandudı böylə,
Qoymaz ətəgin əldən, əgər yetsə vüsalə.

Bu nə zülfi-siyəh, türreyi-əfşandur bu!
Nə müsəlsəldi, könül kimi pərişandur bu!

Nə hilalundu, peyvəstə çəküb tirü kəman,
Aşiqin qətlinə çün tiği-nümayandur bu!

Nizələrdür ucalub qətlimə, bilməm, ya Rəbb,
Tiri-dilduzdı, ya navəki-müjgandur bu?

Bu nə surətdi, nə rüxsar, nə gülzari-əcib?
Görsə hər kəs belə surət, deməz: insandur bu.

Bu nə yüzdür, bu nə gözdür, bü nə gülgun çöhrə?
Güli-tərdür iki məxmur – nə fəttandur bu!

Ağzını vəsf eləmək olmadı mümkün, nə deyüm,
Sirrmü, anlamadum, nükteyi-pünhandur bu?

Demərəm gül yüzünə, güldə hanı bu surət,
Kə'bədi, Sağəri, ya müshəfi-Qur'andur bu?

Ey könül, qəmzədi, ya navəki-peykandır bu?
Tiri-xunxardı, ya nizeyi-müjgandır bu?

Sərzəniş qılma bana atəşi-suzan içrə,
Səhl bilmə bu odı, atəşi-hicrandır bu.

Bağban, eyləmə təklif gülüstanə bəni,
Göz yaşımdan ətəgim türfə gülüstandır bu.

Bad əsüb, şanə dəgüb zülfünə, bilməm, yarın,
Yoxsa tə’sir qılub ah, pərişandır bu?

Ey qoyan xaki-murazıma qədəmi-qəflin,
Tirə xak içrə yatan sən kimi bir candır bu.

Ey könül atəşi, peykanın əritmə, həzər et!
Can kimi bağrına bas, ayəti-canandır bu!

Sağəri, qılma şikayət bu zəman əhlindən,
Səbr qıl, şükr elə, bir belə dövrandır bu.

Zülfdür, silsileyi-mudur bu?
Müşkdür, türreyi-giysudur bu?

Qövsdür, qövsi-qüzehdir, yoxsa
Taqi- peyvəsteyi-əbrudur bu?

İki bimardı taq altında,
Təkyə qılmış iki ahudur bu?

Yədi-beyzadı bu, ya vəchi-həsən,
Güli-nəsrindi, ya rudur bu?

Fitnədir, nərgisi-şəhladı gözin,
İki səhhardı, cadudur bu?

Belini dərk edə bilməz didə,
Necə dərk edər anı – mudur bu!

Sordum ağzını, bana verdi cəvab:
Yoxdu bir şey ki, deyüm: budur bu.

Göz qarasıdı düşüb çöhrəsinə,
Sağəri, xaldı, hindudur bu?

Ənbərin zülfdi, ya şami-qəribandır bu?
Düşüb ay çöhrəsinə zülfi-pərişandır bu.

Bilmirəm çeşmdi, ya fitneyi-mərdümazar,
Məsti-xunrizdi, ya nərgisi-fəttandır bu?

Taqi-mehrabdı, ya qibleyi-əhli-dildir,
Ay kimi zülfin arasında nümayandır bu.

Səfdəri-qəlbşikəndir ki, çəküb xəncəri,
Nizədi, tirdi, ya navəki-müjgandır bu?

Lalədir, yasəmənü nəstərəni-bağı-behişt,
Bu nə mənzərdi, nə ariz, nə gülüstandır bu?

İqdi-şəbnəmdi düşüb qönçeyi-sirab üzə,
Yoxsa pərvindi, ya gövhəri-dəndandır bu?

Ağzını dərk edə bilmən, bana çox müşkildür,
Mən necə dərk edüm, nükteyi-pünhandır bu!

Saliki-rahi-məhəbbət adını eşq qoyub,
Sağəri anlamadı – atəşi-suzandır bu.

İki məxmurü məst gözdür bu,
Fitnədir, yoxsa nərgisi-cadu?

Sinəmi çak-çak qıldı mənim,
Qəmzə tirilə bu kəman əbru.

Atəşi-hicrdə edübdi kəbab,
Cismimi yandırubdı bir bədxu.

Öldürübdi məni fəraqında
Bir rüxi-mah, ənbərin giysu.

Qət' olubdur ümid vəslindən,
Sən götür vəslinə məni, yahu!

Vermədi atəşi-fəraqında
Şərbəti-vəsldən bana bir su.

Sağəri, eyləyüb məni Məcnun,
Bilmirəm insdür, mələkdür bu?

Aşiqi-biçarə eylər dəmbədəm yar arzu,
Yari-xoşrəftar, xoş kirdarü didar arzu.

Tövbə qıldum eşqdən, dildardən çəkdüm əlim,
Neyləyim, könlüm qılur hər ləhzə dildar arzu.

Çöhreyi-yarım, dedim, bir gecə rö'yadə görüm,
Eylədi könlüm cəhanda gör nə düşvar arzu?

Gər zənəxdanın təmənna eyləsəm, mən' etməyin,
Rəsmdir aləmdə, eylər sib bimar arzu.

Xatirim qasid pəyamindən təmkin[28] bulmadı,
Ahü əfğan eyləyüb eylər vəfadar arzu.

Gər ola məqdur gülzari-cəmalın aşiqə,
Eyləməz əsla cəhanda hiç gülzar arzu.

Atəşi-hicranə yandı cismü canım, Sağəri,
Bir xocəstə təl'ətü rüxsar eylər arzu.

---

[28] Əlyazmasında "kəf" (ك) hərfinin üstündə təşdid (ّ) işarəsi qoyulduğundan belə anlaşılır ki, şair bu sözün eyni mə`nanı (təskinlik, rahatlıq) verən "təməkkün" kimi oxunmasını da mümkün saymışdır.

Yar getdi bana bir guşeyi-hicran qaldı,
Gülməgim getdi dəxi, dideyi-giryan qaldı.

Eyşü cəşnimi fələk aldı əlimdən cümlə,
Həqqimə şükr, bana naleyi-əfğan qaldı.

Olmadı vəqt, qılam şərhi-qəmi cananə,
Demədim dərdi-dilim, sinədə pünhan qaldı.

Atəşi-hicr əritmiş bədənim hicranda,
Demə kim, aşiqinə bir rəməqi-can qaldı.

Qarə qıldı günim əğyari-cəfakar mənim,
Zülf tək aşiqi-biçarə pərişan qaldı.

Vəsl mə’mur qılan xanəni bərbad oldı,
Dəxi mə’mur olunmaz, elə viran qaldı!

Bilmədüm, necə ayurdı onı məndən əğyar,
Sağəri öz-özünə və alə heyran qaldı.

Gər görsə gözüm bir də rüxsareyi-cananı,
Əhd eyləmişəm qurban canana kəsəm canı.

Həqq istədi bildirsün firdövs-cəhənnəm var,
Mövcud qılub vəsli, xəlq eylədi hicranı.

Çün aşiqi-xəlq etdi xəllaqi-cəhan, oldum,
Qismət eləyüb özi üşşaqə cigər qanı.

Şəhzadə, gəl öldürmə, rəhm eylə bana bir dəm,
Sal ağzına bir, kafər, ol sibi-zənəxdanı.

Könlüm səni yad eylər hər ləhzəvü hər saət,
Hər ləhzəvü hər saət, ey Yusifi-Kən'ani

Vəslində əgər şadəm, mən bəndeyi-azadəm,
Hicran gecəsi gəl gör bir naləvü əfğani.

Ağzı yox-varində mən, Sağəri, heyranəm,
Dərk eyləmədüm əsla bu nükteyi-pünhani.

Dağıtma gün yüzünə əbr tək zülfi-pərişani,
Dutulsa gün yüzi, xəlqə edər dünyanı zələmani.

Məni yandurma hicran atəşinə, taqətim yoxdur,
Dolandur başına, azad qıl bu piri-qurbani.

Könüldə yoxdı bir boş yer, dutubdur tiri-peykanın,
Əgər qəmzən ata bir ox, dəgər peykanə peykani.

Məni hicran belə mə'yus edübdür ruzi-vəslindən,
Qalubdur aləmi-rö'yayə, görsəm ruyi-canani.

Nə yaxşı aləmdi vəsli-məhbub aşiqə daim,
Yar etmişdi vüsali, etməyəydi xəlq hicrani.

İnani-ixtiyarım əldən aldı eşq sultanı,
Edübdür aşiqə mə'şuq, neyləyim, tifli-nadani?

Düşübdür Sağəri bir dərdə, yoxdur dərdinə çarə,
Kimə faş eyləyüm, yaran, deyün bu sirri-pünhani?

Zəcr qıldum nə qədər mən bu dili-əfkari!
Tövbə qıl eşqdən, axtarma o gül rüxsari!

Dutmadı pəndimi dil, ahü fəğanilə gedüb
Dolanur hər tərəfə kim, genə tapsın yari.

Dil bana qalib olub çəkdi məni yarə tərəf,
O səbəbdən dolanub axtaruram dildari.

Çeşmi-bimarun edüb cismimi bimar mənim,
Fikri-dərman elə, öldürmə məni-bimari!

Kuyinə kəsrəti-güldən[29] gedə bilməm hərgiz,
Bəski hicranda olub əşk gözümdən cari!

Məni öldürməgə amadə olubsan, kafər,
Könlünə rəhm sala bəlkə Cənabi-Bari?

Gər baxam ruyinə min il genə dönməz didə,
Sağəri, faş eləmə dəhrdə bu əsrari!

---

[29] Burada "gaf" (گ) hərfinin üstündə damma (ü), altında kəsrə (i) işarələri qoyulmuşdur. Ola bilsin, şair bu sözün həm "güldən" həm də "gildən" kimi oxunmasının mümkünlüyünə işarə edir. Sonrakı misrada aşiqin öz yarının kuyinə yolunu onun göz yaşlarının kəsdiyi fikri ikinci variantın daha düzgün olduğunu əsaslandırır. Çünki axan göz yaşları kuyi (küçəni) isladıb gil (palçıq) etdiyindən onun oradan keçib öz yarına yetişməsi çətinləşmişdir.

Eşq qoymaz yardan bir dəm olam qafil bəni,
Badeyi-eşqin qılubdur məsti-layə’qil bəni.

Vermişəm canü dil bir tifli-nadan dəstinə,
Xah divanə bilün aləmdə, ya aqil bəni.

Səndən əl çəkmək bana mümkün degil ta ruzi-həşr,
Xah naqis bil məni eşqində, ya kamil bəni.

Qatilim mə’yus qıldı öldüməkdən canımı,
Öldürür axır fəraqında nigarın dil bəni.

Bu yəqinimdür: məni eşq öldürüb eylər həlak,
Etmədi azad qəmdən canımı qatil – bəni.

Ruzi-əzəldən cəmalın aşiqə ərz etdilər,
Verdilər eşqin bana, çün gördilər qabil bəni.

Mətləbü məqsudini tapsın cəhanda, Sağəri,
Cəhd edüb hər kim qıla cananimə vasil bəni!

Zülfin kimi, nigarım, yox könlümün qərarı,
Zənciri-zülfə düşdi, yox məndə ixtiyarı.

Məşşatə, urma şanə ol zülfi-ənbərinə,
Dağıtma tari-zülfi, tar etmə ruzgarı.

Uyma rəqibə, yarım, tar etmə ruzgarım,
Kim eylədi cəhanda əğyarə e'tibarı?

Bir neçə müddət idi ruyini görməmişdüm,
Min şükr Xaliqimə, gördüm bu gün nigarı.

Rəngi-xətti dutubdur Çin mülkini sərasər,
Bax padişahi-hüsnə olmuş necə fərari!

Sənsiz soruşsan halim, ey ruhi-bimisalim,
Ərşi-bərinə çıxdı, gəl gör ki, ahü zarı.

Hərçənd, Sağəri, mən cəhd eylədüm vüsalə,
Hicran evində keçdi ahilə ruzgarı.

Yetişüb vəslə bu gün aşiq xunin cigəri,
Elə mədhuş olub yoxdu özündən xəbəri.

Aləmə eylədi tə'sir fəğanü ahim,
Bu qədər ahü fəğanın ona olmaz əsəri.

Dərdimi şərh edərəm bəxt əgər yar olsa,
Nə zəman hicr evinə düşsə nigarım güzəri.

Surətim tapdı təğyir qəmi-hicranından,
Tanımaz aşiqini düşə, yəqindir, nəzəri.

Ey səba, yarə yetür ərzimi ərz eyləgilən,
Can verür həsrətlə eşqdə bir didə təri.

Şəbi-hicran salub od canıma yandırdı məni,
Qorxuram yandıra afaq bu ahim şərəri.

Yar olan yerdə özümdən xəbərim yoxdu mənim,
O səbəbdəndi verüb Sağəri eşqində səri.

Yetürən yoxdu nedim ol məhi-Kən’anə bəni,
Yetirüb atəşi-hicran bu gecə canə bəni.

Vəsldə gördi məni çərxi-fələk, həsrətdən
Zülm edüb saldı genə guşeyi-hicranə bəni.

Rəhm qıl müslimə, qorxum budı, kafər, bir gün
Fikri-vəslin, qəmi-hicran edə divanə bəni.

Dəxi yoxdur bana bir çarə ölümdən qeyri,
Bivəfa yar salub gözdən, atub yanə bəni.

Vəsldən eylədi məhrum məni dövri-fələk,
Qorxuram möhnəti-hicran qıla biganə bəni.

Xəlq çün qıldı əzəl şəm’ rüxin pərtövini,
Balü pər yandumaqa eylədi pərvanə bəni.

Sındıdı balü pərim, Sağəri, əvvəl gündən
Bağban qoymadı bir ləhzə gülüstanə bəni.

Dərdim elə dərddir, aləmdə yoxdur çarəsi,
Yaxşı olmaz həşrə tək könlümdə eşqin yarəsi.

Bilmərəm dünyavü mafiha nədir kim, xəlq olub,
Olmuşam ruzi-əzəldən bir gözəl avarəsi.

Kim demiş: vacib degil mümkün onı dərk eləsün? –
Bax, təzahür eyləmiş ayineyi-rüxsarəsi.

Ol qədər göz əşk tökdi atəşi-hicranına,
Atəşə aq oldı, oldı aq çeşmim qarəsi.

Kim demiş mehrabi-əbrusinə yarın qövsdir? –
Baş çıxarmış əbri-zülfündən onun ay parəsi.

Cəm' qılmaq könlümi zülfi-pərişandan mühal,
Bağlanub hər tari-zülfə könlümün hər parəsi.

Demə kim, hicran evində yoxdu qəmxarım mənim,
Tiri-peykanın olubdur Sağəri qəmxarəsi.

Bir mələksurət məni hüsnünə heyran eylədi,
Əqlimi başdan alub qəsdi-dilü can eylədi.

Hicrdə vəslin xəyalilə gözüm qan-yaş töküb,
Ol qədər qan ağladı, cismimi pünhan eylədi.

Atəşi-hicranda çeşmim ol qədər qan ağladı,
Göz yaşımdan damənim rəşki-gülüstan eylədi.

Vəslə talib olma, ey dil, səxt müşkildür bü iş,
Qismətim ruzi-əzəldən Həqq hicran eylədi.

Vəslinə müşkil yetişdüm, almadı kamın könül,
Gör fələk hicrani-cananı nə asan eylədi!

Bilmərəm mən xud kim, aləm nədir hicran ara,
Zülməti-hicran məni əzbəs pərişan eylədi.

Var idi min dərdi pünhan sinədə, ey Sağəri,
Şərbəti-vəslilə canan cümlə dərman eylədi.

Olmuşam bir gülrüxi-zibanın divanəsi,
Kaş olaydum dövri-şəm'i-ariz pərvanəsi.

Qalmışam hicran evində, biənisü bikəsəm,
Oldı viran çərx dövründən məhəbbət xanəsi.

Bəs ki fəryad eylədüm hicran qəmindən hər gecə,
Qanlə sərşar olubdur könlümün peymanəsi.

Könlümə yoxdur fərağət ol səri-zülf içrə kim,
Qanimə çox təşnədir ol zülf içində şanəsi.

Mən fəqirə rəhm qıl, ey çərxi-gərdun, bir zəman,
Xaneyi-eyşim olubdur gör necə qəm xanəsi!

Həmnişin olmuş rəqibə dilbəri-məhpeykərim,
Getdi əldən, neylim mən, canımın cananəsi?

Dilbərim, mümkün degil məxfi qılam eşq atəşin,
Aləmi dutmuş sərasər Sağəri əfsanəsi.

Qılmadı aşiqinə cövri-cəfadan qeyri,
Görməmiş aşiqdə mehrü vəfadan qeyri.

Yoxdu hicranda ola kimsə bana yarü ənis,
Yoxdu bir çarə bana lütfi-Xudadan qeyri.

Görmədüm vəsli, yüzüm gülmədi hicran içrə,
Görmədüm ömrdə mən şurü nəvadan qeyri.

Keçmişəm varü yoxundan bu cəhanın cümlə,
Yoxdu mənzur bana huriliqadan qeyri.

Vəsldən eylədi məhrum məni dövri-fələk,
Yoxdu qəlbimdə dəxi mülki-bəqadan qeyri.

Qıl fəna varını, ey saliki-rahi-əzəli,
Yetməz aşiq mə'şuqə fənadan qeyri.

Görmədüm vəsl cəhanda ki, ola könlüm şad,
Sağəri görmədi ömründə bükadan qeyri.

Neçə gündür görmədüm mən ay kimi rüxsarını,
Göstərürsən qeyrə hər dəm çöhreyi-didarını.

Sərvə meyl etməz gülüstan içrə hərgiz bağban,
Görsə gər min lütflə bu şiveyi-rəftarını.

Əql başdan məhv olur, hərgiz, özümi bilmərəm,
Çün təsəvvür eylərəm mən ləhçeyi-göftarını.

Könlümi aldun əlimdən, eylədün bidil məni,
Xatirindən məhv qılma aşiqi-xunxarını.

Qeyr bilməz mən kimi qədrin, dolandum başına,
Salma gözdən bisəbəb, ey tifli-nadan, yarını.

Olmuşam eşqin mərizi, dərdimə yoxdur əlac,
Ey təbibi-bimürüvvət, bir soruş bimarını!

Sağəri, əğyarə uymuş yar, yoxdur çarəsi,
Gör, necə çərxi-fələk etdi xəzan gülzarını!

Döndərüb qanə fəraqında məhəbbət könlümi,
Parə-parə eylədi hicranda möhnət könlümi.

Yaridən qeyri könül mülkündə yoxdur bir xəyal.
Qeyrlərdən pak edübdür suzi-qeyrət könlümi.

Bir zəman qafil degil könlüm xəyalından sənin,
Gər ola qafil dutar gərdi-məlalət könlümi.

Əklü şürbim qət' edüb fikrü xəyalın kəsrəti,
Atəşi-hicranda qan etmiş küdurət könlümi.

Dil belə aludədir fikrü xəyalında sənin,
Tapmaq olmaz bir zəman, hərgiz, fərağət könlümi.

Dilbərim, qılma təğafül aşiqindən bir zəman,
Yandurubdur atəşi-hicranə ülfət könlümi.

Sağəri, hər cövr qılsa yar, ləzzətdir bana,
Xoş gəlür cövri, edər hər ləhzə rahət könlümi.

Hərgiz bəyanə gəlmədi eşqin rəvayəti,
Həşrə çəkər bu qisseyi[30]-tulin hekayəti.

Hicran evində etmənəm ah-fəğan əgər,
Olsa bu dərdməndə nigarın inayəti.

Aşiq degil şikayət edən ruzi-hicrdən,
Olmaz fəraqü vəsldə aşiq şikayəti.

Hicrani-şəb[31] yetmədi payanə ömrdə,
Heyrətdə qalmışam ki, onun yox nəhayəti.

Hicran odı vücudimi eylərdi payimal.
Gər olmasaydı aşiqə eşqin himayəti.

Rəftarü xülqi-yarimə söz yoxdu, ey könül,
Rəsmi-vəfadə, heyf ki, yoxdur dəyanəti.

Yetdüm vüsalə, Sağəri, tapdum nigarımı,
Mənzurdur bana genə hicran məhabəti.

---

[30] Haşiyədə: "müşkili"
[31] Haşiyədə: "gecəsi"

Gözüm qanlu yaşı cismi-zəifim qərqi-xun etdi,
Məhəbbət atəşi yandırdı canım bisükun etdi.

Demişdüm əl çəküm eşqindən, ey büt, olmadı məqdur,
Yüzin gördüm genə eşqimi əvvəldən füzun etdi.

Xəyalımdan fəramuş etmənəm bir ləhzə cananı,
Ləb sehr eylədi, cadu gözi yoxsa füsun etdi?

Yetür vəslə bəni, ey səngdil, az qaldı can çıxsın,
Fəraqın atəşi yandırdı canım, bəs zəbun etdi.

Əzəl nəqqaşi həmra eyləmişdir tə'nim, ey gül,
Ki, yoxsa badeyi-gülgun üzarın laləgun etdi?

Nə xoş əyyamdı əyyami-vəslin, bilmədüm qədrin,
Dağıtdı xaneyi-eyşimi bu gərdun, nigun etdi.

Cüda qıldı səni məndən rəqibü pasiban zülmi,
Qəmi-eşq məni, ey Sağəri, axır cünun etdi.

Zülfi-mişkinin kimi aləmdə mişki-tər hanı?
Çeşmi-cəlladın kimi dəhr içrə bir kafər hanı?

Bağı-gülzari-cəhanda gülbədənlər var bəsi,
Sal nəzər məcmuinə, gör belə gülpeykər hanı?

Cənnət içrə var Kövsər, ərçi derlər, yox demin,
Leyk ağzın tək o yerdə çeşmeyi-Kövsər hanı?

Məstlər tə'rif edərlər badeyi-gülguni, leyk
Nəş'eyi-lə'lin kimi bir badeyi-əhmər hanı?

Çox edənlər şürbi-badə dərdi-sər hasil qılur,
Badeyi-lə'lində ləzzət var, dərdi-sər hanı?

Dilrüba çoxdur cəhanda, surəti-ziba bəsi,
Dilrübalar içrə, hərgiz, belə xoşmənzər hanı?

Olmuşam məsti-ləbi-lə'lin, özümdən yox xəbər,
Sağəri bilməz meyi-səhba nədir, sağər hanı?

Yetürdi dövri-fələk firqətində canə bəni,
Qılub nişanə xədəngi-bəla nişanə bəni.

O qəmzədən həzər etməz könül ki, ləzzəti var,
Fələk əsir qılub bir qaşı kəmanə bəni.

Zəbani-şanə gəzüb telbətel o zülf içrə,
Könül quşunı tapub şanə, atdı yanə bəni.

Qılubdı həbsi-qəfəs bağban könül mürğin,
Nedim, aparmadı bir dəm o gülüstanə bəni.

Deme ki, göz yaşıdır qanlu, qərq edübdi tənim,
Leyk xəyalı salubdur bu bəhri-qanə bəni.

O türrədən məni ayırdı, dərbədər saldı,
Əritdi, mu kimi qıldı zəbani-şanə bəni.

Ayırdı Sağərini çərxi-dun vüsalından,
Fəraq oduna, nedim, yandurur zəbanə bəni.

Eyləyüm payində qurban, əhd qıldum, canımı,
Gər görəm bir dəf'ə də mən çöhreyi-cananımı.

Hərzə-hərzə, ey könül, fəryad, əfğan eyləmə,
Dilbərim, hərgiz, eşitməz naleyi-əfğanımı.

Anlamış: kafərdə olmaz dinü iman pərtövi,
Ol səbəbdən aldı əldən dinlə imanımı.

Hər kəs istər kim behiştü duzəxi bilsin nədir,
Gülşəni-vəslə baxub görsün şəbi-hicranımı.

Yandurub eşq atəşində cismü canım bir gözəl,
Qılmadı sirab lə'lindən ləbi-ətşanımı.

Dilbərim rəhm eyləməz fəryadü ahü əşkimə,
Rəhm edər kafər görə gər dideyi-giryanımı.

Sağəri, ömrüm tamam oldı, vüsalın görmədüm,
Tiği-kin ilə töküb kafər yer üzrə qanımı.

Hər dəm düşəndə xatirimə sərv qaməti,
Məhşər olur əyan bana, görrəm qiyaməti.

Təhsil elə eşq ülumini, ey könül!
Bir türfə elmdir, sana olmaz nədaməti.

Bimarü məst gözləri almış qərarımı,
Bimar olub könül, dəxi görməz səlaməti.

Əsrari-eşq məxfi qılub, dildə kətm edün,
Zinhar, açmın ki, çəkərsüz nədaməti.

Mərdəm deyən işanə könül sirri verməsin,
Hərgiz görünməyüb ola övrət dəyanəti.

Mə'şuq, aşiqin tanunur ruzi-həşrdə:
Məcruh sinə, qanlu kəfəndir əlaməti.

Ey Sağəri, məlahəti-hüsnündə eyb yox,
Səd heyf yoxdu rəsmi-vəfadə iqaməti!

Ey xoş ol saət ki, vəsli-dilbərim məqdur idi,
Dövləti-vəslilə könlüm hər zəman məsrur idi.

Sirri-eşqim faş olub xəlqi-cəhanə sərbəsər,
Ləzzət andaydı ki, eşqim xəlqdən məstur idi.

Xaneyi-vəslim evin viran edüb hicr atəşi,
Xaneyi-eyşim vüsali-yar ilə mə'mur idi.

İmdi həmağuş olub əğyar yarimə, nedim,
Ey xoş ol dəm – yarımız əğyaridən məhcur idi!

Canimə minnət bilürdüm cövrü zülmi-nazını,
Aşiqə baxduqca fəxr eylərdi, çox məğrur idi!

İmdi nabina olub göz ağlamaqdan hicrdə,
Gözlərim nuri-cəmalından əcəb pürnur idi!

Sağəri kəmnam olub hicran evində, ey fələk!
Vəsl evində mehri-ənvər tək əcəb məşhur idi!

Bir mələksurət qılubdur eşqdə şeyda bəni,
Qorxum andandur ki, eşqi eyləsin rüsva bəni.

Elə məşhur olmuşam eşqində, ey dilbər, sənin,
Harda olsam, dilrübalar eyləyür peyda bəni.

Vermişəm könlümi mən ol zülfi-ənbərbarına,
Aqibət divanə eylər eşqü bu sevda bəni.

Qaçmazam tirü xədəngü nizəvü peykandən,
Eşqi-ruyin eyləyübdür səxt bipərva bəni.

Gördi canan aşiqini, qəhr edüb, yüz döndərüb,
Öldürür axır, yəqinimdür, bu istiğna bəni.

Həşr olunca huşa gəlməz aşiqin, bihuşdur,
Məst edübdür belə kim ol nərgisi-şəhla bəni.

Badeyi-lə'li-ləbindən məst olubdur Sağəri,
Mən belə məstəm ki, məst etməz meyi-səhba bəni.

Eylədi rüsvayi-aləm aşinalərdən bəni,
Qıldılar məhrum feyzi-dilrübalərdən bəni.

Öldürürdi aşiqi əğyar yüz min zəcrlə,
Saxladı ol cövşəni-eşqin bəlalərdən bəni.

Dəhrdə rüsva olub mən tək təəb çəksün o kim,
Zülmlə qıldı cüda huriliqalərdən bəni!

Zülfi-su'ban çəkübdür kamına könlüm quşın,
Min qoşun etməz xilasım əjdəhalərdən bəni.

Eyləmiş eymən məni mülki-təcərrüddə qəmin,
Eylədi məhfuz eşqin çox bəlalərdən bəni.

Mən şikayət etmənəm, hərgiz, fələkdən ömrdə,
Eylədi məhrum vüsalin əqrəbalərdən bəni!

Zülmü cövri, Sağəri, bir şəhdi-şəkkərdir bana,
Eşqdə sən bilmə böylə bivəfalərdən bəni.

Verdüm o gün ki türreyi-tərrarə könlümi,
Saldı kəməndi-zülfə, qılub qarə könlümi.

Məşşatə, zülfə şanə urub üzmə canımı,
Qılma o zülfdən mənim avarə könlümi.

Min göz açub cəmalına nəzzarə etməgə
Çak eyləmiş o qəmzeyi-xunxarə könlümi.

Könlüm quşı o zülfi-siyəhdə dutub vətən,
Mən' eyləyin görəndə o bikarə könlümi.

Könlüm quşını hiylə ilə xal danəsi
Qıldı düçar zülfi-siyəhkarə könlümi.

Əhli-dilə deyün bana bidil desün müdam,
Məhparələr apardı bu sədparə könlümi.

Et iltimas min dililə şanına, səba,
İncitməsin o zülfdə biçarə könlümi.

Ruyindən özgə, dildə tapulmaz xəyali-qeyr,
Min dəf'ə qət' edüb yaralar yarə könlümi.

Mülki-bədənində, Sağəri, yox türfə ərməğan,
Dil töhfə, ərməğandı, verüm yarə könlümi!

Fəraqında gözüm əbri-azəri tək əşkbar oldı,
Gözüm qanlu yaşından kuhü səhra laləzar oldı.

Necə gülsün könül mürği bəla damında, eyş etsin?
Müsəlsəl zülf dövründə güni hər ləhzə tar oldı.

Könül dutmışdı zülfin riştəsində aşiyan, taki
Əsüb badi-səba dəgildi o zülfə, tar-mar oldı.

Fəraqında çəkərdüm vəsl dərdin, hicrə dözməzdüm,
Yetəndə vəslə bir dərdim, görün kim, səd həzar oldı!

Yəqin badi-səba, ya şanə dəgildi zülfi-pürçinə,
Pərişan zülf tək könlüm sinəmdə biqərar oldı.

Məni azad qıl künci-qəfəsdən, həsrətim çoxdur,
Oyan, ey bağban, getdi xəzan kim, novbəhar oldı.

Yüzini görməmiş eşq atəşində cismü can yandı,
Görəndə çöhrəsin taki könül biixtiyar oldı.

Həyatımdan əl üzdüm, zindəganlıq şövqini etdüm,
Eşitdüm kim, mənim yarım gedüb əğyarə yar oldı.

Mənim bəxtim yatub, əsla oyanmaz xabi-qəflətdən,
Xoşa ol aşiqə daim cəhanda bəxtiyar oldı!

Düşüb tufanə cismim, Nuh tək dəryadə seyr etdüm,
Mənim bu gözlərim hicranda bəs ki əşkbar oldı!

Qutarmaq müşkil oldı, Sağəri, səyyad qeydindən,
Kəməndi-zülfi-cananə könül mürği şikar oldı.

Könül mürği əgər zülfi-siyəhdə aşiyan etdi,
Nəsimi-sübh, cövri-şanə, gəl gör, necə qan etdi!

Fəğan bu gərdişi-əflakdən, xari-cəfakarı
Gülüstani-məhəbbətdə gülə gör pasiban etdi!

Çıxarsam gözlərimi xanəsindən, etmin mən’im,
Zibəs ki ağladı, xəlqə mənim sirrim əyan etdi!

Təriqi-eşqdə varın yox et, ol yarına vasil,
Yetər canənə ol aşiq ki, əvvəl tərki-can etdi.

Necə gülsün yüzüm, qan oldı könlüm hicr cövrindən,
Məni nakam edüb gərdun, rəqibi kamran etdi.

Rəqibin Həqq vücudini ədəm qılsın vücudim tək,
Məni həmçeşmlər yanında rüsvayi-cəhan etdi.

Çü verdi cami-mey piri-muğan dəstimə, nuş etdüm,
Məni ol badə ilə, Sağəri, pəs nüktədan etdi.

Zülf dövründə könül mürği pərişan oldı,
O qara günlümə zülfün teli zindan oldı.

Vəsldən ötri fəğan eyləmənəm hicranda,
Qismətim ruzi-əzəldən bana hicran oldı.

Mey kimi saldı ayağına, ayağdan düşdim,
Hər görən kimsənə əhvalıma giryan oldı.

Göz yaşı oldı səbəb sirrimi faş eyləməgə,
Eşq odı məxfiydi, dildə nümayan oldı.

Eşq bəhrində dolandum otuz il, seyr etdüm,
Hasilim bəhrdə çox lö'löi-qəltan oldı.

Mən vəfa görmədüm aləmdə cəfadan qeyri,
Axtaran kimsə onı cümlə peşiman oldı.

Sağəri ta ki içüb badeyi-eşqin camın,
Təb' mövzun olub, sahibi-divan oldı.

Bilmirəm harda qalub sərvi-rəvanım, gəlmədi,
Ruh tək getdi bədəndən, cismə canım gəlmədi.

Yoxsa bir əğyarə uydı, saldı gözdən aşiqi,
Gözimi yolda qoyub ol mehribanım gəlmədi?

Qarət etdi dinlə imanımı bir büt bu gün,
Bilmirəm bais nədir, dinü imanım gəlmədi?

Tutiyi-şövqim dilər şəkkər vüsalın, ey gözəl!
Harda qaldı, bilmirəm, şirinzəbanım, gəlmədi?

Eşq şəhrinə düşüb rəxnə, xərab olmaqdadur,
Mülki-eşqi qılmaqa mə’mur canım gəlmədi.

Qaşı tək qəddimi döndərdi kəmanə hicrdə,
Qəmzeyi-xunrizlə qaşı kəmanım gəlmədi.

Qət’ qıldum vəsldən ümmidimi mən, Sağəri!
Çıxdı ərşə firqətdə əlamanım gəlmədi.

O gündən kim qəmi-eşqin könüldə üstuvar oldı,
Bana çox mübhəm işlər dəhr içində aşikar oldı.

Fəraqü vəsl rəmzin anladum kim zəhrü şəkkərdir,
Ümidü bim fikrilə vücudim biqərar oldı.

Mənim hicran evimə bas qədəm min nazlə bir dəm,
Dağıldı xaneyi-vəslim, necə gör, tar-mar oldı!

Nigarım tifldir – qafil mənim əhvali-zarımdan,
Salub gözdən məni nadan, gedüb əğyarə yar oldı.

Bu gün gördüm nigarımı rəqibə həmnişin olmuş,
Görəndə aşiqi-zarın saraldı, şərmsar oldı.

Xəyaliylə gedüb xabə könül kim, yarımı görsün,
Cəmalın görməyüb rö'yadə, bəstər bir məzar oldı.

Səni xar eyləsin aləmdə mən tək Xaliqi-yekta,
Necə kim Sağəri hicran evində xarü zar oldı!

Vəsldə qəhr qılub aşiqə canan getdi,
Ruhdı cismimə, cismimi qoyub can getdi.

Üzümi tirə qılub zülfi-pərişanı kimi,
Nəzərimdən o zəman kim, məhi-Kən'an getdi.

Badi-hicrani-sitəm əsdi gülüstanimizə,
Vəsl gülzarı xəzan oldı, gülüstan getdi.

Qılmamış şərh qəmi-hicri büti-kafərkiş,
Zülf tək könlümizi qıldı pərişan, getdi.

Rəxti-gülgunlə rəxş üzrə nigarım gördüm,
Nəzərimdən, deyəsən, atəşi-suzan getdi.

Vəsldən eylədi məhrum məni dövri-fələk,
Olacaq bir də deyüm: şükr ki, hicran getdi?

Suzi-hicranə salub canımı bir kafərkiş,
Sağəri, eyş evin eylədi viran getdi.

İtirüb aşiqi-biçarə gəzər dilbərini,
Axtarur kuçəbəkuçə tapa gülpeykərini.

Gər soruşsan ki, nolub, aşiq, hicran gecəsi,
Atəşi-hicr verübdür yelə xakistərini?

Dəhrdə gülmədi, hərgiz, rüxi-zərdim bir dəm,
Yazdılar ruzi-əzəldən bana qəm kişvərini.

Vəh nə aləmdi məhəbbətdə ki, məqdur olmaz
Payi-mə'şuqə qoya əczlə aşiq sərini?

Ey könül, nalə qılub dadü fəğan eyləgilən,
Necə gör xar elədi eşqdə öz çakərini!

Görsə gər çöhreyi-pakini fələk bir kərrə,
Dəxi rövşən eləməz mehrü məhi-ənvərini.

Bircə rəhm eyləgilən aşiqinə, ey kafər,
Yanduma atəşi-hicranə dəxi Sağərini!

Göstərüb təl’ətini eylədi divanə bəni,
Şəm’i-rüxsarinə yar eylədi pərvanə bəni.

Gözlərim bəhri urub mövc, töküb qanlu sirişk,
Ləblərün fikri salubdur necə gör qanə bəni!

Aşiqə mövt əyan oldı, dəmi-rehlətdir,
Yar əğyarə olub yar, atub yanə bəni.

Gülməsün çöhrəsi dünyadə, pərişan olsun,
Kim ki həsrət qoyub ol zülfi-pərişanə bəni!

Sərbülənd eylədi mə’şuq bu gün aşiqini,
Ey Xuda, eylə fəda bir belə mehmanə bəni!

Yoxdu bir vasitə vəslinə Xudadan qeyri,
Yetirən Həqq özidür bir belə cananə bəni.

Bəxt yar olmadı, vəslinə yetişdüm yarın,
Genə möhtac elədi, Sağəri, hicranə bəni.

Qılur rövşən gözüm baxduqca hər dəm mah siması,
Məni məxmur edübdür çeşmi-məstü ruyi-zibası.

Belə dağ eyləyübdür cismü canım daği-hicranın,
Bana bir ləzzəti-izəmdi bil kim, həşri-qovğası.

Rəqibi-rusiyəh mane' olur, qoymaz ki, qətl etsün,
Vəli qətl eyləməkdə aşiqini yoxdu pərvası.

Könüllər mülkini təsxir edübdür hüsni-rəftarı,
Alubdur ixtiyarı xəlqdən ol ruyi-rə'nası.

Mənim tək hiç kəs qərq olmadı dəryayi-eşq içrə,
Sınub kəştiyi-səbrim, qərq edübdür eşq dəryası.

Görəndə aşiqi-biçarə mə'şuqin ölür, bişəkk,
Verür can tazədən hər aşiqə mə'şuq iması.

Tərəhhüm eylə, kafər, Sağəri bimari-eşqindir,
Fəraqında kor oldı ağlamaqdan çeşmi-binası.

Hər dəm ki görsəm qəddi-sərvi-rəvanımı,
Cism içrə tapmaram dəxi ruhi-rəvanımı.

Hiç kimsə bilmədi ki, məni öldürən nədir,
Mə'şuq bildi eşqdə zari-nihanımı.

Səd şükr, hasil oldı muradım nigardən,
Peykan, qəmzə, məst gözi tökdi qanımı.

Möhlət ver, ey əcəl, yetişüm yarə bir də mən,
Qurban edüm o dilbərə bu xəstə canımı.

Yoxdur dilim ki, şərh qılum dərdimi, könül!
Lal eyləyübdi atəşi-hicran zəbanımı.

Ey eşq, eylədün məni divanə aqibət,
Dərk edə bilmərəm dəxi sudü ziyanımı.

Bir şux, gül'üzari-vəfadar, çeşmi-məst,
Ey Sağəri, dağıtdı necə xanimanımı!

Cəbr edüb dövri-fələk ayırdı məndən yarımı,
Eylədi qəmgin bəni, şad eylədi əğyarımı.

Səbrim-aramım gedər, ruzi-qiyamət faş olur
Ol zəman kim, görməsəm mən çöhreyi-dildarımı.

Gülüstani-vəsldə əfğanü fəryadım görüb,
Çərxi-dun qıldı xəzan min zülmlə gülzarımı.

Çün təriqi-eşqə mən basdum qədəm ruzi-əzəl,
Səlb qıldum bu təriqi-Həqqdə nəngü arımı.

Bu xəyaliylə əcəl dutdı giribanım mənim,
Qoymadum payinə bir dəm çöhreyi-rüxsarımı.

Cəhd qıldum, yetmədüm vəslinə ol hürivəşin,
Yandudı hicran odına yar cismi-zarımı.

Sağəri, etmə şikayət yaridən aləmdə sən,
Tifldir – nadan, olur aqil, edər timarımı.

Əsdi xəzan yeli dağıdub aşiyanəmi,
Gülzar içində qoymadı qalsın nişanəmi.

Aşiqliqim hekayətini bilməmişdi xəlq,
Qıldı səmər fəraq odı xəlqə fəsanəmi.

Hər hiylə eylədüm ki, yetəm vəslinə, vəli,
Qət' eylədi ədavətilə hər bəhanəmi.

Qaçdı kənarə xovfa düşüb mahtəl'ətim,
Hicran evində gördi nigarım zəbanəmi.

Səyyad həbs qıldı qəfəsdə bəni, əsir,
Etməz xilas, qət' edüb abi-danəmi.

Qoymaz məni vüsalə yetəm atəşi-fəraq,
Biganə qıldı hicr bana ol yeganəmi.

Etdi nisar gövhərini didə mərdümi,
Gör, Sağəri, tükətdi tükənməz xəzanəmi.

Yandırdı cismim atəşi-eşqin şərarəsi,
Bir dərdə düşmüşəm ki, onun yoxdu çarəsi.

Vəslindən ötri didələrim bəs ki ağladı,
Oldı səfid mərdüməki-didə qarəsi.

Kafər degil, tərəhhüm edər dilbərim bana,
Hicran evində düşsə bana gər nəzarəsi.

Vəsl cəhanda olmadı qismət bana, fələk,
Yansın fəraq odına bu bəxtim sitarəsi!

Hər kim ki düşdi bəhri-fəraqına qərq olub,
Bir bəhrdir əmiq ki, yoxdur anın kənarəsi.

Yox naxuda ki, dutsun əlimi, Xuda, mənim,
Sındı vüsal kəştisi, yox təxtə parəsi.

Oldı xəzani-vüsal gülüstan, Sağəri,
Lal oldı hicr evində o gülşən həzarəsi.

Çərxi-gərdun dövr edüb gör necə rəftar eylədi!
Buteyi-hicran ara cismim giriftar eylədi.

Yarımı məndən cüda qıldı, tərəhhüm etmədi,
Yandıdı hicranda canım çərx, bədkar eylədi.

Yadə salmaz aşiqi ol tifli-nadan, neyləyim,
Ruzigarımı mənim ol türrə tək tar eylədi?

Zülmlə qıldı cüda yari-vəfadarım fələk,
Yarımı, dildarımı canıma əğyar eylədi.

Dilbərim bir tifli-nadandır, içər qanım mənim,
Aşiqi zar eyləyüb, əğyarı timar eylədi.

Sərnigun olsun görüm bu çərxi-duni-lacivərd! –
Pürcəfa yarımı əğyarə vəfadar eylədi.

Eylədi xəndan rəqibi vəsli-yarımla fələk,
Sağəri biçarəni hicranda qəmxar eylədi.

Mən eşitdüm kim, olub əğyar vəslin məhrəmi,
Öldürür axır fəraqında məni hicran qəmi.

Atəşi-hicran mənim dağ eyləyübdür sinəmi,
Yaxşı olmaz, həşrə tək olmasa vəslin mərhəmi.

Cismimi xakistər eylərdi fəraqın atəşi,
Ahi-sərdim eylədi imdad, bir də göz nəmi.

Görməsəm bir gün üzari-dilbəri-məhtəl'ətin,
Eylərəm zir-zəbər ahimlə külli-aləmi.

Eşqdən əl çəkmərəm ta var həyatım cismdə,
Cismimi təsxir edübdür eşqi-ismi-ə'zəmi.

Eşqdən əl çəkməgim mümkün degil, ta əl çəküm,
Eşqlə xəlq eyləyübdür Həqq cümlə adəmi.

Aqil olmaz Sağəri, divaneyi-gülçöhrədir,
Oldı zənciri-cünunim baisi-zülfi-xəmi.

Ey könül, asi olub Həqqə, günah etmə dəxi!
Çöhreyi-bütlərə eşqilə nigah etmə dəxi!

Kami-dil hasil olub vəsli-nigarə yetdin,
Bəsdi, hicran gecəsi bu qədər ah etmə dəxi!

Kəs nəzər canibi-dildardan, ey dil, bu qədər
Cismimi atəşi-hicranə təbah etmə dəxi!

Ey gözüm, çöhreyi-məhvəşlərə baxma, həzər et!
Günimi zülf kimi bir də siyah etmə dəxi!

Tərk qıl eşqi-məcazini, könül, üsyandır!
Dilrüba xeylini dil mülkünə şah etmə dəxi!

Ömri sərf eyləgilən eşqi-həqiqidə, könül!
Tövbə qıl Həqqinə, üsyan elə etmə dəxi!

Talibi-axirət ol, Sağəri, dünyadan keç,
Tövbə qıl zişti-əməl, bəsdi, günah etmə dəxi!

Tapşurmuşam o zülfi-pərişanə könlümi,
Qorxum budur ki, qanə sala şanə könlümi.

Düşməzdi dami-zülfinə hərgiz könül quşı,
Saldı kəməndi-zülfinə bir danə könlümi.

Müjganü zülfi qətlimə iqdam edüb, çəkər
Hər yanda görsə hər biri bir yanə könlümi.

Ol türreyi-müsəlsələ içrə vətən dutub,
Əcri budur ki, döndərsin qanə könlümi.

Açılmadı bu qanə dönən qönçə tək könül,
Verdüm o gün ki qönçeyi-xəndanə könlümi.

Peyvəstə qaşları bana tiğü kəman çəkər,
Qılmış nişanə navəki-müjganə könlümi.

Sınsın dişi o şanə ki, zülfin telin qırar,
Şanə qılub o zülfdə divanə könlümi.

Ruzi-ələst badeyi-lə'linlə məst olub,
Xəlq etdi Həqq, Sağəri, meyxanə könlümi.

Vermə könül o zülfi-pərişanə, Sağəri!
Əqrəb evində müşkil olur xanə, Sağəri!

Ol türrə içrə vermədi təmkin bu könlümə,
Gahi sabah, gəh sitəmi-şanə, Sağəri!

Əyyami-vəsl qədrini çün bilmədün, könül!
Yan həsrətilə atəşi-hicranə, Sağəri!

Hicranda həsrətilə verüb canını, gözəl,
Oldı fəda sənin kimi cananə Sağəri.

Çak etdi matəmində giribanını, göz aç,
Bir sal nəzər o çaki-giribanə, Sağəri!

Zənciri-zülfə düşməzdi mürği-dil, vəli,
Saldı kəməndi-zülfinə bir danə, Sağəri!

Ey padişah, lütf qılub eylə bir nəzər,
Gör, sağərimdə badə dönüb qanə, Sağəri!

## MÜSƏDDƏS[32]

Bikəsü biçareəm hicran evində, dilkəbab,
Ənbəri-zülfin kimi aşüftə, əhvalım xərab,
Didə giryan, sinə suzan, dərd bihəddü hesab,
Suzi-hicranında hərgiz görməyübdür didə xab,
Ol qədər hicran odunda çəkmişəm dərdü əzab,
Afitabi-çöhrədən, lütf eylə, bir dəm al niqab,
Əbri-zülf içrə nihan etmə yüzin, ey afitab,
Atəşi-hicranda saldun könlümə çox iztirab,
Gəl, məni azad qıl hicran qəmindən, et səvab,
Şərhi-hal etdüm nigarə, vermədi əsla cəvab,

Qətlim içün eylədüm bir tifli-nadan intixab,
Atəşi-hicranə yandum, ey əcəl, eylə şitab!

Yandurur cismləvü canım atəşi-hicran hənuz,
Qalmışam zülmati-hicranında sərgərdan hənuz,
Şəm'i-suzandır qəmi-eşqində cismü can hənuz,
Hicr evində didələrdən cari olmuş qan hənuz,
Dərdimizə olmayubdur vəsldən dərman hənuz,
Sirri-eşqin saxlaram mən sinədə pünhan hənuz,
Rəhm qılmaz aşiqə ol afəti-dövran hənuz,
Mərdümi-didəm fəraqında sənin giryan hənuz,
Gəlmədi kaşanəmə ol Yusifi-Kən'an hənuz,
Müşkili-hicranı olmaz, neyləyim, asan hənuz,

Qətlim içün eylədüm bir tifli-nadan intixab,
Atəşi-hicranə yandum, ey əcəl, eylə şitab!

---

32 Əslində, müəşşər-tərcibənd. Bu haqda "Ön söz"də ətraflı bəhs olunmuşur.

Könlümün hicran odında səxt ahü zarı var,
Aşiqi-biçarənin dildari-dilazarı var,
Xarsız kim gördi bir gül, hər gülün bir xarı var,
Heyf kim, hər aşiqin mə'şuqinin əğyarı var,
Səndə, ey gülrüx, əgərçi arizi-gülnarı var,
Hicr odunda aşiqin də ahü atəşbarı var,
Hansı aşiqdir sənin tək nazənin dildarı var? –
Sərvqədd, mahtəl'ətü ləhceyi-göftarı var,
Baməlahət, sərvqamət, məh kimi rüxsarı var,
Necə meyl eylər könül qılmanə, sən tək yarı var?!

Qətlim içün eylədüm bir tifli-nadan intixab,
Atəşi-hicranə yandum, ey əcəl, eylə şitab!

Hər vüsalın axırı aləmdə kim, hicran olur,
Atəşi-hicranda aşiq daima suzan olur.
Böylə bilmə, yanmaqa hicran odı asan olur,
Sənsiz, ey həmdəm, belə bilmə ki, məndə can olur,
Eşq dərdini çəkən aləmdə sərgərdan olur,
Görsə zahid çöhrəni, mən tək sana heyran olur,
Göz yaşımdan gəl gör, ey gül, damənim əlvan olur,
Qətrə-qətrə cəm' olub çeşmim yaşı ümman olur,
Tərk qılma eşq, ey dil, kim, sana üsyan olur,
Hicr dərdinə vüsalın şərbəti-dərman olur,

Qətlim içün eylədüm bir tifli-nadan intixab,
Atəşi-hicranə yandum, ey əcəl, eylə şitab!

Neyləyim, canan olubdur aşiqindən bədgüman,
Xanəmi viran edüb, gəlməz dəxi namehriban,
Qəddimi hicran evində xəm qılub etdi kəman,
Vəqtdür, bir qıl mədəd, biçareəm, ey asiman,

Rəhm qıl, ey çərxi-dun, aldırma canım, əlaman,
Qılmadı tə’sir ona qıldum bəsi ahü fəğan,
Göz tökər qanlu yaşın, könlüm olub bir ləxtə qan,
Dərdimi şərh etməgə yoxdur, nedim, məndə zəban,
Dilbəri-məhtəl’ətim qıldı yüzin məndən nihan,
Etmək olmaz sirri-eşq, neylim, xəlqə əyan,

Qətlim içün eylədüm bir tifli-nadan intixab,
Atəşi-hicranə yandum, ey əcəl, eylə şitab!

Həqq çün yoxdan vücudimi mənim var eylədi,
Atəşi-eşqə mənim könlüm giriftar eylədi,
Dideyi-məstin məni eşqində bimar eylədi,
Etmədi zülmü sitəm gərdun bana, yar eylədi,
Eşqdə çox zülmlər həqqimdə dildar eylədi,
Bilmərəm bu çərxi-gərdun necə rəftar eylədi? –
Mehriban yarımı mən bədbəxtə əğyar eylədi,
Canım aldı, hər zəman qeyrlə göftar eylədi,
Döndərüb yüz, qaçdı məndən dilbərim, ar eylədi,
Sinəmi məcruh edüb, əğyarı timar eylədi,

Qətlim içün eylədüm bir tifli-nadan intixab,
Atəşi-hicranə yandum, ey əcəl, eylə şitab!

Atəşi-hicran alubdur ixtiyarım, Sağəri!
Qərq olubdur bəhri-xunə cismi-zarım, Sağəri!
Harda qaldı, gəlmədi ol gül’üzarım, Sağəri!
Yarsız olmaz mənim səbrü qərarım, Sağəri!
Yar olub əğyarə dildarü nigarım, Sağəri!
Atəşi-hicranə saldı, getdi yarım, Sağəri,

Gülşənim oldı xəzan, getdi bəharım, Sağəri!
Zülf tək qarə olubdur ruzgarım, Sağəri!
Oldı müşkil hicr evində karü barım, Sağəri!
Atəşi-hicranə yandı nəngü arım, Sağəri!

Qətlim içün eylədüm bir tifli-nadan intixab,
Atəşi-hicranə yandum, ey əcəl, eylə şitab!

## SAQİNAMƏ

Gətür, saqi, meyi-gülgun bu bəzmə, növbəhar oldı,
Ənadil naləsi gülzar içində aşikar oldı.

Açıldı qönçə gül şaxda, bülbül fəğan eylər,
Qəmari sərvdə nalan olub, xoşruzgar oldı.

Açub göz nərgisi-şəhla, edər nəzzarə gülzarə,
Pərişan etdi giysu, sünbüli-tər biqərar oldı.

Behökmi-Xaliqi-Yezdan, beəmri-Qadiri-Sübhan
Olub kuhü çəmən əlvan, səhra laləzar oldı.

Gəlüb rəqsə çəmən məhbubəsi, cövlan edər hər yan,
Çəməndə xari-dun, min şükr Həqqə, zarü xar oldı!

Cəhanə eyşü işrət babini açdı şəhi-Yezdan,
Qılubdur zərreyi-imkanı Həqq zatı içün bürhan.

Gətür, saqi, meyi-saf ki, rövzə rahətəfzadır,
Açıldı qönçeyi-gül, gülşən içrə şur, qovğadır.

Göz aç, nəzzarə qıl gülzarə, saqi, növbəhar oldı,
Nəzər sal hər tərəf, qafil, oturma, xoş təmaşadır!

Nəzər sal sün'i-Həqqə, qafil olma, Həqqi yad eylə,
Bu gülşən güllərinin bərgi həmdi-Həqqə guyadır.

Bu güllər bir əsərdir ol Müəssirdən gülüstandə,
Nəzər qılsan, taparsan Həqqi, bunlardan hüveydadır.

Gedüb əyyami-möhnət, gəlmədi işrət eyşü cəşn ilə,
Sana əsbabi-cəm'iyyət bu gülşəndə mühəyyadır.

Cəhanə eyşü işrət babini açdı şəhi-Yezdan,
Qılubdur zərreyi-imkanı Həqq zatı içün bürhan.

Gətür, saqi, dəmadəm badəni kim, vəqti-fürsətdir,
Məni məst eylə kim, gülzari-eyşim rəşki-cənnətdir.

Təğafül qılma, saqi, keçdi ömrüm künci-möhnətdə,
Məni məst eylə, ey saqi, keçüb ömrüm, qənimətdir.

Nəzər qıl, ey gözüm, saqi üzarına, nəzər kəsmə,
Nigarın çöhrəsi Həqq zatına bir türfə ayətdir.

Könül, pərvaz qıl, gülzari-cənnət içrə seyr eylə,
Bu dünya gülüstanı arifə çün künci-möhnətdir.

Gülüstani-cəhan seyrin tərk et, qılma nəzzarə,
Bu gülzarın təmaşası dil əhlinə küdurətdir.

Cəhanə eyşü işrət babini açdı şəhi-Yezdan,
Qılubdur zərreyi-imkanı Həqq zatı içün bürhan.

Gətür, saqi, meyi-baqi, dolandur bəzm ara cami,
Məni sərməst qıl, ta bilməyüm ənduhi-əyyami.

Qəmariyü ənadil şurə gəlmiş gülüstan içrə,
Məni məxmur qıl, məhv eylə könlümdən bu alami.

Gülüstani-vüsalindən cüda qıldı məni əğyar,
Mənim ömrüm təmam oldı, fəraqın yox sərəncami.

Məni divanə qıldı eşqi-gülzarında bir gülrux,
Tərəhhüm etmədi, hicranda öldürdi bu nakami.

Xilas etdi məni qəmdən o gülrux dilbərim, saqi,
Gülüstani-məhəbbətdə yetişdi dövlət peyğami.

Cəhanə eyşü işrət babini açdı şəhi-Yezdan,
Qılubdur zərreyi-imkanı Həqq zatı içün bürhan.

Gətür, saqi, qədəh kim, qönçələr şax üzrə xəndandır,
Ənadil şaxi-işrətdə qılur pərvaz, nalandır.

Açdı türfə güllər gülüstani-dəhr ara, saqi,
Məni bir camlə məst eylə, könlüm çox pərişandır.

Sürurü eyşü cəşn eylə, bəhar əyyamıdır, saqi,
Məni məxmur qıl meydən, qəmim dildə firavandır.

Bu nə gülzari-cənnətdir, bu nə şuri-məhəbbətdir? –
Bu gün əyyami-işrətdir, ənadillər qəzəlxandır.

Gülüstani-məhəbbətdə fəğanü nalə qıl hər dəm,
Bəhar əyyamıdır, saqi, könlüdə eşqi-canandır.

Cəhanə eyşü işrət babini açdı şəhi-Yezdan,
Qılubdur zərreyi-imkanı Həqq zatı içün bürhan.

# MÜXƏMMƏSLƏR

## 1

Hər zəman kim nəzərim ol büti-rə'nayə düşər,
Olı divanə könül eşqdə, pərvayə düşər,
Əqrəbi-zülfdən ay çöhrəsinə sayə düşər,
Tərsə bax, çöhrəsini dur edər, ayə düşər,
Atəşi-eşqə düşən eşqdə qovğayə düşər.

Bəs ki könlüm quşı hicranda qılub naləvü ah,
Ruzgarım olmuş zülfi-siyəh kimi siyah,
Atəşi-suzi-fəraqın bədənim qıldı təbah,
Taqətim yoxdu yanam hicrdə, Allaha pənah!
Nə qədər cəhd edərəm vəslinə, fərdayə düşər.

Həzər et, urmagilən zülfünə hər dəm şanə,
Rəhm elə könlümə, etmə sən onı divanə,
Tabe'i-küfr olub yetdi könül imanə,
Arizi-şəm'inə olmuş bu könül pərvanə,
Yandurur balü pərin, kimsə ki sevdayə düşər.

Göz qalub yolda, nigarım məni yad eyləmədi,
Atəşi-hicr ara könlümi şad eyləmədi,
Məni odlarə salub, həlli-murad eyləmədi,
Od dutub yandı könül, bir kəsə dad eyləmədi,
Dad qılmaq bu təriqətdə fürumayə düşər.

Ey könül, bəsdi dəxi, naleyi-əfğan etmə!
Məni qanlarə salub qəsdi-dilü can etmə!
Zülf tək sən məni aləmdə pərişan etmə!
Paybəndi-ələmi-atəşi-hicran etmə!
Sağəri, nalə səsi günbədi-xəzrayə düşər.

2

Bir mələksima məni hüsnünə heyran eylədi,
Paybəndi-atəşi-suzani-hicran eylədi,
Bilmərəm bu çərxi-gərdun necə dövran eylədi,
Ayırub səndən məni qəsdi-dilü can eylədi,
Zülfi-pürçin kimi könlüm pərişan eylədi.

Vəsl evində, neyləyim, peyvəstə yarım olmadı,
Əhdü peymanında sabit ol nigarım olmadı,
Səndən ayru, dilbərim, hərgiz qərarım olmadı,
Zülməti-hicran ara hərgiz nəharım olmadı
Qismətim ruzi-əzəldən künci-hicran eylədi.

Sənsiz, ey gülrüx cəhanda hiç ləzzət görmədüm,
Vəsldən qeyri, nigarım, yaxşı ne'mət görmədüm,
Könlümi fikrü xəyalından fərağət görmədüm,
Atəşi-hicranda bir dəm istirahət görmədüm,
Sinəmi dağ eyləyüb cismimi suzan eylədi.

Arizi tək dilbərün aləmdə bir gülzar yox,
Şahidani-dəhr ara bir böylə xoşrəftar yox,
Yar çox dutdum cəhanda, bir belə dildar yox,
Hüsnü xülqündə onun sən bilmə bir söz var-yox!
Eyb oldur kim, nigar əğyarı mehman eylədi.

Taqətim taq oldı hicranında, ey əbrukəman!
Daməni-vəsl gedüb əldən yaman oldı, yaman!
Atəşi-hicran ara canın verür bir natəvan,
Rəhm elə, kafər, vüsalınla əlin dut, ələman!
Atəşi-eşqin məni hicranda büryan eylədi.

Atəşi-hicran olubdur səndən ayru bəstərim,
Aşiqi saldun nəzərdən, dilbəri-məhpeykərim!

Nalədən qeyri fəraqında tapulmaz yavərim,
Olmadı bir kimsənə rahi-vüsalə rəhbərim,
Göz yaşımı hicrdə bir bəhri-ümman eylədi.

Dilbərim, gəl rəhm qıl, qılma bana cövrü cəfa!
Aşiqin könlüni sındırmaq cəfadır – çox xəta!
Göstərübsən aşiqə, mə’şuq, bəsi mehrü vəfa!
Sağəri biçarədir, görmə ona zülm rəva,
Qalmadı bir zülm aləmdə, nümayan eylədi.

**3**

Tazədən düşdi könül zülfə, pərişan oldı,
Vəh nə zülfdür ki, bana bəndilə zindan oldı?
Atəşi-eşqə salub könlümi, bil, qan oldı,
Ol zəmandan ki, bəni-aşiqə hicran oldı,
Xaneyi-eyşimi gəl gör necə viran oldı!

Düşdi zənciri-cününə genə fərzanə könül,
Paybənd oldı əcəb zülfi-pərişanə könül,
Həzər et şanədən ol zülfdə, divanə könül!
Qorxuram şanə dəgə canə, ata yanə, könül!
Şanə çün dəgdi səri-zülfə, pərişan oldı.

Hər zəman kim gözümə arizi-canan görünür,
Sanasan gözlərimə mehri-dirəxşan görünür,
Səfi-müjganı bana navəkü peykan görünür,
Bəxtimə baxdı münəccim, dedi: hicran görünür,
Getdi əyyami-vüsali, şəbi-hicran oldı.

Qətlim içün belinə bağladı yarım xəncər,
Məni öldürməgə amadə olub ol kafər,
Ey xoş ol dəm məni öldürməgə çün tiğ çəkər,
Gözlərim həsrətlə gül gözünə edə nəzər,

Can verüb şövqlə aşiq, sana qurban oldı.

Eşq ifrat ola hər kimsədə, məcnun eylər,
Döndərür halını aləmdə, digərgun eylər,
Lütf edər özgələrə, aşiqi dilxun eylər,
Məni dilgir edüb, qeyrini məmnun eylər,
Yetmədi vəslinə aşiq, cigəri qan oldı.

Salub ay çöhrəsinə zülfi-siyahü giysu,
Günimi qarə edüb, Sağəri, zülfi-hindu,
Dəhən keyfini mən anlamadum – bir səri-mu,
Anlamaq müşkil olur, nükteyi-pünhandır bu,
Baxdı hər kimsə ona, valehü heyran oldı.

**4**

Cismimi şəm' kimi eşqdə suzan etdüm,
Atəşi-hicrdə mən qəsdi-dilü can etdüm,
Bəs ki hicranda çəküb naleyi-əfğan etdüm,
Ahü fəryadımla xəlqi hirasan etdüm,
Aqibət eşqini mən xəlqə nümayan etdüm.

Olmadı yar cəfasından ola könlüm şad,
Eylərəm ahü fəğanımla cəhanı bərbad,
Qılmadı vəsl bana hicr evində imdad,
Hər zəman yar vüsalını qılur könlüm yad,
Eşq odunda dili-büryanımı suzan etdüm.

Neçə gündür ki, səri-kuyinə düşməz güzərim,
Etmərəm dərk özümi, yoxdu özümdən xəbərim,
Görməsəm çöhrəsini, nəqs olı nuri-bəsərim,
Yandı hicr atəşinə, qanə dönübdür cigərim,
Cigərim qaniylə yer yüzin əlvan etdüm.
Bəs ki, qan ağladı hicran gecəsi qəmdə gözüm,

Baxmasam ruyinə, hər dəm çürüyür nəmdə gözüm,
Qərəzim dilbəri-gülçöhrədi, yox cəm'də gözüm,
Qərq edər aləmi əşkini tökən dəmdə gözüm,
Bu bəla bəhrini mən xəlqə nümayan etdüm.

Dərmədim baği-məhəbbətdə nigarım gülini,
Salmadım ağzıma səd heyf o şirin dilini,
Sünbül gördi gözüm, yadə salub kakulini,
Qılmadum dərk nədir ağzıyla mən belini,
Zülf tək könlümi hərçənd pərişan etdüm.

Yanmaqa hicr oduna dust qəbul etdi bizi,
Qeyri şad eylədi dildar, məlul etdi bizi,
Vəsldən, neylim, əğyar nükul etdi bizi,
Sağəri, atəşi-hicran nə füzul etdi bizi?!
Ah-naləmlə bu gün yarı peşiman etdüm.

## RÜBAİYYAT

1

Ya fərdi-qədimü əhədü bihəmta,
Övsafına cümlə xəlq olubdur guya,
Dərk eyləmədi zati-vücubi mümkün,
Hər şeydə Həqq var, olmaz peyda.

**2**

Dərdimə dəva qılmadı canan əsla,
Tərk eyləmişəm vəslini, yox anda vəfa;
Hicranilə vəslə, neyləyim, olmadı fərq:
Zülm eylədi onda, görmədüm bunda səfa.

**3**

Ey Hakimi-ruzi-həşr, ey bari-Xuda,
Dutmuş yüzini dərgəhinə şahü gəda;
Düşmən məni xarü zari-dövran etdi,
Bu qüssədən, ey Xuda, məni eylə rəha.

4

Ey zati-müqəddəsin mübərra zeüyub!
Ey zahir olan zərreyi-mümkündə vücub!
Rəhm eylə mən fəqirə, qutar qəmdən,
Məni tən dutub öz lütfünə, ərbab qılub.

**5**

Ey baisi-kainat, ya miri-ərəb!
Ey mənbəi-cud, mə’dəni-helmü ədəb!
Rəhm eylə mən həqirə, yoxdur çarəm;
Düşmən məni xar edüb, bana oldı səbəb.

**6**

Hicran odı yandıdı məni, qıldı kəbab,
Rəhm eyləmədi dust bana, etdi xərab;
Məhşər güni damənim dutub dad edərəm,
Ya Rəbb, bu dildar bana verdi əzab.

**7**

Ey dil, dəxi gəl zülfi-pərişanı unut!
Ey göz, dəxi ol çöhreyi-cananı unut!
Ey Sağəri, tövbə qılgilən üsyandan,
Bəsdir dəxi, keçdi ömr, şeytanı unut!

**8**

Ey məhrux, sərvqədd, şirinhərəkat!
Üşşaqə sənin şəhdi-ləbindəndi həyat.
Məhrum məni şəhdi-ləbindən qılma,
Ta almaya cismü canımı suzi- məmat.

**9**

Dünyadə, könül, məhəbbəti-Heydəri dut!
Cəhd eyləgilən təriqi-peyğəmbəri dut!
Zülmət təriqinə, könül qoyma[33] qədəm,
Təsdiq elə Həqqi, Xaliqi-Əkbəri dut!

**10**

Ta eylədi qönçə lə'li-cananilə bəhs,
Andandı dönüb qanə, qılub canilə bəhs;
Əfsürdə olub badi-xəzandan qönçə,
Çün biədəb etdi güli-xəndanilə bəhs.

---

[33] Əlyazmasında bu sözün üstündə ikinci variant kimi "basma" sözü yazılmışdır.

**11**

Ol dəm ki vücudi-mümkün oldı hadis,
Eşq səbəb – vücudi-xəlqə bais.
Eşq olmasaydı, şey’ var olmazdı,
İllət bir olur cəhanda, olmaz salis.

**12**

Dərdi-dilimə tapulmadı hiç əlac,
Qıldı bədənim mülkini hicran tarac;
Gər vəslinə yetməsəm nigarın, billah,
Ya hicran alur canımı, ya sui-mizac.

**13**

Fəryad ki, bəhri-eşq urdı əmvac!
Qərq eylədi cismimi, bana yoxdı əlac!
Sındırdı vüsal kəştisin badi-fəraq,
Gülzari-vüsali etdi hicran tarac.

**14**

Ey zati-şərifin şərəfi-illəti-ruh!
Vey ali-lətifin məsəli-kəştiyi-Nuh!
Gər zati-şərifin olmasaydı icad,
Olmazdı cəhanda mümkünə hiç vüzuh.

**15**

Ta tiği-məhəbbət etdi cismim məcruh,
Əsrari-məhəbbət oldı aləmdə vüzuh;
Hicran odına yandı tənü cani-əziz,
Olmadı edəm nigarə dərdim məşruh.

**16**

Xoş ol ki, verürdi dəstimə yar qədəh,
Məxmur edərdi canı gülnar qədəh;

Dövrani-fələk qıldı cüda yarımdan,
Mən zəhr içirəm hicrdə, əğyar qədəh.

**17**

Zülfi kimi olmuşam pərişan, ey şeyx!
Saldı nəzərindən məni canan, ey şeyx!
Bir himmət edüb yetür vüsalinə məni,
Yandırdı tənim atəşi-hicran, ey şeyx!

**18**

Lütfündi qılan aşiqi, canan, küstax,
Könlümi edüb zülfi-pərişan küstax;
Bax, himməti-aşiqə, fəda qıldı bu gün,
Payində nigarın neçə min can, küstax.

**19**

Ya Fərdü Qədimü Əzəl, Rəbbi-Səməd!
Ya mən leysə lizatikə küfüvən əhəd!
Li əbdikəl-asi və tərəhhəm, ya Rəbb!
Qəd inqətəər-racəü min xəlq, mədəd![34]

**20**

Könlüm bu cəhanda olmadı hərgiz şad,
Qətlimə olub cəm' bu gün əhli-fəsad;
Bir bəndeyi-acizəm, sana yüz dutdum,
Ya canımı al, ya ki, bana qıl imdad.

---

[34] Rübainin mə'nası: Ey Tək, Əbədi və Əzəli (İlkin) olan, ey Yenilməz Tanrı! Ey Özünə (zatına) bir kimsə tən olmayan! Ey Tanrı, Sənə asi (ağ) olan quluna yazığın gəlsin! Yaradılmışlardan ümid üzülmüşdür, [Sən] kömək ol!

**21**

Yoxdan məni, ya Rəbb, qılubsan icad
Dünyadə bana zülm qıla əhli-fəsad?
Dünyanı bana təng edübdür düşmən,
İmdad dəmidir, bana sən qıl imdad!

**22**

Ta eşq odı dildə əyan oldı pədid,
Hər ləhzəvü hər dəmdə olub eşq məzid
Yandırdı dilü canımı xakistər edüb,
Muyi-siyəhimi eşqdən qıldı səfid.

**23**

Sud eyləməz aşiqinə zəncirü kəmənd,
Dildar vüsalıdı bana faidəmənd;
Tərk eyləməz eşq aşiqi-divanə,
Gər xəlqi-cəhan versə bana yüz min pənd.

**24**

Hicran ələmi ali-rüxüm eylədi zərd,
Ahim yeli eşqim odını qılmadı sərd;
Cananıma yetmədüm deyim dərdi-dilim,
Can çıxdı bədəndən, məni öldürdi bu dərd.

**25**

Qətlimə yazub dilbəri-canan kağız,
Səd şükr Xudamə tökəcək qan kağız;
Səd heyf ki, yarə can fəda eyləmədüm,
Öldürdi məni həsrəti-hicran, kağız!

**26**

Ey ləfzi-ləbin ləziz, göftar ləziz!
Didarü rüxin qəndi-şəkərvar ləziz!

Lə’lin kimi şəhdi-qəndü şəkkər olmaz,
Kim dedi ləbin kimi şəkər var ləziz?

**27**

Ta aşiqə yar ərzi-rüxsar eylər,
Hər ləhzə onı dərdə giriftar eylər;
Əğyarı edər vəslinə məhrəm kafər,
Mə’şuqə məgər aşiqini xar eylər?

**28**

Lə’lin həvəsi bağrımızı qan eylər,
Zülfün məni hər ləhzə pərişan eylər;
Hicran sitəmi dərdimi əfzun etdi,
Dərdimə mənim vüsal dərman eylər.

**29**

Ya şahi-vilayət, məni dildarə yetür!
Ol dilbəri-məhbubi-vəfadarə yetür!
Kəs qeyrdən ülfətin, bana mail qıl,
Hər vəz’lə olsa, sən məni yarə yetür!

**30**

Ey Padişəhi-Rəhim, ya Rəbbi-Qəfur!
Gətdi məni təngə səxt bu dari-qürur.
Ya canımı al, xilas eylə qəmdən,
Ya vəsli-nigarilə məni qıl məsrur.

**31**

Yoxdur bana hicr evində bir kəs yavər,
Saldı oda cismi-zarımı bir kafər;
Öldürdi məni atəşi-hicran içrə,
Bir dilbəri-sərvqədd, bir mahi-simbər.

**32**

Hər kəs ki fəraq odunda suzan olmaz,
Vəslə yetişüb vasili-canan olmaz;
Hər kəs ki keçər canü dilindən, bişəkk,
Canana yetər, hiç peşiman olmaz.

**33**

Qəhr eylədi, hiç yar göftar etməz,
Mənzurini aşiqinə izhar etməz;
Bəxtim elə yatdı xabi-qəflətdə[35] bu gün,
Min suri-qiyamət onı bidar etməz.

**34**

Yar eyləmədi aşiqini yad hənuz,
Könlümi mənim eyləmədi şad hənuz;
Yandırdı fəraq atəşinə cismi-tənim,
Dildar məni qılmadı azad hənuz.

**35**

Ey dil, təmə' ol zülfi-pərişandan kəs,
Ya candan əl çəküb təmə' andan kəs;
Var ilə vüsali-yar məqdur olmaz,
Yox qıl özüni, ümidini andan kəs.

**36**

Ta eylədüm ol zülfi-pərişanə həvəs,
Eşqində onun eyləmədüm canə həvəs;
Mən maili-vəsldim, o kafər, neylim,
Mən' eylədi vəsli, qıldı hicranə həvəs.

---

[35] Əlyazmada "qəfldə" yazılmışdır.

**37**

Fəryad ki, hicr odı məni zar etmiş!
Min dərdü-qəmü suzə giriftar etmiş!
Dərdimin əlacı vəsldir, əl yetməz,
Bimar gözi cismimi bimar etmiş.

**38**

Səd heyf vüsal getdi, hicran olmuş!
Gör qüssəvü qəmdə könlümi, qan olmuş!
Axır məni öldürür bu qəm aləmdə:
Yarım gedüb əğyarimə canan olmuş.

**39**

Hicranilə qıldı canə dildar qisas,
Canıma qılub yari-vəfadar qisas;
Qıldı hərəmi-vəslinə qeyri küstax,
Öldürdi məni, eylədi əğyar qisas.

**40**

Könlüm quşıdur zülfi-pərişanə həris,
Ol daneyi-xal, tiri-müjganə həris;
Mən' eyləmə şərbəti-ləbindən məni sən,
Can dərdə düşüb, olubdı dərmanə həris.

**41**

Bu aşiqi-zarə ruyi-xubandı qərəz,
Könlüm quşına zülfi-pərişandı qərəz;
Mən vəslinə talibəm, əlim yetməz ona,
Mə'şuqimizə atəşi-hicrandı qərəz.

**42**

Ey qasid, elə ərzimi dildarimə ərz!
Əhvalımı qıl yari-vəfadarimə ərz!

Hicran odı yandurub məni qıldı kəbab,
Gördün məni sən nə növ', qıl yarimə ərz!

**43**

Həqq ruzi-əzəl vermədi imkanə nəşat,
Bu deyri-fənadə yoxdı insanə nəşat;
Dünyadə nəşat edərmi arif hərgiz,
Qılmaz bu dari-fənadə fərzanə nəşat.

**44**

Yüz[36] yolda qalubdur intizar, ey vaiz!
Getmişdi gələ, gəlmədi yar, ey vaiz!
Qılman sənin olsun, bana bir yar gərək,
Yoxdur dəxi məndə bir qərar, ey vaiz!

**45**

Nəzzareyi-ruyinə həyadır mane'
Sevdayi-məhəbbət məni qıldı zaye';
Vəslində qərarım olmadı şövqümdən,
Hicrana ol səbəbdən oldum qane'.

**46**

Düşdün qəmi-eşqə, eylə canana təmə',
Bu eşqdə qılma sən dəxi canə təmə';
Müjganı çəküb səf kim, edə qətl məni,
Səfk etməgə cismi eylədi qanə təmə'.

**47**

Təşbih degil çöhreyi-canana çırağ,
Gər yarimlə olubdı həmxanə çırağ;
Hər bəzmdə ruyi-yar rövşən olsa,
Mən istəmənəm həşrə kimi yanə çırağ.

---

[36] Yəqin ki, "göz" yerinə səhvən "yüz" yazılmışdır.

**48**

Fəryad, çəkübdi sinəmə hicran dağ!
Canım bu bəladan olmadı hiç fərağ;
Olmuş günüm elə qara hicranında,
Rövşən olmaz, vəsl odı yandırsa çırağ.

**49**

Yox məhvəş içində sən kimi kimsə zərif,
Göftarı məlih, cismü rüxsarı lətif;
Bir böylə bəşər görünməyüb aləmdə,
Bir nurdı pak, xəlq edüb Həqqi-Şərif.

**50**

Dildari-cəfakardə yoxdur əltaf,
Bir və’də bana verdi, olub və’dəxilaf;
Mən aşiqi-sadiqəm rəhi-eşqində,
Mə’şuqdə xəlq etməyüb Həqq insaf.

**51**

Ol dəm ki olub xəlq vücudi-aşiq
Əsrari-həqiqətdə gördi sadiq,
Əhkami-şərifi qıldı təfviz,
İcra eyləmək hökminə gördi layiq.

**52**

Hicranda bana fikrü xəyalındı rəfiq,
Səd heyf bana verrmədi vəslin tövfiq!
Mə’şuqimi tapmadum yetəm vəslinə mən,
Dünyadə bəsi eyləmişəm qət’i-təriq.

**53**

Hicranda bana ənisi-yavərdir eşq,
Vəslinə nigarın bana rəhbərdir eşq;
Ayineyi-eşqə ver səfa, ey arif,
Zati-əzələ məzhərü əzhərdir eşq.

**54**

Billəm məni aqibət qılur eşq həlak,
Mən aşiqi-sadiqəm, bana yoxdur bak;
Alayişi-vəsldən xilas etdi məni,
Hicran odı yandıdı məni, eylədi pak.

**55**

Hər kimsə ki aşiq oldı, divanə gərək,
Eşq atəşinə yanmaqa pərvanə gərək;
Hər kimsə ki yanmadı fəraq atəşinə,
Bişəkk, cəhənnəmdə o kəs yanə gərək.

**56**

Getdi, ələ düşməz dəxi cananə, könül!
Saldı məni bu atəşi-hicranə, könül!
Vəslinə qiyamətdə yetərsən, ey dil!
Hicranda gərək dönə bu gün qanə könül.

**57**

Yandırdı məni atəşi-hicran, ey dil!
Bəsdir, dəxi sən eyləmə əfğan, ey dil!
Cəhd eylə vüsalinə yetiş dildarun,
Ya hicr oduna verməgilən can, ey dil!

**58**

Ömrüm kimi, heyf, keçdi əyyami-vüsal,
Vəslin gününi hicr odı etdi zəval,

Eşq atəşi yandırdı dilim eylədi lal,
Ey kaş, xərab olaydı bu dari-məlal!

**59**

Fəryad ki, zindəganlıqım oldı həram,
Vəslinə əlim yetmədi, oldum nakam;
Yandırdı məni atəşi-hicran belə,
Qorxum budu etməyəm qiyamətdə qiyam.

**60**

Səd heyf, məni saldı nəzərdən yarım,
Hicranda olubdı səxt müşkil karım;
Əğyarlə həmnişin olub söhbət edər,
Öldürdi məni nigari-bədrəftarım.

**61**

Hərçənd ki, mən maili-üsyan oldum,
Üsyan edüb tabei-şeytan oldum;
Min tövbə, həzar şükr olsun Həqqə kim,
Təsdiq qılub Həqqi peşiman oldum.

**62**

Ayırdı məni dövri-fələk yarimdən,
Qan oldı könül fəraqi-dildarimdən;
Vəslinə əgər yetməsəm, ey çərxi-fələk,
Viran edərəm mən səni bir zarimdən.

**63**

Odlandı fələk naleyi-əfğanımdan,
Dilbər, həzər et dideyi-giryanımdan;
Hicran sitəmindən məni gəl eylə xilas,
Hicran ələmində doymuşam canımdan.

**64**

Gəl eylə həzər dideyi-giryanımdan,
Bir eylə həya çaki-giribanımdan;
Rəhm eylmədün müslimə, kafər, hərgiz,
Əlvan elədün yer yüzini qanımdan.

**65**

Ayırdı fələk cövr ilə dildarımdan,
Yoxdur xəbərim, harda qalub, yarımdan;
Hicran gecəsi sübhə kimi bidarəm,
Qafildi, nedim, dideyi-bidarımdan.

**66**

Qan oldı könül qönçeyi-xəndanın içün,
Qəddim xəm olub sərvi-xüramanın içün;
Zülfin kimi olmuşam pərişan belə,
Öz-özümi bilmərəm, sənin canın içün!

**67**

Dildar, səni də mən kimi zar olasan!
Eşq atəşinə yanub, giriftar olasan!
Məxmur gözin canımı bimar etmiş,
Bimar gözin tək səni bimar olasan!

**68**

Dəgdi gözümə çöhreyi-canan nagah,
Fəryadə gəlüb könül fəğan eylədi, ah!
Məhrum qılub vüsaldan hicranda,
Zülfi kimi eyləmiş günim hicr siyah.

**69**

Kim dedi sana, aşiqi giryan eylə?
Əğyarımı vəslinlə xəndan eylə?

Göstər gül ruyini rəqibə hər dəm,
Zülfin kimi könlümi pərişan eylə?

**70**

Ey eşq, məni valehü heyran eylə!
Zülf kimi könlümi pərişan eylə!
Ya küfri-fəraqdən məni eylə xilas,
Ya ol büti-kafəri müsəlman eylə!

**71**

Ya Həqq, nigarımı peşiman eylə!
Dərdimə mənim vəsllə dərman eylə!
Ya canımı al – fəraqə yoxdur taqət,
Ya vəslə yetür, yüzimi xəndan eylə!

**72**

Bu zülfi-müsəlsəldi, səlasil giysu?
Ya mülki-Xütən içrə düşübdür hindu?
Məxmur gözin könlümi təsxir qılub,
Əfsun oxudu könlümə, qıldı cadu.

**73**

Bu çöhrədi səndə, ya gülüstandur bu?
Bu lə'ldi, ya çeşmeyi-heyvandur bu?
Ağzını cəhanda dərk edən arif yox,
Bir sirri-əcib, elmi-pünhandur bu.

**74**

Fəryad ki, eşq odı məni zar etdi,
Hicranda məni dərdə giriftar etdi;
Qan oldı könül, görmədi gül çöhrəsini,
Hicran odı yandurub məni xar etdi.

**75**

Dərda ki, binayi-vəsl viran oldı,
Əyyami-vüsal getdi, hicran oldı;
Lütf eylərdi bana vüsalində bəsi,
Səd heyf, cəfa edüb peşiman oldı.

**76**

Ta dilbəri-gül'üzar canan getdi,
Guya ki, bu cismdən çıxub can getdi;
Vəsli bana can verüb, qılub zində bəni,
Əyyami-vüsal gəldi, hicran getdi.

**77**

Atəşi-eşq saldı hicranə bəni,
Yandırdı tənim, eylədi divanə bəni;
Ənduhi-məlali-hicr canımı almış,
Fəryad, yetürdilər bu gün canə bəni!

Təmmət əl kitab "Həyatü-məmat" min kəlami-Sağəri dər ruzi 9 şəhri-zi-hiccətil-həram əl mütabiq səneyi-1263. İltimas əz mütaliekonəndegan anəst ki, hərgah səhvü xətayi rəfte başəd be islahi-an kuşide befatihə ruhi-müsənnif ra şad fərmayənd və tələbi-amurziş konənd.